*İrəvan Müəllimlər Seminariyasının 140 illiyinə həsr olunur*

**Ön sözün müəllifi:** f.- r.e.d., prof. **Misir Mərdanov**
*AMEA-nın müxbir üzvü,*
*Əməkdar elm xadimi*

**Elmi redaktor:** t.ü.e.d., prof. **Cəfər Cəfərov**
*ADPU-nun rektoru*

**Rəyçilər:** f.ü.f.d., dos. **Əziz Ələkbərli**
*Milli Məclisin üzvü*

f.e.d, prof. **İbrahim Bayramov**
*Əməkdar müəllim*

p.ü.e.d., prof. **Həsən Bayramov**

f.ü.f.d., dos. **Cəlal Allahverdiyev**

k.ü.f.d. **Nazir Əhmədli**

**Rüstəmov F.A. İrəvan Müəllimlər Seminariyası və onun məzunları. Bakı: Elm və təhsil, 2022, 240 s.**

*Kitabda 1881-1917-ci illərdə milli müəllim kadrları hazırlığında İrəvan Müəllimlər Seminariyasının rolu araşdırılmış, seminariyada təhsilin məzmunu, təlimin və pedaqoji təcrübənin təşkili, tələbələrin biliyinin yoxlanılması, seminariyanın direktorları, azərbaycanlı müəllimləri və tanınmış məzunları haqqında məlumat verilmişdir.*
*Kitab geniş oxucu kütləsi üçün nəzərdə tutulmuşdur.*

**ISBN** 97899525455010

## İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamı

İrəvan şəhəri tarixən azərbaycanlıların köklü yaşadığı böyük elm, maarif və mədəniyyət mərkəzlərindən biri kimi şöhrət tapmışdır. Şəhərdə Azərbaycan xalqına məxsus son dərəcə zəngin ədəbi-mədəni mühit formalaşmışdır. İrəvan xanlığı çar Rusiyasının tərkibinə qatıldıqdan sonra burada dünyəvi təhsilə xüsusi diqqət yetirilməsində həmin mühitin özü əhəmiyyətli rol oynamışdır. XIX əsrin ikinci yarısından etibarən Cənubi Qafqazda maarifçilik hərəkatı geniş vüsət aldı. Regionda dünyəvi təhsil verən yeni tipli məktəbin – İrəvan Müəllimlər Seminariyasının açılması da məhz bu vaxtlara təsadüf edir.



1881-ci ilin noyabr ayında fəaliyyətə başlayan İrəvan Müəllimlər Seminariyası çar hakimiyyətinin bölgədəki maraqları naminə yaradılmasına baxmayaraq, 40 ilə yaxın müddətdə hazırladığı müasir dünyagörüşünə və düşüncə tərzinə malik yüksəkixtisaslı milli müəllim kadrları ilə azərbaycanlıların üstünlük təşkil etdiyi İrəvan mahalında ədəbi-ictimai, elmi-mədəni həyatın ənənəvi dolğunluğunun və canlılığının qorunub saxlanılmasında təqdirəlayiq xidmətlər göstərmiş, pedaqoji fikir salnaməmizə yaddaqalan səhifələr yazmışdır. Görkəmli maarifpərvər Firidun bəy Köçərli seminariyanın ilk müəllimlərindən olmuş, geniş mədəni-maarif işləri aparmışdır. Seminariyanın məzunları sırasında xalqımızın bir çox tanınmış şəxsiyyətləri və dövrünün görkəmli ziyalıları vardır.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, İrəvan Müəllimlər Seminariya-

sının 140 illiyinin qeyd olunmasını təmin etmək məqsədilə qərara alıram:

1. Azərbaycan Respublikasının Təhsil Nazirliyi İrəvan Müəllimlər Seminariyasının 140 illiyi ilə bağlı tədbirlər planı hazırlayıb həyata keçirsin.

2. Azərbaycan Respublikasının Nazirlər Kabineti bu Sərəncamdan irəli gələn məsələləri həll etsin.

**İlham Əliyev**
*Azərbaycan Respublikasının Prezidenti*
*Bakı şəhəri, 29 dekabr 2021-ci il*

***"Nəslimiz öz milli-mənəvi dəyərlərini öyrəndikcə öz keçmişindən qürur duyur və onlarda öz soyuna, kökünə, millətinə bağlılıq daha da möhkəmlənir"***

***Heydər Əliyev***
*Ümummilli lider*

# Azərbaycan təhsil tarixinə dəyərli töhfə və ya professor F.A.Rüstəmovun "İrəvan Müəllimlər Seminariyası və onun məzunları" kitabına ön söz



İnsanlarda tarixi öyrənməyə güclü marağın səbəbi tarixi həqiqətlərin güzgü rolunu oynamasıdır. Həmişə deyirlər ki, tarix təkrar olunur. Təkrarların içərisində strateji və taktiki dəyişikliklər olsa da, hesab edirəm ki, baş verən hadisələrin mahiyyətində ciddi dəyişiklik olmur. *"Tarix özünü elə aparır ki, sanki hər dəfə yeni bir şey danışır, əslində isə o, əvvəldən axıra ayrı-ayrı adlar altında, ayrı-ayrı qabıqlarda eyni hadisədən bəhs edir"* (A.Şopenhauer). Ona görə də *"tarixini öyrənməyənlər onu təkrar yaşamaq məcburiyyətində qalırlar"* (C.Santayana).

A.Volter deyirdi ki, tarix kralların, generalların tarlası deyil, millətlərin tarlasıdır. Hər millət keçmişdə bu tarlaya nə əkmişsə, gələcək onu biçəcək...

Tarix keçmişin təcrübə və müdrikliyini gənc nəslə çatdırır. Tarixi yaradanlar da, yaradılmış tarixin tarixini yazanlar da insanlardır. Tarixi yaradanların həyatı və fəaliyyəti, məqsədi və vəzifəsi, ümumiyyətlə həyat missiyası o qədər maraqlı və qeyri-adiliklərlə dolu olur ki, onlar haqqında daha çox öyrənmək istəyirsən. Filosoflar ona görə deyir ki, əslində tarix yoxdur, yalnız ayrı-ayrı adamların tərcümeyi-halları vardır. Tarixi yaradanlar olmasa idi, yəqin ki, onu yazan insanlar da olmazdı. Tarix yaratmaq tarix yazmaqdan qat-qat çətin və məsuliyyətli olsa da, tarixdə tarix yaradanlarla yanaşı, həm də tarixi yazanlar qalır...

Azərbaycan təhsil tarixinin yaradılmasının ilkin mərhələsi akademiklər Mehdi Mehdizadə və Hüseyn Əhmədovun adı ilə

bağlıdır. Onların əsasını qoyduğu və inkişaf etdirdikləri bu elmi məktəbin ən qüdrətli nümayəndəsi ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, Azərbaycan Respublikasının Əməkdar elm xadimi, pedaqoji elmlər doktoru, professor ***Fərrux Abbas oğlu Rüstəmov***-dur.

Mən Fərrux müəllimi 2007-ci ildən tanıyıram. Həmin illərdə Azərbaycan təhsilində uğurlu islahatlar aparılır, ciddi məzmun və struktur dəyişikliyi həyata keçirilirdi. Fərrux müəllim Təhsil Nazirliyinin "Azərbaycan Respublikasında fasiləsiz pedaqoji təhsil və müəllim hazırlığının konsepsiya və strategiyası" (2007), "Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası" (Milli Kurikulum) (2006), "Azərbaycan Respublikasında ali təhsilin bakalavriat pilləsində ibtidai sinif müəllimi hazırlığı üzrə Çərçivə Kurikulumu" (2008) layihələrini həyata keçirən işçi qrupun fəal üzvlərindən biri idi. Fasiləsiz Pedaqoji Təhsil üzrə Koordinasiya Şurasının, Dərslikləri Qiymətləndirmə Şurasının üzvü, 100 "Ən yaxşı müəllim", 50 "Ən yaxşı məktəb" müsabiqəsini keçirən Respublika Təşkilat Komitəsinin üzvü və ümumtəhsil məktəblərinin "Həyat bilgisi" fənn kurikulumunu hazırlayan işçi komissiyasının sədri kimi səmərəli fəaliyyət göstərirdi. Həyata keçirilən təhsil layihələri ilə bağlı onunla həm işçi qrupunun üzvləri ilə birlikdə, həm də ayrılıqda tez-tez görüşürdüm. Görüşlərimiz və müzakirələrimiz olduqca maraqlı və səmərəli olurdu.



Azərbaycan təhsili ilə bağlı hər bir fakt və hadisəni tarixilik və müasirlik müstəvisində dəyərləndirməyi bacaran Fərrux müəllim elmi cəhətdən əsaslandırdığı, hamının diqqətini cəlb edən, dərin məzmunlu, aydın ideyalı təklifləri ilə hamının rəğbətini qazanmışdı. Fərrux müəllim onda çox cavan olsa da, müdriklik keyfiyyəti ilə diqqətimi cəlb etmişdi. Və onu da deməliyəm ki, bu üstün keyfiyyət yaşın hüdudu ilə deyil, onun daxili təbiətindən irəli gəlir. Mən bu keyfiyyəti onun Azərbaycan müəllimlərinin XIII qurultayındakı çıxışında da, birgə iştirak etdiyimiz çoxsaylı tədbirlərdə və elmi-praktik konfranslarda dəfələrlə müşahidə etmişəm.

Son dərəcə səmimi, genişürəkli, həmişə axtarışda olan insan kimi tanıdığım Fərrux müəllim istər elmdə, istər pedaqoji və elmi-pedaqoji kadr hazırlığında, istərsə də həyatda çoxları üçün əlçat-

maz olan zirvələri fəth etmiş ziyalılarımızdan, peşəkar maarifçi pedaqoqlarımızdandır.

Fərrux Abbas oğlu Rüstəmov 1 yanvar 1961-ci ildə Qərbi Azərbaycanın Göyçə mahalının Cil kəndində anadan olmuşdur. 1968-1978-ci illərdə Cil kənd orta məktəbində oxumuşdur. 1978-ci ildə V.İ.Lenin adına (indiki ADPU) ADPİ-nin İbtidai təhsilin pedaqogikası və metodikası fakültəsinə qəbul olmuşdur. Tələbəlik illərində fakültə Əlaçılar şurasının və Tələbə Elmi Cəmiyyətinin sədri kimi institutun ictimai-pedaqoji həyatında fəal iştirak etmişdir. Fərrux Rüstəmov tələbəlik illərində "Əla təhsilə görə", "Əla təhsilə və ictimai işə görə" SSRİ Ali və Orta İxtisas Təhsili Nazirliyinin, ÜİLKGİ-nin döş nişanları, Azərbaycan SSR Ali və Orta İxtisas Təhsili Nazirliyinin I-II dərəcəli diplomları (tələbə elmi-tədqiqat işinə görə), ÜİLKGİ-nin və institut rektorluğunun Fəxri Fərmanları ilə təltif olunmuşdur. Təhsil əlaçısı, bacarıqlı tədqiqatçı və ictimaiyyətçi tələbə kimi təhsil illərində ən yüksək təqaüdə - Lenin təqaüdünə layiq görülmüş, Lenin təqaüdü ilə oxuyan ali məktəb tələbələrinin 1982-ci ildə Bakıda keçirilən Ümumittifaq konfransında çıxış etmişdir. 1982-ci ildə institutu fərqlənmə diplomu ilə başa vuran Fərrux Rüstəmov təyinatla Quba rayonunun Rəngidar kənd səkkizillik məktəbində müəllim və məktəb direktoru vəzifələrində (1982-1985-ci illər) işləmişdir. Quba rayonunda işləyərkən "Şəfəq" qəzetinin ştatdankənar müxbiri olmuşdur. 1985-ci ildə elmi işə marağı onu yenidən V.İ.Lenin adına ADPİ-yə gətirmiş, o, pedaqogikanın nəzəriyyəsi və tarixi üzrə əyani aspiranturaya qəbul olmuşdur. 1985-1987-ci illərdə Qazaxıstanın Leninski şəhərində sovet ordusu sıralarında xidmət etmişdir. Hərbi xidmətdən sonra aspirantura təhsilini davam etdirmiş, professor Hüseyn Əhmədovun elmi rəhbərliyi altında "Azərbaycan sovet pedaqoji elminin inkişafı (1961-1981-ci illər)" mövzusunda elmi axtarışlarını başa çatdırmış, vaxtından əvvəl (1989) müdafiə edərək pedaqoji elmlər namizədi (pedaqogika üzrə fəlsəfə doktoru) alimlik dərəcəsi almışdır.

ADPU-nun Ümumi pedaqogika kafedrasının nəzdindəki "Şagirdlərin peşəyönümü" elmi-tədqiqat laboratoriyasında kiçik elmi işçi kimi fəaliyyətə başlayan Fərrux Rüstəmov sonralar kafedrada müəllim (1992-1995), dosent (1996-2004), professor (2004-2006)

kimi əmək fəaliyyətini davam etdirmişdir. Ayrı-ayrı vaxtlarda "Şagirdlərin peşəyönümü" elmi-tədqiqat laboratoriyasına (1996-2000), "Dədə Qorqud" elmi-tədqiqat laboratoriyasının pedaqogika, psixologiya, fəlsəfə bölməsinə (2000-2004), Bakı Qızlar Seminariyasının (Bakı Qızlar Universitetinin) Pedaqogika kafedrasına (1998-2006), ADPU-nun İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasına (2007-2011) və "Pedaqoji təhsilin problemləri" elmi-tədqiqat laboratoriyasına (2008-2011) rəhbərlik etmişdir.

2003-cü ildə ADPU-nun nəzdində təşkil olunmuş birdəfəlik doktorluq Dissertasiyası Şurasında "Azərbaycanda pedaqoji elmin inkişaf yolları (1920-1991-ci illər)" mövzusunda doktorluq dissertasiyası müdafiə edərək pedaqoji elmlər doktoru alimlik dərəcəsi almışdır. 2007-ci ildən İbtidai təhsilin pedaqogikası və metodikası kafedrasının professorudur. 2007-2015-ci illərdə ADPU-nun Pedaqoji fakültəsinin dekanı, fakültə Elmi Şurasının sədri, Universitet Elmi Şurasının üzvü olmuşdur. 2015-ci ilin dekabr ayından ***İbtidai təhsil fakültəsinin dekanı*** vəzifəsində çalışır.



Fərrux Rüstəmov zəngin, məhsuldar və çoxşaxəli elmi yaradıcılıq üslubuna və kredosuna malik alimdir.

İlk kitabını 1990-cı ildə nəşr etdirən Fərrux Rüstəmovun indiyə kimi 36 monoqrafiya, kitab və kitabçası, 35 tədris proqramı, 200-dən çox elmi məqaləsi, 50 tezisi, 150-dən artıq elmi-pedaqoji və publisistik qəzet yazısı işıq üzü görmüşdür, 10 kitabın tərtibçisidir. 100-ə yaxın kitabın elmi redaktoru və rəyçisi olub. "Prof.H.Əhmədovun əsərlərinin izahlı biblioqrafiyası" (1990), "Tələbələrin ictimai fəaliyyəti və ona pedaqoji rəhbərlik" (1991), "Azərbaycanda pedaqoji elmin inkişaf tarixindən" (1992), "Günüuzadılmış qruplarda tərbiyə məsələləri" (1993), "M.V.Vidadinin, M.P.Vaqifin, Q.B.Zakirin təlim-tərbiyə haqqında fikirləri" (1994; 2013), "Azərbaycan pedaqoji biblioqrafiyası: məktəb və pedaqogika tarixinə aid ədəbiyyat" (1995), "Görkəmli pedaqogika tarixçisi Əyyub Tağıyev" (1996), "Akademik Hüseyn Əhmədov" (1997), "Azərbaycanda pedaqogikanın nəzəriyyəsi və tarixi üzrə tədris planları, proqramları, dərslik və dərs vəsaitlərinin hazırlanması və təkmilləşdirilməsi tarixi" (1997), "Основные направления развития теория воспитания и обучения в Азербайджане" (1998), "Azərbaycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri" (1998), "Pedaqogika kafedrasının tarixi: sələflər və

xələflər (1999), "Pedaqogikadan kurs və yoxlama işlərinə aid mövzu, plan və ədəbiyyat" (2001), "Pedaqogika. Yeni kurs" (2002, 2007, 2010), "Ümumtürk pedaqoji fikrində əxlaqi-mənəvi dəyərlər" (2002), "Şərqdə pedaqogika tarixi" (2002), "Qərb pedaqogika tarixi" (2003), "Yeni dövrün pedaqogika tarixi" (2004), "Ən yeni dövrün pedaqogika tarixi" (2005), "Akademik Hüseyn Əhmədov və yetirmələri" (2004), "Pedaqogika tarixi" (2006,2011), "Ali məktəb pedaqogikası" (2007), "Pedaqogikadan kurs və buraxılış işlərinə dair metodik göstəriş" (2007), "Pedaqoji oçerklər: sələflərim və müasirlərim" (2010), "Pedaqoji qeydlər, resenziyalar, müsahibələr" (2010), "Azərbaycanda ümumi pedaqogika, pedaqogikanın və təhsilin tarixi ixtisası üzrə elmi-pedaqoji kadr hazırlığı"(2010), "Azərbaycanda təhsil və tərbiyə nəzəriyyəsinin inkişafı" (1961-1981-ci illər)" (2011), "Pedaqogika fənninin kurikulumu" (2014), "Azərbaycan pedaqogikaşünaslığı" (2016), "Humanist pedaqogika, yoxsa pedaqogikada humanizm" (2018), "Azərbaycan Dövlət Pedaqoji Universitetinin rektorları" (2019, 2021), "Ali Pedaqoji İnstitutun salnaməsi" (2020), "Azərbaycan Ali Pedaqoji İnstitutu. 5 illik" (2020), "Azərbaycan Ali Pedaqoji İnstitutunun inkişafının ikinci mərhələsi" (2021), "Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixi. (1921-2021)" I cild. (2021), "Azərbaycan Dövlət Pedaqoji Universitetinin tarixi. (1921-2021)" II cild. (2021), "Azərbaycan Dövlət Pedaqoji Universitetinin professorları" (2021), "ADPU-nun İbtidai təhsil fakültəsinin tarixi (1958-2021)" (2021) əsərləri Azərbaycan pedaqoji elminə dəyərli töhfədir.



Onun əsərləri Bakı, Moskva, Səmərqənd, Çeboksarı, Tehran, Təbriz, İstanbul, Astana, Sankt-Peterburq və Tbilisi şəhərlərinin nüfuzlu jurnallarında və elmi məcmuələrində Azərbaycan, rus, türk, özbək dillərində çap edilmişdir. Rusiya, Yunanıstan, Albaniya, İtaliya, Portuqaliya, İspaniya, Finlandiya, İsveç, Norveç, Danimarka və Estoniyada yaşlıların təhsili ilə bağlı keçirilən beynəlxalq konfranslarda iştirak etmişdir.

Rusiya Təhsil Akademiyası professor Fərrux Rüstəmovun akademik Hüseyn Əhmədovla birgə yazdığı "Müasir dövrdə Azərbaycanda təhsilin inkişafının əsas istiqamətləri" (Moskva, 2000) əsərini nəşr etmişdir. 2010-cu ildə onun Tehranın "Xorşidafərin" nəşriyyatında "Pedaqoji (təlim və tərbiyə) tarixi Şərqdə" kitabı (377 s.) çap olunmuşdur.

Fərrux Rüstəmov akademik Hüseyn Əhmədovun əsərlərinin biblioqrafik göstəricisinin (1990, 1996, 2001), 15 cildlik "Seçilmiş pedaqoji əsərləri"nin və professor Yəhya Kərimovun "Seçilmiş pedaqoji əsərləri"nin tərtibçilərindən biridir. Dos.Tapdıq Məmmədovla bağlı "Yarımçıq ömrün sahibi" (2000) və "Professor Əmrulla Paşayev" (2015), "Pedaqoji fakültə - 50" kitablarının tərtibçi-müəllifidir. 2012-ci ildə Y.A.Komenskinin "Böyük didaktika", 2018-ci ildə M.Ə.Rəsulzadənin "Seçilmiş pedaqoji əsəri"ni tərtib etmiş və geniş "Ön söz" yazmaqla latın qrafikası ilə nəfis şəkildə nəşr etdirmişdir.

ADPU-nun 20-40-cı illər tarixini öyrənmək baxımından mühüm əhəmiyyət daşıyan "Ali Pedaqoji İnstitutun salnaməsi" (1924), "Azərbaycan Ali Pedaqoji İnstitutu" (1926) və "V.İ.Lenin adına Azərbaycan Pedaqoji İnstitutu" (1948) məcmuələri onun tərəfindən transliterasiya edilərək nəşr edilmişdir.

Fərrux Rüstəmovun mühüm fəaliyyət istiqamətlərindən biri də elmi-pedaqoji kadr hazırlığındakı səmərəli xidmətləridir. Onun elmi rəhbərliyi ilə 24 nəfər fəlsəfə doktoru elmi dərəcəsi almış, 6 nəfər müdafiə ərəfəsindədir. Elmi məsləhətçiliyi ilə 2 nəfər pedaqoji elmlər doktoru yetişmiş, 8 nəfər fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün dissertasiya üzərində işləyir. 4 nəfərin elmlər doktoru, 23 nəfərin pedaqogika üzrə fəlsəfə doktoru elmi dərəcəsi almaq üçün təqdim etdiyi dissertasiyanın rəsmi opponenti olmuşdur.



Fərrux Rüstəmov 1997-2009-cu illərdə Azərbaycan Respublikası Prezidenti yanında AAK-ın Təhsil Problemləri İnstitutunda və ADPU-da fəaliyyət göstərən ümumi pedaqogika, pedaqogika və təhsil tarixi ixtisası üzrə Dissertasiya Şurasının üzvü, 2009-2016-cı illərdə ADPU-da fəaliyyət göstərən ümumi pedaqogika, pedaqogika və təhsilin tarixi ixtisası üzrə Dissertasiya Şurasının sədr müavini olmuşdur. Onun sədrliyi ilə 18 nəfər elmlər doktoru, 146 nəfər fəlsəfə doktoru dissertasiyası müdafiə etmişdir.

O, "Kurikulum", "Təhsildə İKT", "Azərbaycan məktəbi", "Dədə Qorqud araşdırmaları", "Media və təhsil innovasiyaları" jurnallarının, ADPU-nun "Xəbərləri" nin, "Bakı Qızlar Seminariyasının Elmi Xəbərləri"nin, "Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi Xəbərləri"nin, "Naxçıvan" Universitetinin Elmi Xəbərləri"nin redaksiya heyətinin üzvü, "Pedaqoji tədqiqatlar" elmi

məqalələr məcmuəsinin redaktorudur. O, Azərbaycanda müəllim kadrları hazırlığının strategiya və konsepsiyasını hazırlayan işçi qrupunun, Azərbaycan Respublikası Milli Məclisinin "Elm və Təhsil Məsələləri Daimi Komissiyası"nın "Təhsil haqqında Azərbaycan Respublikasının Qanunu"nu hazırlayan işçi qrupunun, Fasiləsiz Pedaqoji Təhsil üzrə Koordinasiya Şurasının, Dərslikləri Qiymətləndirmə Şurasının üzvü, "Həyat bilgisi" fənn kurikulumunu hazırlayan işçi komissiyasının sədri olmuşdur.

1988-ci ildə SSRİ Elmlər Akademiyasının Sovet Sosioloqları Assosiasiyasının üzvü, 1998-ci ildə Moskva şəhərində yerləşən Beynəlxalq Pedaqoji Akademiyanın həqiqi üzvü, 2010-cu ildə isə Pedaqoji və Sosial Elmlər Akademiyasının həqiqi üzvü (akademiki) seçilmişdir.

Fərrux Rüstəmov Azərbaycan Jurnalistlər Birliyinin üzvü, akademik Mehdi Mehdizadə, "Gənc alimlər" və "Qızıl qələm" mükafatları laureatıdır. "Avropa Nəşr Mətbu evi" komissiyasının qərarı ilə "Ən yaxşı vətənpərvər tədqiqatçı alim" qızıl medalı (2009), Azərbaycan Respublikası Təhsil Nazirliyinin kollegiyasının qərarı ilə "Azərbaycan Respublikasının qabaqcıl təhsil işcisi" (2010) döş nişanı ilə təltif olunmuşdur. "Vektor" Beynəlxalq Elmi Mərkəzi Mükafat Komissiyasının qərarı ilə "XXI əsr Azərbaycan ziyalıları" və ADPU-da "İlin müəllimi" (2007), "İlin alimi" (2011, 2013, 2015) müsabiqələrinin qalibi olmuşdur.



Azərbaycan Respublikası Prezidenti İlham Əliyevin sərəncamları ilə 2006-cı ildə ***"Tərəqqi medalı"***na layiq görülmüş, 2012-ci ildə ona ***Əməkdar elm xadimi*** fəxri adı verilmiş, 2021-ci ildə ***3-cü dərəcəli "Əmək" ordeni*** ilə təltif edilmişdir.

Son illərdə prof.Fərrux Rüstəmovun yaradıcılığında yeni bir elmi istiqamət - ***İrəvanda maarifçilik tarixinin araşdırılması*** formalaşmaqdadır. İrəvanda maarifçiliyin inkişafı, milli müəllim kadrları hazırlığında İrəvan Müəllimlər Seminariyasının rolu ilə bağlı onun son illərdə xeyli yazıları[1] nəşr olunmuş, Azərbaycan

[1] Bax: **Rüstəmov F.** Milli müəllim kadrları hazırlayan təhsil ocağı. I məqalə. //"Azərbaycan müəllimi" qəzeti, 7 yanvar 2022-ci il; Milli müəllim kadrları hazırlayan təhsil ocağı. II məqalə./"Azərbaycan müəllimi" qəzeti, 20 yanvar 2022-ci il; Azərbaycanlı müəllimlər kadrları hazırlığında İrəvan Müəllimlər Seminariyasının rolu //"Azərbaycan məktəbi" jurnalı, 2022, №1, s.105-122; Azərbaycanlı müəllimlər kadrları hazırlığında İrəvan Müəllimlər Seminariyasının rolu // "Qloballaşma şəraitində müəllim şəxsiyyətinin formalaş-

televiziyasının müxtəlif kanallarında, sosial şəbəkələrdə, müəllim kadrları hazırlığını həyata keçirən ali pedaqoji məktəblərdə, ümumtəhsil məktəblərində və Uşaq-Gənclər İnkişaf Mərkəzində İrəvanda maarifçiliyin təşəkkülü və inkişafı, milli müəllim kadrları hazırlığında İrəvan Müəllimlər Seminariyasının rolu ilə bağlı silsilə çıxışlar etmişdir.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin "İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında" 9 dekabr 2021-ci il tarixli Sərəncamının qayəsinə uyğun olaraq son bir ildə respublikamızda xeyli işlər görülmüş, tədqiqatlar aparılmış, elmi-nəzəri və praktik konfranslar keçirilmiş, elmi və publisistik məqalələr yazılmışdır.

Professor Fərrux Rüstəmovun ***"Qərbi Azərbaycan həqiqətləri: İrəvan Müəllimlər Seminariyası və onun məzunları"*** kitabını bu sahədə ən mükəmməl tədqiqatlardan biri hesab etməklə onu təhsil tariximizə dəyərli töhfə hesab edirəm. Kitabın müəllifinin heç kəsə bənzəməyən, heç kimi təkrarlamayan yaradıcılıq üslubu var. Professor Əjdər Ağayev onun haqqında yazırdı: *"Fərrux Rüstəmov mükəmməl pedaqogika tarixçisidir. O, Azərbaycan pedaqogikaşünaslığının pioneri olaraq irəlidədir. Əhməd Seyidov, Mehdi Mehdizadə, Mərdan Muradxanov, Hüseyn Əhmədov məktəbinin ənənələrini yaşadaraq və müasirlik düşüncəsi ilə onları inkişaf etdirərək, məzmununu, elmi əhatə dairəsini genişləndirərək sanballı bir elmi mövqeyə malik olmuşdur."*



10 il bundan əvvəl Fərrux müəllim haqqında yazdıqlarımı olduğu kimi təkrar etmək istəyirəm: ***"Fərrux müəllim çox gənc yaşlarından Azərbaycan təhsilinin tarixinə və tarixçisinə çevrilib".***

İrəvan maarifçiliyi ilə bağlı xeyli araşdırmaların müəllifi kimi deyə bilərəm ki, Fərrux müəllimin ***"İrəvan Müəllimlər Seminariyası və onun məzunları"*** adlı kitabı ciddi elmi axtarışların bəhrəsidir. Müəllif İrəvan maarifçilik mühiti və İrəvan Müəllimlər Seminariyası ilə bağlı fakt və hadisələri zaman və məkan kontekstində dəyərləndirmiş, ictimai-siyasi hadisələrin fonunda təhlil etmişdir. İrəvan

---

dırılmasında pedaqogika və psixologiya elmlərinin yeri və rolu" mövzusunda respublika elmi konfransı. 28-29 aprel 2022-ci il. SDU. Sumqayıt, 2022, s.3-5; İrəvan Müəllimlər Seminariyası-140. https: //azertag. az/xeber/ Irevan_ Muellimler_Seminariyasi__140-1974206; Иреванская учительская семинария -140. (АЗЕРТАДЖ). https: //azertag. az/ru/ xeber/ Irevanskaya_ uchitelskaya_seminariya ___140-1979214

mahalında ədəbi-ictimai, elmi-mədəni həyatın ənənəvi dolğunluğunun və canlılığının qorunub saxlanılmasında təqdirəlayiq xidmətlər göstərmiş, pedaqoji fikir salnaməmizə yaddaqalan səhifələr yazmış maarifçilərin həyat və fəaliyyətinin ən mühüm məqamlarına işıq salmışdır.

Kitabda ilk mənbələr əsasında xeyli fakt və hadisələr dəqiqləşdirilmiş, mətbuat səhifəsindəki yanlışlıqların səbəbləri araşdırılmışdır. İrəvan Müəllimlər Seminariyası ilə bağlı arxiv sənədlərinin böyük əksəriyyəti hələlik əlimiz çatmayan İrəvan şəhərində olduğundan müəllif "Qafqaz təqvimi"nin 1881-1917-ci illər sayını, İrəvan Quberniyasının ictimai-vəziyyəti ilə bağlı 1888-1908-ci illərdə nəşr olunmuş kibabları, "Qafqaz ölkəsi və xalqlarının təsviri üçün materiallar"ı (SMOMPK), İ.Şopenin rəhbərliyi ilə qeydiyyatçı katib A.Rıjkov tərəfindən tərtib edilmiş "İrəvan şəhərinin kameral təsviri"ni[1], Rusiya Xalq Maarif Nazirliyinin qərarlar toplusunu və digər sənədləri araşdırmalı olmuşdur.

Kitabın çox maraqlı quruluşu vardır. Milli yaddaşın bərpasına hədəflənmiş "İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin Sərəncamının elmi-pedaqoji, siyasi-ideoloji, mədəni-mənəvi əhəmiyyətini şərh edən müəllif, əvvəlcə qədim Azərbaycan şəhəri İrəvanda maarifçilik mühitinin özünəməxsus xüsusiyyətlərini şərh etmiş, dini və dünyəvi təhsilin inkişaf istiqamətlərini ümumiləşdirmiş, müəllim kadrlarının hazırlığını zəruri edən səbəbləri müəyyənləşdirmişdir. Yalnız bundan sonra müəllim seminariyaları, xüsusilə də İrəvan Müəllimlər Seminariyası haqqında geniş və ətraflı məlumat verilmiş, seminariyanın nəzdindəki təcrübə (nümunə) məktəbinin müəllim kadrları hazırlığındakı yeri və rolu müəyyənləşdirilmişdir.



İrəvan Müəllimlər Seminariyasında təhsilin məzmunu, təlimin və pedaqoji təcrübənin təşkili, tələbələrin biliyinin yoxlanılması ilə bağlı verilən məlumatlar yeniliyi, şərh üslubu ilə fərqlənir və maraqla oxunur.

Professor Fərrux Rüstəmov "Qafqaz kalendarı"nda verilən məlumatlar əsasında seminariyanın direktorlarının, şəriət və Azər-

[1] İrəvan əyalətinin kameral təsviri. I cild. İrəvan şəhərinin kameral təsviri. (Tərcümə, tərtib və giriş mətninin müəllifi: **Nazir Əhmədli**). Bakı: "Turxan" NPB, 2018, 328 s.

baycan dili müəllimlərinin adlarını və fəaliyyət göstərdiyi illəri müəyyənləşdirə bilmiş, onların bəziləri *(Axund Məmmədbağır Hacı Mehdi oğlu Qazızadə, Rəhim Musarza oğlu Xəlilov, Həmid bəy Xəlil ağa oğlu Şahtaxtinski, Mirzə Cabbar Abbas oğlu Məhəmmədzadə, Həbib bəy Yusif bəy oğlu Səlimov*) haqqında qısa oçerklər vermişdir.

Kitabda seminariyanın azərbaycanlı məzunları *(Rəşid bəy Əsədbəy oğlu İsmayılov, Fərrux bəy Əlikişi oğlu Ağakişibəyov, Haşım bəy Mirabdulla oğlu Vəzirov, Tağı bəy Baxşəli bəy oğlu Səfiyev, Vahid Mehdi bəy oğlu Musabəyov, İbrahim Qafar oğlu Səfiyev (İbrahim Səfi), Cəfər bəy Cəfərbəyov, Həsən bəy Qazıyev, Əli Əzim oğlu İbrahimov, Mehdi Kərbəlayı Məhəmmədəli oğlu Kazımov, Hüseynəli bəy Həsən bəy oğlu Rüstəmbəyov, İbrahim ağa Hacı Vəli ağa oğlu Şahtaxtinski, Mirzə Bağır Yusif bəy oğlu Əliyev, Ələkbər Molla Hüseyn oğlu Qədimov, Aslan bəy Məhəmmədəli bəy oğlu Nabatəlibəyov, Əkbər Mehdi oğlu Əkbərov* və b.) haqqında verilən qısa oçerklərin gələcəkdə daha sistemli tədqiqatların aparılması üçün dəyərli mənbə olacağı şübhə doğurmur.



Kitabda müəllif 1920-ci ilə kimi Avropada, Rusiyada və Ukraynada ali təhsil alan irəvanlılar haqqında da qısa məlumat vermiş, İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin Sərəncamından sonra təhsil müəssisələrində keçirilən tədbirləri xronoloji ardıcıllıqla təqdim etmişdir.

Professor Fərrux Rüstəmovun ***"İrəvan Müəllimlər Seminariyası və onun məzunları"*** adlı kitabını bütöv Azərbaycanın təhsil və pedaqoji fikir tarixinə dəyərli töhfə hesab edirəm.

***Misir Mərdanov,***
***AMEA-nın Riyaziyyat və Mexanika İnstitutunun direktoru, AMEA-nın müxbir üzvü, fizika-riyaziyyat elmləri doktoru, professor, Əməkdar elm xadimi***

*"Bu gün biz yaxşı bilirik ki, Ermənistan dövləti tarixi Azərbaycan torpaqlarında yaranıb.* ***Zəngəzur, Göyçə mahalı, İrəvan*** *bizim doğma torpağımızdır. Biz qayıdacağıq."*

***İlham Əliyev***
***Azərbaycan Respublikasının Prezidenti***

# Giriş

Azərbaycanın indiki hüquqi və siyasi sərhədlərindən kənarda qalan İrəvanda, Göyçədə, Zəngəzurda, Dərələyəzdə, Təbrizdə, Borçalıda, Dərbənddə min illər boyu yaşayan ata-babalarımız zəngin maddi və mənəvi mədəniyyət nümunələri yaratmışlar. Xalqın bütün çətinliklərə baxmayaraq yaratdığı və yaşatdığı, sənədlərə, mənbələrə, arxiv materiallarına çevrilən bu mədəniyyət nümunələri, çox təəssüf ki, siyasi mülahizələr ucbatından zaman və məkan axarında itib-batıb, elmi dövriyyədən uzaq düşüb.



Bakı və Yelizavetpol quberniyalarından sonra azərbaycanlıların daha sıx məskunlaşdığı ərazi İrəvan quberniyası olmuşdur. Bu bölgədə tarixən yaşayan soydaşlarımızın yaratdığı milli-mənəvi və maddi dəyərlər, məişət, ədəbiyyat, incəsənət, mətbuat, maarif və maarifçilik tarixi Azərbaycanın ictimai-siyasi, mədəni-mənəvi, pedaqoji-psixoloji fikir tarixinin ayrılmaz tərkib hissəsi olmaqla yanaşı, həm də tükənməz mənbə, etibarlı qaynaq və zəngin xəzinədir.

"Üləma, füzəla və şüəra" (F.B.Köçərli) yurdu kimi tanınan İrəvan şəhəri yarandığı gündən Azərbaycan xalqının mədəniyyət və mənəviyyat mərkəzinə çevrilmiş, həm xanlıqlar dövrünə kimi, həm də xanlıqlar dövründə ***Azərbaycanın dövlətçilik tarixinin ayrılmaz tərkib hissəsi*** olmuşdur.

Azərbaycan xalqının parçalanmasını, tarixi torpaqlarımızın itirilməsini, İrandan və Türkiyədən ermənilərin kütləvi şəkildə bu ərazilərə köçürülməsini təmin edən Gülüstan (1813) və Türkmənçay (1828) sülh müqavilələri ilə milli faciəmizin əsası qoyulmuşdur.

İrəvan və Naxçıvan xanlıqlarının ərazisində məskunlaşdırılan ermənilər orada yaşayan azərbaycanlılarla müqayisədə azlıq təşkil

etmələrinə baxmayaraq öz havadarlarının köməyi ilə *"**Erməni vilayəti**"* adlandırılan inzibati bölgünün yaradılmasına nail oldular[1]. Şimali Azərbaycanın işğalı zamanı ermənilərin çar ordusunda göstərdikləri "xidmət" müqabilində *"Erməni vilayəti"* onlara hədiyyə verildi.

Çar I Nikolayın fərmanı ilə 9 iyun 1849-cu ildə "Erməni vilayəti" və Aleksandropol (Gümrü) qəzası əsasında ***İrəvan quberniyası*** yaradıldı[2]. İrəvan quberniya şəhəri elan edildi.

Quberniya İrəvan, Yeni-Bayazid, Naxçıvan, Ordubad, Aleksandropol olmaqla 5 qəzaya bölündü. 1867-ci ildə Ordubad qəzası ləğv edilərək Naxçıvan qəzasına birləşdirildi. Bununla da "Böyük Ermənistan" ideyasının təbliğinə başlanıldı və azərbaycanlıların həmin ərazidən deportasiyasının əsası qoyuldu, əks-sədasız soyqırımlar törədildi. Azərbaycanlılara qarşı həyata keçirilən diskriminasiya 1905-ci və 1918-1920-ci illərdə kütləvi qırğınlara çevrildi. 1918-1920-ci illərdə Ermənistanın indiki ərazisində yaşayan 575 min nəfər azərbaycanlının 565 mini ya dədə-baba yurdlarından qovuldu, ya da erməni vəhşiliyinin qurbanı oldu. Göyçə gölünün sahilində yerləşən 22 kənd dağıdıldı və yandırıldı. Həmin kəndlərin 60 minlik əhalisindən sağ qalanlar Azərbaycana, İrana və Türkiyəyə qaçmalı oldular.



Həmin dövrdə "Şeypur" jurnalı yazırdı:"Bu hökumət (erməni daşnaq hökuməti- F.R.) deyir ki, ***Qafqazda Gürcüstan və Azərbaycan ola bilməz, Burada ancaq bir Ermənistan ola bilər. Qafqazın hamısı ya gərək Ermənistan olsun, ya da Ermənistana tabe kimi bir şey olsun"***[3]

Gəncə qubernatoru öz məruzəsində azərbaycanlıların ağır vəziyyətindən bəhs edərək yazırdı:*"Ermənilərin vəhşiliyinin həddi-hüdudu yoxdur. Adam inana bilmir ki, XX əsrdə bütün Avropada öz mədəniyyətindən dəm vuran bir xalq köməksiz dinc əhaliyə qarşı vəhşiliklərin bütün üsullarını tətbiq etmiş olsun. Hər gün quberniyanın hər yanından alınan raportların, məlumatların yaratdığı dəhşətlərlə bu sətirləri yazmaq çətindir:* **qadınlar zorlanır, uşaqlar odda yandırılır, dillər, qulaqlar kəsilir, işgəncələr, təhqirlər.** *Məruzəni başa çatdıraraq ermənilərin hərəkətlərini və vəhşiliklərini belə ümumiləşdirirəm, təkcə*

[1] "Azərbaycanlıların soyqırımı haqqında" Azərbaycan Respublikası Prezidenti Heydər Əliyevin Fərmanı //"Xalq qəzeti" 26 mart, 1998-ci il

[2] Bax: **Əliyev F., Həsənov U.** İrəvan xanlığı. Bakı: Şərq-Qərb, 2007,s.16

[3] "Şeypur" jurnalı,1918-ci il, №8

*Zəngəzur qəzasında 105 (yüz beş) kənd dağıdılmış və qarət edilmişdir"*[1]

Ümumiyyətlə, XX əsrin birinci rübündə törədilmiş milli qırğın nəticəsində öldürülən, didərgin düşən və digər zərərçəkən azərbaycanlıların sayı 2 milyona yaxın olmuşdur[2].

İrəvanda və ətraf bölgələrdə ermənilər tərəfindən azərbaycanlıların qırğınlarının qarşısını almaq, mübahisəli məsələlərə son qoymaq məqsədilə 1918-ci ildə may ayının 29-da Azərbaycan Milli Şurasının Tiflisdə keçirilən iclasında Fətəli xan Xoyski İrəvan şəhərinin siyasi mərkəz kimi ermənilərə güzəştə gedilməsinin zəruri olduğunu bildirmişdi. Şura üzvləri (Xəlil bəy Xasməmmədov, Məmməd Yusif Cəfərov, Əkbər ağa Şeyxülislamov, Məhəmməd Məhərrəmov) bu məsələ ətrafında çıxış edərək ***"İrəvanın ermənilərə güzəştini tarixi zərurət, labüd bədbəxtlik"*** adlandırmışdılar. Bu məsələ ilə bağlı səsvermənin nəticəsi belə olmuşdu: 28 nəfər Şura üzvündən 16-sı İrəvanın verilməsinin lehinə, 1-i əleyhinə səs vermiş, 3-ü isə bitərəf qalmışdır. Milli Şuranın iyunun 1-də keçirilən iclasında bu məsələyə yenidən baxılmış və bu qərara protest elan edilmişdir. Protesti Şuranın İrəvandan olan 3 üzvü (Mir Hidayət Seyidov, Bağır Rzayev və Nəriman bəy Nərimanbəyov) imzalamışdı. Lakin Azərbaycan Milli Şurasının iclasında bu etiraz qəbul edilmədi.



Siyasi cəhətdən düzgün olmayan bu qərardan sonra ermənilər daha da azğınlaşdı, azərbaycanlıların soyqırımına rəvac verildi, kütləvi qırğınlar baş verdi...

XIX əsrin 30-cu illərindən azərbaycanlılara qarşı həyata keçirilən fiziki və mənəvi terror XX əsrin əvvəllərində (1905, 1918-1920-ci illər) milli qırğınlarla müşayiət edilirdisə, 1948-1953-cü illərdə[3] bu ayrı-seçkilik Sov.İKP MK-nın və SSRİ Nazirlər Sovetinin rəhbərliyi ilə köçürülmə siyasətinə çevrildi. Bu məkrli siyasətin

---

[1]Azərbaycan tarixi sənədlər və nəşrlər üzrə /AzSSR EA; tərt. ed. **N.M.Vəlixanova**; red.**Z.M. Bünyadov**.Bakı:Elm, 1990, s.192-193

[2]Ermənistan Azərbaycanlılarının tarixi coğrafiyası / tərtib edəni: **Sabir Əsədov**/. Bakı: Gənclik,1995 s.40

[3] "Ermənistan SSR-dən kolxozçuların və başqa azərbaycanlı əhalinin Azərbaycan SSR-in Kür-Araz ovalığına köçürülməsi haqqında" SSRİ Nazirlər Sovetinin 23 dekabr 1947-ci il qərarı

nəticəsində 100 mindən artıq soydaşımız ata-baba yurdlarından "könüllülük" prinsipi əsasında Kür-Araz ovalığına köçürüldü. Köçürülənlərin böyük əksəriyyəti iqlim şəraitinə uyğunlaşa bilmədiklərinə görə müxtəlif xəstəliklərin qurbanına çevrilərək həyatla vidalaşmalı oldular. Andranikin qılıncla tam həyata keçirə bilmədiyi "türksüz Ermənistan" ideyası Mikoyan kimi mənfur düşmənlər tərəfindən daha incə üsullarla və dövlət səviyyəsində həyata keçirildi.

İndiki Ermənistan ərazisində - öz ata-baba yurdlarında yaşayan azərbaycanlılara qarşı ermənilərin son həmləsi, açıq-aşkar təcavüzü 1988-1989-cu illərdə baş verdi. Uydurma Qarabağ problemi ilə başlayan bu münaqişə indiki Ermənistan ərazisində yaşayan bütün azərbaycanlıların qovulması, malının-mülkünün talan edilməsi, 217 nəfər azərbaycanlının vəhşicəsinə öldürülməsi, dini-mədəni abidələrinin məhvi və bölgədəki türk mənşəli toponimlərin hamısının dəyişdirilməsi[1] ilə nəticələndi...

Beləliklə də, osmanlı yürüşləri (XVI əsr) zamanı sultanın katibinin *"Azərbaycan mülkünün gözü"* adlandırdığı İrəvan şəhərinin erməniləşdirilməsi prosesi tam başa çatdırıldı.



***

*İrəvan şəhəri* Rusiyanın işğalından sonra qısa bir vaxtda ictimai-siyasi, ədəbi-bədii və pedaqoji fikrin mərkəzinə çevrilmiş, iqtisadi-mədəni inkişafı, infrastrukturu və sənaye potensialı ilə Cənubi Qafqazda öncül yerlərdən birinə sahib olmuş, əvvəl İrəvan vilayətinin, sonra isə İrəvan quberniyasının mərkəzi şəhəri olmuşdur. 1918-ci ildə isə Azərbaycan torpaqlarında yaradılan indiki Ermənistan Respublikasının paytaxtına çevrilmişdir.

Azərbaycan Respublikasının Prezidenti İ.Əliyev haqlı olaraq deyir ki, ***"İrəvan Ermənistana Azərbaycan Xalq Cümhuriyyəti yaranında, məhz Azərbaycan Xalq Cümhuriyyəti tərəfindən verilmişdir. İrəvan xanlığında yaşayan insanların əksəriyyəti azərbaycanlı idi. Zəngəzur mahalında yaşayanların hamısı azərbaycanlı idi. Ona görə, tarixi baxımından da bu, bizim torpağımızdır".***

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin qədim Azərbaycan şəhəri olan İrəvan şəhərinin tarixi taleyi haqqında irəli

[1]Bax: **Budaqov B., Qeybullayev Q.** Ermənistanda Azərbaycan mənşəli toponimlərin izahlı lüğəti. Bakı: Oğuz eli,1998,453 s.; **Bayramov İ.** Qərbi Azərbaycanın türk mənşəli toponimləri. Bakı: Elm, 2002.696 s.

sürdüyü fikirlər obyektiv reallıqları əks etdirməklə, tarixi mənbələrə və arxiv sənədlərinə əsaslanır. İrəvan xanlığının ərazisində tarixin yaddaşına çevrilmiş yüzlərlə maddi-mədəniyyət, memarlıq və incəsənət abidələri - məscidlər, türbələr, epiqrafik abidələr, qoç heykəlləri, təsviri və dekorativ tətbiqi sənət nümunələri olmuşdur[1]. Çox təəssüf ki, həmin abidələr Rusiya imperiyası tərəfindən İrəvana köçürülən ermənilər tərəfindən ya vəhşicəsinə dağıdılaraq yer üzündən silinmiş, ya da özününküləşdirilmişdir.

Azərbaycan Respublikasının Prezidenti cənab İ.Əliyevin də dediyi kimi, ***"İrəvan şəhəri tarixən azərbaycanlıların köklü yaşadığı böyük elm, maarif və mədəniyyət mərkəzlərindən biri kimi şöhrət tapmışdır. Şəhərdə Azərbaycan xalqına məxsus son dərəcə zəngin ədəbi-mədəni mühit formalaşmışdır"***[2].

İrəvan şəhərində və ümumiyyətlə, İrəvan quberniyasında zəngin və çoxşaxəli mənəvi mədəniyyətin, təhsil-tərbiyə mədəniyyətinin və ədəbi-bədii mühitin formalaşmasında Mirzə Qədim İrəvani, Fazil İrəvani, Axund Molla Məhəmməd İrəvani, Əbülqasım İrəvani, İsasultan, Əbülfət, Məhəmməd və Həmid Şahtaxtinskilər, Axund Məmmədbağır Qazızadə, Mirzə Məhəmmədvəli Qəmərlinski, Mirzə Əli Qəmərlinski, Abbas Məhəmmədzadə, Firidun bəy Köçərli, Cəlil Məmmədquluzadə, Mirzə Cabbar Əsgərzadə, Mirabbas Mirbağırov, Teymur xan Makinski[3], Pənah xan Makinski, Rəşid bəy İsmayılov, İbrahim Novruzov, Əlixan İrəvanski, Nəriman bəy Nərimanbəyov, Miryusif Mirbabayev, Əkbər ağa Şeyxülislamov, Eynəli bəy Sultanov, Mirzə Cabbar Məhəmmədzadə və digər yüzlərlə işıqlı zəka sahiblərinin müstəsna xidmətləri olmuşdur.



Onlar Qərbi Azərbaycan - indiki Ermənistan ərazisində maarifin və maarifçiliyin inkişafında müstəsna xidmətlər göstərmiş, pedaqoji hərəkatın yeni müstəvidə inkişafına və ictimai mühitin formalaşmasına təkan vermiş, həm ənənəvi məktəb və mədrəsələrin, həm də üsuli-cədid məktəblərinin açılmasına, təhsilin məzmununun təkmil-

---

[1]Ətraflı bax:İrəvan xanlığı (elmi redaktor:AMEA-nın müxbir üzvü, prof.**Y.Mahmudov**). Bakı: Azərbaycan, 2010,s.187

[2]"İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında" Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 29 dekabr 2021-ci il tarixli Sərəncamı // "Xalq qəzeti" 29 dekabr 2021-ci il

[3] Makinskilərin əsli Cənubi Azərbaycanın Maku şəhərindəndir. Onlar Makunun xanı olmuş Əhməd sultanın törəmələridir.

ləşdirilməsinə, ana dilində dərsliklərin nəşrinə, məktəbyaşlı uşaqların dünyəvi təhsilə (qəza məktəbləri, progimnaziya, gimnaziya, realni məktəb, rus-tatar məktəbi və s.) cəlb edilməsinə, yaşlı əhalinin savad almasını nəzərdə tutan cümə məktəblərinin, teatr truppasının və mətbuat nümunələrinin ("Lək-lək", "Bürhani həqiqət" və b.) yaradılmasına nail olmaqla millətin mənəvi inkişafını və tərəqqisini təmin etmişlər.

Çar Rusiyasının işğalından sonra Cənubi Qafqazda inzibati-ərazi bölgüsü tez-tez dəyişib, Azərbaycanın tarixi torpaqlarının böyük bir hissəsi siyasi sərhədlərimizdən kənarda qalıb. İrəvan və Təbriz bir-birindən və həm də Bakıdan ayrı düşüb. Buna baxmayaraq milli mədəniyyətimizin bütövlüyü, kökə bağlılığı, maarifin və maarifçiliyin inkişafında qarşılıqlı yaradıcılıq əlaqələri qırılmayıb, əksinə mənəvi bağlılıq daha da möhkəmlənib. İrəvanda üsuli-cədid hərəkatının yayılmasına, rus-tatar (Azərbaycan-F.R.) məktəblərinin açılmasına, dünyəvi məktəblərin şəbəkəsinin yaradılmasına, zəruri tədris ədəbiyyatının hazırlanmasına, maarifin və maarifçiliyin inkişafına Bakı və Təbriz ziyalıları dəyərli töhfələr verib.



***

Qeyd etmək lazımdır ki, ermənilər indiki Ermənistan ərazisində min illər boyu yaşayan azərbaycanlılarla bağlı məlumatları təhrif edərək özlərinə saxta tarix yaratmışlar. Lakin unudurlar ki, azərbaycanlıların həmin bölgənin köklü xalqı olması, möhtəşəm tarixə, adət-ənənəyə, maddi-mənəvi və təhsil-tərbiyə mədəniyyətinə, ədəbi-bədii irsə malik olması ilə bağlı Avropa və türk səyyahlarının, Rusiyanın işğalından sonra Cənubi Qafqazda fəaliyyət göstərmiş rus məmurlarının və müəllimlərinin (V.Q.Qriqoryev, K.A.Nikitin, S.P.Zelinski, K.Sadovski, K.Şulqin, A.Nikolski, V.Y.Devitski, L.L.Lopatinski və b.) əsərlərində kifayət qədər obyektiv faktlar, məlumatlar və fikirlər öz əksini tapmışdır.

"Qafqaz ölkəsi və xalqlarının təsviri üçün materiallar"da (SMOMPK)[1], Qafqaz təqvimi"ndə[2], Sankt-Peterburq, Moskva, Tbilisi, Azərbaycan dövlət arxivlərində və İ.Şopenin rəhbərliyi ilə

---

[1] Tiflisdə Qafqaz Tədris Dairəsi tərəfindən rus dilində buraxılan bu toplu 1881-1929-cu illər arasında nəşr edilmişdir. Toplunun 44 buraxılışı Tiflisdə (1881-1915-ci illər), 45, 46-cı buraxılışları isə 1926-cı və 1929-cu illərdə Mahaçqalada nəşr edilmişdir.

[2] "Qafqaz kalendarı" (rus. «Кавказский календарь») - Rusiya imperiyasının 1845-1916-cı illərdə Tiflisdə nəşr olunan illik kitab seriyası nəşri. Bu, Qafqazda nəşr olunan ilk kitab seriyası olub.

qeydiyyatçı katib A.Rıjkov tərəfindən tərtib edilmiş "İrəvan şəhərinin kameral təsviri" kitabında qədim Azərbaycan şəhəri İrəvanın əhalisinin adbaad siyahısı, etnik, sosial tərkibi, yaşı, məşğuliyyəti, sayı, ödədiyi vergilər, İrəvan şəhərindəki binalar, məhəllələr, meydanlar, çaylar, yollar, bağlar, yaratdıqları maddi və mənəvi dəyərlər, təhsil-tərbiyə müəssisələri (ənənəvi və dünyəvi), dövlətçilik ənənələri ətraflı təsvir edilib, İrəvan şəhəri tam inventarlaşdırılıb. Həmin mənbələr əsasında XIX əsrdə və XX əsrin əvvəllərində "İrəvan şəhəri - necə varsa" eləcə də bərpa etmək mümkündür.

Qərbi Azərbaycan (indiki Ermənistan) ərazisində yaşayan soydaşlarımızın orada yaratdığı maddi və mənəvi dəyərlərin, təhsil-tərbiyə mədəniyyətinin, dövlətçilik ənənələrinin öyrənilməsinin, tədqiq və təbliğ olunmasının hazırkı dövrdə çox mühüm əhəmiyyəti var.

Bu, ***hər şeydən əvvəl,*** Ermənistan adlanan təcavüzkar dövlətin son 30 ildə apardığı yalan və böhtan siyasətinə cavab olaraq onun özünün uydurma tarixinə yenidən baxılmasını tələb edir.

***Digər tərəfdən***, bu, həm də Azərbaycan tarixinin mühüm bir mərhələsinin, siyasi sərhədlərimizdən kənarda qalan torpaqlarımızda (İrəvan, Zəngəzur, Göyçə, Dərələyəz və b.) millətimizin əsrlər boyu yaratdıqları maddi və mənəvi dəyərlərin, təhsil-tərbiyə mədəniyyətinin, ədəbi-bədii irsin, dövlətçilik ənənələrinin öyrənilməsinə dövlət səviyyəsində çağırışın ifadəsidir.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev demişdir: ***"Bu gün biz yaxşı bilirik ki, Ermənistan dövləti tarixi Azərbaycan torpaqlarında yaranıb. Zəngəzur, Göyçə mahalı, İrəvan bizim doğma torpağımızdır. Biz qayıdacağıq".***

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin müəyyən etdiyi strateji hədəflərə yaxınlaşmaq məqsədilə indiki Ermənistan ərazisində xalqımızın əsrlər boyu yaratdığı maddi-mənəvi irsə sahib çıxmaqla tarixin yaxın zamanlarda bizə bəxş edəcəyi fürsətdən (o gün mütləq olacaq!!!) yararlanmağa hazır olmalıyıq.

## Milli yaddaşın bərpasına hədəflənmiş Sərəncam

Hər bir millət gələcəyə öz tarixinin çiynində gedir. Keçmişi bilməmək yalnız indi baş verənlərin dərkinə deyil, həm də gələcəyə nüfuz etmək təşəbbüslərinə mane olur. Keçmiş bu günlə bağlı olduğu kimi, gələcəklə də sıx əlaqədardır. Təkcə bu günü deyil, sabahı - gələcəyi dərindən dərk etmək, qiymətləndirmək baxımından da keçmişi yaxşı öyrənməli və sələflərimizin yaratdıqları mənəvi dəyərlərə sahib çıxmalıyıq. Keçmişi olmayan xalqın gələcəyi də yoxdur. Keçmişi bilməmək təkcə indinin dərkinə zərər gətirmir, o həm də gələcəyə nüfuz etmək təşəbbüslərini təhlükə altına qoyur.*"Keçmişi tam dərk etməklə biz bu günümüzü anlayırıq, fikrən keçmişin dərinliklərinə endikcə, gələcək fikirləri aşkar edirik, geriyə nəzər yetirməklə irəliyə addımlayırıq"* (A.İ.Gertsen).

Bu gün dünənin, sabah isə bu günün bətnindən doğduğuna görə bu gündə dünənin, sabahda isə bu günün izləri olur. Keçmişi nə qədər gözəl bilsək, hazırda yaratdıqlarımızın bütün əhəmiyyətini o qədər asan, o qədər dərin və sevinclə başa düşə bilərik. Ulu öndər Heydər Əliyev deyirdi ki, xalq gərək daim öz kökünü xatırlasın. Kökünü, keçmişini xatırlamayan xalq faciəli tarixini yenidən yaşamalı olur. *Tarix iki halda təkrarlanır: ibrət götürəndə – yaxşı məqamlar, götürməyəndə – pis məqamlar təkrar olunur (Əbu Turxan).*



Bu baxımdan Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 29 dekabr 2021-ci il tarixində imzaladığı "İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında" Sərəncam mühüm elmi-pedaqoji, siyasi-ideoloji, mədəni-mənəvi və həm də beynəlxalq siyasi əhəmiyyətə malikdir.

Bu sərəncam Azərbaycan elmi-pedaqoji ictimaiyyətində İrəvan xanlığına, onun tarixi keçmişinə, İrəvanda milli maarifçilik mühitinə və hərəkatına marağı artırmaqla yanaşı, həm də həmin irsə sahib çıxmağın nə qədər zəruri və vacib olmasını təsdiq etdi. Sərəncam həm də qədim yurd yerlərimizdən olan Qərbi Azərbaycanda (indiki Ermənistan ərazisində) böyük bir yaşam tariximizin unudulmaq təhlükəsini aradan qaldırır.

Unutqanlığımızı o torpaqda uyuyan ulularımızın ruhu bağışlamaz, zaman-zaman bizi dara çəkər...

Deməli, həm bu sərəncam, həm İrəvan Dövlət Azərbaycan Dram Teatrının 140 illiyinin qeyd edilməsi haqqında sərəncam, həm də bundan əvvəl imzalanan fərman[1] və sərəncamlar[2] İrəvan mahalında azərbaycanlıların min illər boyu yaratdığı tarixi irsə sahib çıxmaqla tarixi yaddaşımızı bərpa etməyə və strateji hədəflərə nail olmağa istiqamətlənib.

İrəvan Müəllimlər Seminariyasının 140 illik yubileyinin qeyd olunması xalqımızın ictimai, mədəni, maarifçilik irsinə ehtiramdan qaynaqlanmaqla yanaşı, həm də indiki Ermənistan Respublikasında bizim tarixi kimliyimizi silmək məqsədilə aparılan siyasətə ən tutarlı cavabdır.

Millətin milli-mənəvi dərk prosesinin güclənməsində, azərbaycançılıq ideologiyasının inkişafında milli təfəkkürü oyadan bu Sərəncamda deyilir:" *İrəvan şəhəri tarixən azərbaycanlıların köklü yaşadığı böyük elm, maarif və mədəniyyət mərkəzlərindən biri kimi şöhrət tapmışdır.Şəhərdə Azərbaycan xalqına məxsus son dərəcə zəngin ədəbi-mədəni mühit formalaşmışdır. İrəvan xanlığı çar Rusiyasının tərkibinə qatıldıqdan sonra burada dünyəvi təhsilə xüsusi diqqət yetirilməsində həmin mühitin özü əhəmiyyətli rol oynamışdır"*[3].



Bu sərəncam bir daha təsdiq edir ki, ***İrəvan Azərbaycanın dövlətçilik tarixinin, mədəniyyət və mənəviyyat tarixinin ayrılmaz tərkib hissəsidir***.

*"Hazırda Ermənistan Respublikasının yerləşdiyi ərazi keçmişdə - XIX əsrin əvvəllərində Azərbaycan dövləti olan İrəvan xanlığının torpağı idi. Bu torpaqların ən qədim yerli əhalisi –aborigen sahibləri Azərbaycan türkləri idi"*[4]

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyev 17 noyabr 2015-ci ildə Parisdə UNESCO Baş Konfransının 38-ci sessi-

---

[1] "Azərbaycanlıların soyqırımı haqqında" Azərbaycan Respublikası Prezidenti H.Əliyevin 26 mart 1998-ci il tarixli Fərmanı

[2]"İrəvan Dövlət Azərbaycan Dram Teatrının 125 illik yubileyi haqqında" 30 avqust 2006-cı il tarixli Azərbaycan Respublikası Prezidenti İ.Əliyevin Sərəncamı; "İrəvan mahalı Uluxanlı məktəbinin 125 illik yubileyi haqqında" 29 dekabr 2006-cı il tarixli Azərbaycan Respublikası Prezidenti İ.Əliyevin Sərəncamı

[3]"İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin Sərəncamı // "Xalq qəzeti", 2021, 29 dekabr

[4]İrəvan xanlığı. /elmi redaktoru AMEA-nın müxbir üzvü, prof. **Y.Mahmudov.** Bakı: Azərbaycan, 2010,s.17

yasının Liderlər Forumunda çıxış edərkən demişdi: ***"Ermənistanın bugünkü paytaxtı XX əsrin əvvəlində əhalisinin 80 faizini azərbaycanlılar təşkil edən bizim tarixi İrəvan şəhərimizdir. Bu gün şəhər tamamilə etnik təmizlənməyə məruz qalıb."***

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin İrəvanın qədim Azərbaycan şəhəri olmasına dair bəyanatları obyektiv reallığın, tarixi gerçəkliyin danılmaz ifadəsi olduğunu qəti şəkildə təsdiqləməklə yanaşı, tədqiqatçıları Vətənin hüquqi-siyasi sərhədlərindən kənarda qalan tarixinin ən mühüm məqamlarını dərindən araşdırmağa, uydurma Ermənistan dövləti ilə əlaqədar daha ciddi və dərin, ilk mənbələrə söykənən, milli maraqlara xidmət edən, strateji hədəflərə töhfə ola biləcək sanballı tədqiqatlar aparmağa sövq edir.

İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin keçirilməsi ilə bağlı Sərəncamın tələblərinə uyğun olaraq Azərbaycan Respublikasının Təhsil naziri ***Emin Əmrullayevin*** 31.01.2022-ci il tarixli F-43 nömrəli əmrinə əsasən "İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında" tədbirlər planı hazırlanmışdır.



Tədbirlər planında aşağıdakılar nəzərdə tutulmuşdur:

1. İrəvan Müəllimlər Seminariyasının 140 illik yubileyi ilə bağlı ölkə səviyyəli tədbirin keçirilməsi.

2. "Pedaqoji fikir salnaməmizə yaddaqalan səhifələr yazmış, regionda dünyəvi təhsil verən yeni tipli məktəb kimi fəaliyyət göstərmiş İrəvan Müəllimlər Seminariyası"mövzusunda elmi konfransların keçirilməsi.

3. İrəvan Müəllimlər Seminariyasının fəaliyyəti, məzunları və ona rəhbərlik edən maarifçi ziyalılarla bağlı aparılan tədqiqatların nəticələrinin elmi jurnallarda dərc edilməsi, ali təhsil müəssisələrinin saytlarında yerləşdirilməsi.

4. Azərbaycan Dövlət Pedaqoji Universitetində seminariyanın ilk müəllimlərindən olmuş görkəmli maarifpərvər ziyalı Firidun bəy Köçərli adına təqaüdün təsis edilməsi.

5. İrəvan Müəllimlər Seminariyasının yaranması, fəaliyyəti və tanınmış məzunları barədə məlumatların dərsliklərə və dərs vəsaitlərinə daxil edilməsi.

6. "İrəvan Müəllimlər Seminariyasının milli təhsil tariximizdə yeri və rolu" mövzusunda tədbirlərin ("dəyirmi masa"lar, seminarlar, görüşlər, sərgilər, disputlar və s.) keçirilməsi.

7. Görkəmli maarifpərvər ziyalı Firidun bəy Köçərlinin İrəvan Müəllimlər Seminariyasında müəllim kimi fəaliyyəti ilə bağlı Firidun bəy Köçərli adına Respublika Uşaq Kitabxanasında məktəblilərin iştirakı ilə görüşün təşkili.

8. "XIX əsrdə regional dünyəvi təhsil verən İrəvan Müəllimlər Seminariyasının müəllimləri və məzunları" mövzusunda məktəbdənkənar təhsil müəssisələrinin dərnək üzvləri arasında esse müsabiqəsinin keçirilməsi.

9. İrəvan Müəllimlər Seminariyasının 140 illik yubileyi ilə bağlı tədbirlərin kütləvi informasiya vasitələrində işıqlandırılması, seminariyanın tarixi və məzunları haqqında verilişlərin təşkili, "Azərbaycan müəllimi" qəzetində və "Azərbaycan məktəbi" jurnalında məqalələrin dərc edilməsi.

Respublikanın ümumtəhsil, orta ixtisas və ali məktəblərində "İrəvan Müəllimlər Seminariyasının milli təhsil tariximizdə yeri və rolu" mövzusunda "dəyirmi masa"lar, seminarlar, görüşlər, sərgilər, disputlar keçirilmişdir.



Təhsil Nazirliyinin tədbirlər planına uyğun olaraq 29 aprel 2022-ci ildə ***Azərbaycan Dövlət Pedaqoji Universitetində*** İrəvan Müəllimlər Seminariyasının 140 illik yubileyinin qeyd edilməsi ilə bağlı rektor, professor ***Cəfər Cəfərov*** tərəfindən 17 maddədən ibarət tədbirlər planı təsdiq edilmişdir.

Tədbirlər planına uyğun olaraq universitetin filiallarında və fakültələrində elmi-nəzəri konfransların, "dəyirmi masa"ların, sərgilərin keçirilməsi, İrəvanda maarifin və maarifçiliyin inkişafında müstəsna xidmətləri olan görkəmli maarifpərvər ziyalı Firidun bəy Köçərlinin adına təqaüd təsis edilməsi və həmin təqaüdün hər il universitetə ən yüksək balla daxil olan tələbəyə verilməsi nəzərdə tutulmuşdur.

2022-ci ilin oktyabrında universitetdə təhsil tarixçilərinin, pedaqoq və psixoloqların "Müəllim kadrları hazırlığında İrəvan Müəllimlər Seminariyasının rolu" mövzusunda respublika konfransının keçirilməsi də tədbirlər planına daxil edilmişdir.

## Qədim Azərbaycan şəhəri: İrəvan

Zəngi çayının sahilində dağlarla əhatə olunmuş düzənlikdə salınan qədim Azərbaycan şəhəri İrəvan şəhərinin yerləşdiyi ərazi tarixçilərin yazdıqlarına görə[1], müxtəlif zamanlarda Urartu, Sasani, Ərəb xilafəti, Sacilər, Şaddadilar, Səlcuqilər, Eldənizlər, Elxanilər, Teymurilər, Qaraqoyunlu, Ağqoyunlu, Səfəvilər, Əfşarlar, Qacarlar dövlətlərinin tərkibinə daxil olmuşdur.

İrəvan müxtəlif dövrlərdə Çuxursəd vilayətinin, İrəvan xanlığının[2], İrəvan quberniyasının mərkəzi olub. Orta əsrlər mənbələrində şəhərin adı Rəvan, İrəvan, Erevan, Errevant, İrvan, Revant kimi qeyd edilmişdir. 1828-ci ildə çar Rusiyasının işğalından sonra şəhər ruslar və ermənilər tərəfindən Erivan, 12 iyun 1936-cı ildə Yerevan (Ереван) adlandırılmışdır.

Ermənistan Respublikasının ensiklopediyasında (III cild, s. 571) verilən məlumatda göstərilir ki, İrəvanı 438 il azərbaycanlı xanlar idarə etmişlər.



Erməni tarixçisi H.Şahxatunyan xronoloji ardıcıllıqla tərtib etdiyi siyahıda 1390-1828-ci illərdə İrəvan bölgəsində hökmran olan 49 xanın adını qeyd etmiş, ilk xanın Əmir Səəd (1390-1410), sonuncu xanların isə (1806-1827) Hüseyn xan və Həsən xan qardaşları olduğunu yazmışdır[3].

---

[1] Ətraflı bax: **Nazim Mustafa.** İrəvan şəhəri. Bakı:"Red NLine" MMC , 2020, s.20-30

[2] 1747-ci ildə Nadir şahın öldürülməsindən sonra Azərbaycan ərazisində yaranan xanlıqlardan biri də İrəvan xanlığı (1747-10.II.1828) idi. Çuxursəd bəylərbəyliyinin böyük bir hissəsində yaranan bu xanlıq 15 mahaldan – Qırxbulaq, Zəngibasar, Qarnibasar, Vedibasar, Şərur, Suran, Bəzək, Saatlı, Tala, Seyidli-Axaclı, Sərdarabad, Qərpı, Abran, Dərəçiçək və Göyçədən ibarət olub. İrəvan şəhərinin özü isə inzibati cəhətdən 3 məhəlləyə bölünürdü: şəhər məhəlləsi, Topbaşı məhəlləsi və Dəmirbulaq məhəlləsi. İ.Şopen 1828-1832-ci illərə qədər İrəvan xanlığında əhalinin mütləq əksəriyyətinin azərbaycanlıların təşkil etdiyini yazmışdır. Onun hesablamalarına görə, İrəvan əyalətində yaşayan 16.075 ailə (81.749 nəfər) azərbaycanlı, 4.428 ailə (25.151 nəfər) isə erməni idi. Amerikalı professor Castin Makkarti Rusiya işğalına – 1828-ci ilə qədər İrəvan xanlığı əhalisinin 80 faizinin azərbaycanlı olduğunu təsdiq edir. İrəvan xanlığında türkdilli azərbaycanlıların yerli xalq olmasını Qafqazın ali baş komandanı İrəvan qalasının işğalına rəhbərlik etmiş general Paskeviç də qeyd edib. O, əhalinin milli tərkibi haqda verdiyi məlumatda burada 10 min azərbaycanlı, 3 min erməni ailəsinin yaşadığını bildirib.

[3] Həmin siyahı "İrəvan xanlığı" (Bakı: 2010) kitabında da verilmişdir.

1828-ci ildə İrəvan xanlığı Rusiya tərəfindən ilhaq edildikdən sonra burada əhalinin milli tərkibi nəzərə alınmadan Erməni vilayəti təşkil edilmiş, İrandan 40 min və Osmanlı dövlətindən 84600 erməni köçürülərək qədim Azərbaycan torpağına yerləşdirilmişdir[1]. Bununla da bölgədə ermənilərin sayı 24 faizdən 43 faizə yüksəlmişdir[2]. Ermənilərin İrəvan torpaqlarına köçürülməsi sonrakı illərdə də davam etdirilmişdir. Rus tarixçisi Q.Kuzneçov tədqiqatlarına görə, 1829-1831-ci illərdə Osmanlı dövlətindən Cənubi Qafqaza 150 min erməni köçürülmüşdür[3].



*İrəvan qalasının alınması.1827-ci il.Rəssam F.Rubo*



İrəvan xanlığının Rusiya tərəfindən işğalından sonra həmin ərazilərdə yeni idarəçilik sistemi yaradıldı. Qafqazın baş hərbi hakimi Paskeviçin əmri ilə 1827-ci il oktyabrın 6-da "İrəvanın müvəqqəti İdarəsi" adlı qurum yaradıldı. General Krasovski (yerli

---

[1]**Шавров Н.** Новая угроза русскому делу в Закавказъе: предстояшая распродажа Мугани инородцам. СПб.1901,с.59-61

[2]**Arzumanlı V., Mustafa N.** Tarixin qara səhifələri: Deportasiya. Soyqırım. Qaçqınlıq. Bakı:QartaL,1998,s.32

[3]**Кузнецов О.** Нашествие или исход? Переселение армян в Закавказъе в 1829-1831 гг. в трудах российские военных историков второй трети XIX –начало XX столетов //IRS-Наследие, №5(59), Баку, 2012,с.60

qoşunların komandanı) idarənin rəisi, İrəvan qalasının işğalında ruslara xidmət edən erməni arxiyepiskopu Nerses üzv təyin edildi. Azərbaycanlılar isə dövlət idarəçiliyindən tamamilə uzaqlaşdırıldı. N.Əhmədlinin yazdığına görə, ***"yeni rus idarəçiliyi yerli türk əhalini narazı saldığına görə onlar doğma yer-yurdlarını tərk edib İrana və Osmanlı torpaqlarına köçməyə başladılar."***[1]

İşğal ərəfəsində şəhərdə 20 min insan yaşayırdı ki, onların da 4 mini erməni, 16 mini azərbaycanlı idi. İşğaldan sonra yerli əhalinin (azərbaycanlıların) sayında ciddi azalma baş verdi. 5600 nəfər azərbaycanlının döyüş zamanı öldürülməsi və ya ölkənin digər bölgələrinə köçürülməsi nəticəsində azərbaycanlıların sayı 7200 nəfərədək azaldı. Ermənilərin isə sayı artaraq 4800 nəfər oldu. İldən-ilə demoqrafik vəziyyət ermənilərin xeyrinə dəyişməyə başladı. 1865-ci ildə şəhərdə yaşayan 12670 ailədən 6.900-u azərbaycanlı, 5.770-i erməni ailəsi idi. Əhalinin 54,5 %-ni azərbaycanlılar, 45,5-%-ni ermənilər təşkil edirdi.



1873-cü ildə İrəvan şəhərində yaşayan 11.938 nəfərdən 5.805 -ni (48,6 %) azərbaycanlılar, 5.959 nəfərini (49,9 %) ermənilər, 150 nəfərini ruslar (1,3%) təşkil edirdi.

1897-ci ildə əhalinin Ümumrusiya siyahıya alınmasında İrəvanda yaşayan azərbaycanlılar əhalinin 43,15 %-ni təşkil etmişdir.

Ardıcıl erməniləşdirmə siyasətinə baxmayaraq XX əsrin əvvəllərinə qədər İrəvanda əhalinin mühüm bir qismini etnik azərbaycanlılar təşkil etmişdir. Həmin dövrdə şəhərdə yaşayan əhalinin 9710 nəfərindən 7331 nəfəri (75,5 %)[2] azərbaycanlılar olmuşdur.

Sonrakı illərdə də ermənilərin İrəvan quberniyasına və ümumiyyətlə, Cənubi Qafqaza köçürülmələri davam etdirilmişdir. 1914-1916-cı illərdə Türkiyədən köçürülən 350 min ermənininin böyük əksəriyyəti İrəvan quberniyasına yerləşdirilmişdir.

1828-ci ildən başlayaraq azərbaycanlılara qarşı aparılan ayrıseçkilik, diskriminasiya 1905-1907 və 1918-1920-ci illərdə qanlı toqquşmalara çevrildi. İrəvan şəhərində,Vedibasar, Zəngibasar, Sürməli, Eçmiədzin (Üçmüəzdin), Şərur, Dərələyəz qəzalarında və

---

[1] İrəvan əyalətinin kameral təsviri. I cild. İrəvan şəhərinin kameral təsviri. (Tərcümə, tərtib və giriş mətninin müəllifi: **Nazir Əhmədli**). Bakı: "Turxan" NPB, 2018, s.22

[2] **Məmmədov İ., Əsədov S.** Ermənistan azərbaycanlıları və onların acı taleyi. Bakı: Azərbaycan,1992,s.11

Göyçədə kütləvi qırğınlar, yerli əhaliyə qarşı əsl soyqırım törədildi.

1918-1920-ci illərdə azərbaycanlıların soyqırımı nəticəsində indiki Ermənistan ərazisində yaşayan 575 min nəfərdən 565 mini ya öldürüldü, ya da dədə-baba torpaqlarından qovuldu. Bu faktlar Z.Korkodyanın "Sovet Ermənistanın əhalisi son yüzillikdə (1831-1931)" kitabında da öz əksini tapmışdır. O həmin kitabında yazırdı: *"1920-ci ildə sovet hökumətinə daşnaqlardan cəmi 10 min nəfərdən bir qədər artıq türk (azərbaycanlı-F.R.) əhali qalmışdı. 1922-ci ildə 60 min qaçqın qayıtdıqdan sonra azərbaycanlılar burada 72.596 nəfər təşkil etmişdir"*[1].

Daşnaq bolşeviklərin qovduğu və ya öldürdüyü azərbaycanlıların yerinə xarici ölkələrdən ermənilər köçürülərək yerləşdirilirdi.

1920-1936-cı illərdə indiki Ermənistan ərazisinə xarici ölkələrdən 46 min erməni köçürülmüşdür. 1945-ci ildə SSRİ XKS xarici ölkələrdə yaşayan ermənilərin "doğma ölkələrinə" qayıtmasına icazə verilməsi ilə bağlı qərar qəbul etdi. Bu məqsədlə Ermənistan SSR-ə xeyli maliyyə vəsaiti ayrıldı. Qısa bir vaxtda, 1946-1948-ci illərdə Ermənistana xarici ölkələrdən 100 mindən artıq erməni köçürüldü. Beləliklə də azərbaycanlılara qarşı 30-cu illərdən başlayan mənəvi-siyasi terror daha kəskin xarakter aldı.


Совет Министров Азербайджанской ССР

СОВЕТ МИНИСТРОВ СССР
ПОСТАНОВЛЕНИЕ № 4083
от 23 декабря 1947 г. Москва, Кремль.

О переселении колхозников и другого азербайджанского населения из Армянской ССР в Кура-Араксинскую низменность Азербайджанской ССР.

Совет Министров Союза ССР ПОСТАНОВЛЯЕТ:

1 Переселить в 1948-1950 гг. на добровольных началах в Кура-Араксинскую низменность Азербайджанской ССР 100 тыс. колхозников и другое азербайджанское население из Армянской ССР, из них: 10 тыс. человек – в 1948 году, 40 тыс. человек – в 1949 году и 50 тыс. человек – в 1950 году.

11. Разрешить Совету Министров Армянской ССР освобождаемые азербайджанским населением постройки и жилые дома в связи с переселением их в Кура-Араксинскую низменность Азербайджанской ССР использовать для расселения зарубежных армян, прибывающих в Армянскую ССР.

Председатель
Совета Министров Союза ССР И.Сталин

Управляющий Делами
Совета Министров СССР Я.Чадаев

*"Ermənistan SSR-dən kolxozçuların və başqa azərbaycanlı əhalinin Azərbaycan SSR-in Kür-Araz ovalığına köçürülməsi haqqında" qərar*

Sovet hakimiyyəti illərində də azərbaycanlılara qarşı ayrı-seçkilik davam etdirilmiş,

[1] **Kordokyan S.** Sovet Ermənistanının əhalisi son yüzillikdə (1831-1931). İrəvan, 1932, s.184

Ermənistandakı azərbaycan əhalisinin Azərbaycana köçürülməsi prosesi dövlət siyasəti səviyyəsində həyata keçirilmişdir. 23 dekabr 1947-ci ildə SSRİ Nazirlər Sovetinin "Ermənistan SSR-dən kolxozçuların və başqa azərbaycanlı əhalinin Azərbaycan SSR-in Kür-Araz ovalığına köçürülməsi haqqında" qərarı ilə 100 mindən artıq azərbaycanlı zorla ata-baba yurdlarından köçürülmüş və ya köçməyə məcbur edilmişdir.

## İrəvanda xal qalmadı...



İrəvanda nə qaldı ki?! Sonrakı illərdə intellektual qüvvələrə, ziyalılara qarşı törədilən mənəvi terror nəticəsində xeyli azərbaycanlı ailəsi ilə birlikdə tarixi torpaqları tərk etməli oldu. 1988-1989-cu illərdə isə indiki Ermənistan ərazisində (Qərbi Azərbaycanda) yaşayan azərbaycanlılara qarşı deportasiya həyata keçirildi, 261 kənd və qəsəbədə yaşayan 49 min 928 ailə, yəni 250 min nəfər ata-baba yurdlarından qovuldu, 217 nəfər azərbaycanlı vəhşicəsinə qətlə yetirildi.

XIX əsrin 30-cu illərindən başlayaraq yerli əhaliyə -azərbaycanlılara qarşı aparılan mənəvi və fiziki terror, ardı-arası kəsilməyən təqiblər, irqi və milli zəmində dəhşətli diskriminasiya, deportasiya, kütləvi qırğınlar, soyqırım və qətliamlar nəticəsində indiki Ermənistan monoetnik respublikaya çevrildi. Min illər boyu xalqımızın həmin bölgədə yaratdığı zəngin mədəni-mənəvi irs və monumental tarixi-memarlıq abidələri ya erməniləşdirildi, ya da məhv edildi.

Məscidlər, ziyarətgahlar dağıdıldı və yandırıldı, ümumtəhsil məktəblərinin, peşə və orta ixtisas məktəblərinin, ali pedaqoji məktəbin Azərbaycan bölməsinin qapıları azərbaycanlıların üzünə bağlanıldı.

Həmin dövrdə Ermənistan SSR-də azərbaycanlılar həm təlimin ana dilində təşkil edildiyi məktəblərdə, həm də beynəlmiləl məktəblərdə oxuyurdular.

## *1981/1982-ci tədris ilində Ermənistan SSR-də fəaliyyət göstərən Azərbaycan məktəbləri və orada təhsil alan şagirdlərin sayı*[1]

| Rayon və şəhərlər | Azərbaycan məktəbləri | | | | |
|---|---|---|---|---|---|
| | Məktəblə-rin sayı | Şagirdlə-rin sayı | O cümlədən | | |
| | | | ibt. | 8 illik | orta |
| Dərələyəz (Əzizbəyov) | 7 | 829 | - | 443 | 386 |
| Amasiya | 20 | 4932 | - | 916 | 4016 |
| Vedi (Ararat) | 2 | 1064 | - | - | 1064 |
| Artaşat | 1 | 38 | - | 38 | - |
| Vardenis (Basarkeçər) | 25 | 9218 | - | 1891 | 7827 |
| Gorus | 3 | 207 | - | 68 | 139 |
| Quqark (Böyük Qarakilsə) | 5 | 2143 | - | 245 | 1898 |
| Yeğenadzor (Keşişkənd) | 10 | 1338 | 32 | 492 | 810 |
| İcevan (Karvansara) | 5 | 795 | 19 | 33 | 743 |
| Kalinino | 9 | 1817 | 64 | 224 | 1529 |
| Qafan | 19 | 2328 | 30 | 736 | 1562 |
| Çəmbərək (Krasnoselo) | 11 | 3813 | - | 237 | 3576 |

[1] Sonrakı illərdə məktəblərin sayı artmasa da şagirdlərin sayı xeyli artmışdır.

| | | | | | |
|---|---|---|---|---|---|
| Masis (Zəngibasar) | 9 | 3766 | - | - | 3766 |
| Meğri (Mehri) | 4 | 888 | - | - | 888 |
| Varana (Noyamberyan) | 3 | 862 | 41 | - | 821 |
| Axta (Razdan) | 2 | 293 | | 57 | 236 |
| Qarakilsə (Sisyan) | 8 | 1342 | - | 365 | 977 |
| Spitak | 2 | 1143 | - | - | 1143 |
| Allahvedi (Tumanyan) | 3 | 356 | 28 | 72 | 256 |
| İrəvan şəhəri | 2 | 176 | - | 36 | 140 |
| Dilican şəhəri | 1 | 57 | - | 57 | - |
| Qafan şəhəri | 3 | 686 | | 31 | 655 |
| Calaloğlu (Stepanavan) | 1 | 104 | | 104 | - |
| **Cəmi** | **155** | **38195** | **214** | **5549** | **32432** |



Keçən əsrin 80-ci illərinin əvvəllərində Ermənistanda təlimin Azərbaycan dilində aparıldığı 155 məktəbdə 32432, 38 beynəlmiləl məktəbdə isə 4571 azərbaycanlı şagird oxuyurdu.

***1981/1982-ci tədris ilində Ermənistan SSR-də fəaliyyət göstərən beynəlmiləl məktəblər və orada təhsil alan azərbaycanlı şagirdlərin sayı***

| Rayon və şəhərlər | Beynəlmiləl məktəblər | | | | |
|---|---|---|---|---|---|
| | Məktəb-lərin sayı | Şagird-lərin sayı | O cümlədən | | |
| | | | ibt. | 8 illik | orta |
| Abovyan | 1 | 9 | - | - | 9 |
| Əzizbəyov | 1 | 156 | - | - | 156 |
| Amasiya | 1 | 395 | | - | 395 |
| Ararat (Vedi) | 9 | 1473 | - | 155 | 1318 |
| Artaşat | 1 | 7 | - | | 17 |
| Vardenis (Basarkeçər) | 4 | 914 | - | 355 | 559 |
| Quqark (Böyük Qarakilsə) | 1 | 210 | - | - | 210 |
| Yeğenadzor (Keşişkənd) | 4 | 160 | | 117 | 43 |
| Kalinino | 1 | 198 | - | - | 198 |
| Qafan | 2 | 189 | - | 16 | 173 |
| Krasnoselo (Çəmbərək) | 1 | 245 | - | | 245 |
| Masis (Zəngibasar) | 2 | 362 | - | - | 362 |
| Noyamberyan | 2 | 303 | - | 154 | 149 |
| Oktamberyan | 1 | 29 | | | 29 |
| Razdan (Axta) | 1 | 125 | | 125 | |
| Sisyan | 3 | 601 | - | - | 601 |
| Spitak | 1 | 52 | - | 52 | - |
| Çermux | 2 | 179 | | | 179 |
| **Cəmi** | **38** | **5617** | **-** | **974** | **4571** |

Bu məktəbləri 1989-cu ilə kimi bitirənlərdən 10 nəfəri Azərbaycan Milli Elmlər Akademiyasının həqiqi üzvü, 9 nəfəri müxbir üzvü seçilmiş, 140 nəfəri elmin ayrı-ayrı sahələri üzrə doktorluq dissertasiyası müdafiə edərək professor elmi adı, 740 nəfəri elmlər namizədi (fəlsəfə doktoru) dissertasiyası müdafiə edərək dosent elmi adı almış, 18 nəfəri Sosialist Əməyi Qəhrəmanı, 1 nəfəri Sovet İttifaqı Qəhrəmanı, 1 nəfəri Ermənistan SSR Əməkdar mədəniyyət xadimi, 6 nəfəri Ermənistan SSR Əməkdar incəsənət xadimi, 6 nəfəri Ermənistan SSR Əməkdar jurnalisti, 4 nəfəri Ermənistan SSR Əməkdar artisti, 2 nəfəri Azərbaycan SSR Xalq artisti, 79 nəfəri Ermənistan SSR Əməkdar müəllimi, 1 nəfəri Ermənistan SSR Əməkdar aqronomu, 5 nəfəri Azərbaycan SSR Əməkdar müəllimi, 2 nəfəri Azərbaycan SSR Əməkdar mühəndisi fəxri adlarına layiq görülmüşdür[1].

Ermənistan dövlətinin azərbaycanlılara qarşı həyata keçirdiyi mənfur siyasətin mahiyyəti Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin 18 dekabr 1997-ci ildə imzaladığı *"1948-1953-cü illərdə azərbaycanlıların Ermənistan SSR ərazisindəki tarixi-etnik torpaqlarından kütləvi surətdə deportasiyası haqqında"* Fərmanda geniş və əhatəli şəkildə açıqlanmışdır. Fərmanda yazılır:"*Son iki əsrdə Qafqazda azərbaycanlılara qarşı məqsədyönlü şəkildə həyata keçirilmiş etnik təmizləmə və soyqırım siyasəti nəticəsində xalqımız ağır məhrumiyyətlərə, milli faciə və məşəqqətlərə məruz qalmışdır. Mərhələ-mərhələ gerçəkləşdirilən belə qeyri-insani siyasət nəticəsində azərbaycanlılar indi Ermənistan adlandırılan ərazidən – min illər boyu yaşadıqları öz doğma tarixi-etnik torpaqlarından didərgin salınaraq kütləvi qətl və qırğınlara məruz qalmış, xalqımıza məxsus minlərlə tarixi-mədəni abidə və yaşayış məskəni dağıdılıb viran edilmişdir"*[2]

Moskvadakı havadarlarının köməyi ilə "türksüz Ermənistan" yaratmağa nail olan Ermənistan dövləti 1988-1994-cü illərdə hərbi təcavüzünü Azərbaycan ərazisində davam etdirdi. Dağlıq Qarabağ və ona bitişik 7 rayon, həmçinin Qazaxın 7 kəndi (Bağanis Ayrım, Barxudarlı, Qızıl Hacılı, Xeyrimli, Sofulu, Aşağı Əskipara, Yuxarı



[1] Ətraflı bax: Ermənistandan olan azərbaycanlı alimlər.IV fəsil. Ermənistan azərbaycanlılarının tarixi coğrafiyası.Bakı: Gənclik, 1995, s. 411-447

[2] "1948-1953-cü illərdə azərbaycanlıların Ermənistan SSR ərazisindəki tarixi-etnik torpaqlarından kütləvi surətdə deportasiyası haqqında" Azərbaycan Respublikasının Prezidenti Heydər Əliyevin 18 dekabr 1997-ci il tarixli Fərmanı

Əskipara) və Naxçıvanın Kərki kəndi erməni silahlı birləşmələri tərəfindən işğal edildi. Sovet Ordusunun 366-cı motoatıcı alayının hərbçilərinin iştirakı ilə ermənilər Xocalı soyqırımı törətdilər, 1 milyon insan öz yurdundan məcburi köçkünə çevrildi. Müzəffər Ali Baş Komandan İlham Əliyevin rəhbərliyi ilə Azərbaycan ordusu 44 günlük Vətən müharibəsi zamanı 7 rayonu, Şuşa və Hadrud şəhərlərini işğaldan azad etsə də, anklavda yerləşən kəndlər hələ də ermənilərin nəzarətində qalmışdır.

## İrəvanda maarifçilik mühiti

İrəvan quberniyasında yaşayan azərbaycanlılar Bakı və Gəncə quberniyalarından sonra sayca üçüncü yeri tuturdu. Orta əsrlərdə olduğu kimi, XIX əsrin əvvəllərində də İrəvanda uşaqların təhsili məscidlərin nəzdində və şəxsi evlərdə təşkil edilən ənənəvi məktəb və mədrəsələrdə həyata keçirilirdi. Məktəb işləri ruhanilərin nəzarətində idi. Burada ənənəvi məktəb və mədrəsələrin geniş şəbəkəsi mövcud idi. İrəvanın əhalisinin kameral siyahıya alınmasını həyata keçirən İ.İ.Şopenin[1] yazdığına görə, *XIX əsrin 20-ci illərinin sonunda İrəvanda 8 böyük məscid fəaliyyət göstərirdi ki, bunlardan da 2-si qalanın içərisində yerləşirdi*[2].

Çar Rusiyasının İrəvan xanlığını işğal etdikdən sonra həmin məscidlərdən birindən silah, digərindən isə ərzaq anbarı kimi istifadə olunurdu. Həmin dövrdə şəhərdə Zalı xan, Novruzəli bəy, Sərtib xan, Hüseynəli xan, Hacı İmam, Hacı Cəfər bəy məscidləri də fəaliyyət göstərirdi. Məscidlərin içərisində ən möhtəşəmi Hüseynəli xan məscidi və ya Göy məscid hesab olunurdu[3].

İrəvanda 4 böyük məscidin dağıldığını bildirən İ.İ.Şopenin məlumatına görə, şəhərdə 332 axund və molla, 105 mirzə, 188 seyid, 10 dərviş yaşayırdı[4].

---

[1]Кавказский календарь... Текст на 1882 год. Тифлисъ.1881

[2]**Шопен, И.И.** Исторический памятник состояния Армянской области в эпоху ее присоединения к Российской империи: В тип. Имп. Академии наук, 1852, s.687

[3] Divarları göy rəngli kaşı ilə üzləndiyi üçün bu məscid Göy məscid adlanırdı.

[4] **Шопен, И.И.** Исторический памятник состояния Армянской области в эпоху ее присоединения к Российской империи: В тип. Имп. Академии наук, 1852, s.700



*Göy məscid*



XX əsrin 30-cu illərindən başlayaraq həmin məscidlər, ziyarətgahlar, dini-mədəni abidələr dağıdılmağa başlanıldı. Böyük maddi və mənəvi irsdən bu günümüzə qədər salamat qalan yalnız Göy məsciddir. Azərbaycanın memarlıq nümunələrindən biri olan məscidin eni 66 metr, uzunluğu 97.2 metrdir. Məscid 28 hücrə, kitabxana, ibadətgah və iç həyətdən ibarətdir. Ümumilikdə 7.000 kvadrat metrlik ərazidə yerləşir. Məscidin 24 metr hündürlüyü olan 4 minarəsindən 3-ü ermənilər tərəfindən sökülüb.

***Haşiyə.*** *Ermənilər Göy məscidi niyə sökmədi? XX əsrin 30-cu illərində İrəvanda bütün məscidlərin sökülməsi qərara alınsa da, 1776-cı ildə İrəvan xanı Hüseynəli xanın əmri ilə inşa olunan Göy məscid son anda sökülmək təhlükəsindən xilas oldu. Məşhur erməni şairi Yeğişe Çarensin[1] "mavi brilyant" adlandırdığı məscid onun ciddi səyi nəticəsində muzeyə çevrildi. 1936-cı ildə Göy məscidin binasında İrəvan şəhər tarix muzeyi yerləşdirildi. 1941-1945-ci illərdə məsciddən həm də hərbi sursat anbarı kimi istifadə edilmişdir. Müharibədən sonra məsciddə Təbiət muzeyi, 1952-ci ildən sonra isə məscidin ibadət zalında planetarium fəaliyyət göstərmişdir. 1991-ci ildən sonra bəzi müsəlman dövlətləri ilə diplomatik münasibət quran Ermənistan Göy məsci-*

---

[1] Y.Çarens 1897-ci ilin mart ayında Qars şəhərində anadan olub,1937- ci ildə Stalin repressiyasının qurbanı olub.

*din yenidən ibadətgah kimi fəaliyyət göstərməsinə icazə vermək məcburiyyətində qaldı.1991-ci ildə Təbiət muzeyi, 1994-cü ildə Tarix muzeyi binadan çıxarıldı. 1995-ci ildə İran hökumətinin maliyyə vəsaiti ilə məscidin bərpasına başlanıldı.Göy məscidin 24 metrlik minarəsi, 28 hücrəsi, kibabxanası, böyük zalı,günbəzi və həyəti əsaslı təmir edildi. 2006-cı ildə təmiri başa çatan Göy məscid Ermənistana gələn əcnəbilərə "fars məscidi" kimi təqdim edilir.*

İrəvanda fəaliyyət göstərən məscidlərin demək olar ki, hamısında mollaxana (ibtidai müsəlman məktəbi), böyük məscidlərdə isə mədrəsələr fəaliyyət göstərirdi. Yalnız Hüseynqulu xan məscidinin nəzdindəki məktəbdə 200 şagird[1] oxuyurdu. Yerli azərbaycan əhalisi böyüyən nəslin dini təhsil almasına böyük önəm verirdi. Mədrəsələrdə təhsilin məzmunu digər Şərq mədrəsələrində olduğu kimi, mürəkkəb və çətin idi. Burada ərəb dilinin qaydaları, tarix, təftil[2], təcvid[3] "Quran"ın təfsiri, hədislər, fiqh və məntiq, riyaziyyat, həndəsə, astronomiya, nəzəri fəlsəfə və tibb öyrədilirdi.

İ.İ.Şopen yazırdı ki, müsəlman məktəblərindəki təlimdə bütün elmlər üç başlıca sahəyə ayrılır:

a) *Əl-ərəbiyyat,* xüsusi ədəbiyyatdır ki, özündə iyirmidən artıq bilik sahəsini birləşdirir: burada 1) Dilçilik; 2) Etimologiya; 3) Sintaksis; 4), 5) və 6) Ritorikanın üç hissəsi; 7), 8), 9) və 10) Ərəb dilinin uzun və qısa, vurğulu və vurğusuz tələffüz üsulları; 11) Tarix və onun müxtəlif sahələri; 12) Quranın oxunması ( elmül - qiraət).



b) *Əl-Şəriət,* İlahiyyat və ümumən İslam hüquqşünaslığı.

Buraya altı bölmə aiddir: 1) Quranın şərhi (elmül-təsvir); 2) Elmül-hədis; 3) Praktik ilahiyyat (hüquqşünaslığa aid olan fiqh elmi); 4) Sxolastik ilahiyyat (elmül-kəlam); 5) Mirası bölmək qaydaları (Elmül - fərz); 6) Üsulül - fiqh. Məzhəblərin qanunçuluğunun müxtəlif şöbələrinin əsasları.

c) Əl-kimya, Fəlsəfə, beş hissədən ibarətdir: 1) Məntiq; 2) Riyaziyyat; 3) Coğrafiya və astronomiya (nücum); 4) Tibb və təbiət elmləri; 5) Nəzəri fəlsəfə[4].

---

[1] Yenə orada, s.467

[2] "Quran"ın mənasının başa düşülməsi

[3] "Quran"ın düzgün oxunması

[4]**Шопен И.И.** Исторический памятник состояния Армянской области в эпохи ее присоединения к Российской империи. Санкт- Петербург: 1852, с.903-904

Mədrəsələrin vahid proqramı və konkret təhsil müddəti yox idi. Təhsil müddəti tələbələrin dərsi mənimsəmə səviyyəsindən asılı idi. Mollaxanalarda (ibtidai müsəlman məktəbi) isə əksinə, təhsilin məzmunu sadə idi: oxu, yazı, ərəb və fars dilləri öyrədilir, tədris "Quran"ın avazla qiraəti ilə başa çatırdı.

1830-cu ildə Cənubi Qafqazda 1134 məscid mövcud idi ki, onların da əksəriyyətinin nəzdində ya mollaxana, ya da mədrəsə fəaliyyət göstərirdi. Ənənəvi müsəlman məktəbləri ilə bərabər İrəvanda həm də kilsə-məhəllə məktəbləri fəaliyyət göstərirdi ki, burada təhsil alanların sayı 60 nəfərdən çox deyildi[1]. Xristianlar üçün nəzərdə tutulan həmin məktəbdə 10 müsəlman uşağı da oxuyurdu.

XIX əsrin 30-cu illərindən İrəvan quberniyasında dünyəvi təhsil intişar tapsa da, dini təhsil üstünlüyünü qoruyub saxlayırdı. 1864-1865-ci illərdə İrəvan quberniyasında 183 məscid, 70 ibadət evi azərbaycanlı əhalinin dini ehtiyaclarını qarşılayırdı.

1862-ci ildə İrəvan quberniyasında 206 təhsil müəssisəsi (dini və dünyəvi) fəaliyyət göstərirdi ki, orada 293 müəllim (azərbaycanlı, erməni və rus) dərs deyirdi. Təhsil alan şagirdlərin 4256 - sı oğlan, 117-si qız idi ki, onlardan 1500 nəfərdən çoxunu müsəlmanlar (azərbaycanlılar-R.F.) təşkil edirdi[2].



QTD-nin[3] popeçiteli 1867-ci ildə Qafqaz sərdarına yazdığı illik hesabatında bildirirdi ki, məscid nəzdindəki müsəlman məktəblərinin və oradakı şagirdlərin təxmini sayını müəyyən etmək təşəbbüsümüz heç bir nəticə vermədi. Hər halda onların sayı çox böyükdür,

---

[1] **Шопен И.** Исторический памятник состояния Армянской области в эпоху ее присоединения к Российской империи. СПб., «В типографии Императорской Академии Наук», 1852.s.902

[2] Сборник статистических сведений о Кавказе.Том I. (составитель: **И. Воронов**). Тифлис – 1869, с.30

[3] Çar Rusiyasının təhsil siyasəti Qafqazda 18 dekabr 1848-ci ildə yaradılan Qafqaz Tədris Dairəsi tərəfindən həyata keçirilirdi. İlk vaxtlarda QTD 5 məktəb direksiyasına (Tiflis, Kutaisi, Şamaxı-Dərbənd, Stavropol, Qaradəniz) bölünmüşdü. İrəvan, Naxçıvan və Aleksandropol təhsil müəssisələri Tiflis direksiyasına tabe olsa da, Yelizavetpol, İrəvan və Naxçıvan qəzalarının müsəlman məktəbləri Şamaxı-Dərbənd direksiyasının sərəncamına verilmişdi. 29 oktyabr 1853-cü ildə QTD və onun tabeliyindəki təhsil müəssisələri ilə bağlı yeni nizamnamə təsdiq edildi. QTD 4 direksiyaya bölündü. Şamaxı və Dərbənd quberniyalarının tədris müəssisələri Tiflis direksiyasına, İrəvan quberniyasının tədris müəssisələri Kutaisi direksiyasının tərkibinə verildi. 2 iyul 1860-cı ildə təsdiq edilən yeni nizamnamənin şərtlərinə görə, Qafqaz Tədris Dairəsi ləğv edildi, məktəblərin idarə olunması qubernator və vilayət rəislərinə həvalə edildi.

800-dən çox məktəb, heç olmasa 15 min şagird var. Onların da xeyli hissəsi İrəvan azərbaycanlılarının payına düşürdü[1].

1871-ci ilin məlumatına görə, İrəvan şəhərində 11 məscid məktəbi var idi və onların sayı ildən-ilə artırdı. 1884-cü ilin məlumatına görə, İrəvan şəhərində 8 şiə məscidi, 13 ibadət evi, İrəvan qəzasında isə 25 şiə məscidi, 56 ibadət evi (2-si sünnülər üçün) fəaliyyət göstərirdi.

5 aprel 1872-ci ildə Cənubi Qafqazın şiə və sünnü təriqətinə mənsub Müsəlman Ruhani İdarəsinin fəaliyyətini tənzimləyən Əsasnamə təsdiq edildi. Bundan sonra Cənubi Qafqazda, o cümlədən İrəvan quberniyasında dini təhsilin sistemli şəkildə yenidən qurulmasına başlanıldı.

1879-cu ilin məlumatına görə, İrəvan şəhərindəki 12 məscid məktəbində 12 müəllim 208 şagirdin, İrəvan qəzasında isə 8 məscid məktəbində 8 müəllim 153 şagirdin təhsil-tərbiyəsi ilə məşğul olurdu. Təhsil müddəti 7 il idi, 8 yaşdan 15 yaşa kimi davam edirdi. Aylıq təhsil haqqı 50-60 qəpik təşkil edirdi.

Həmin dövrdə İrəvan şəhərində 10, quberniyada isə 20 mədrəsə fəaliyyət göstərirdi. Yüksək tipli tədris müəssisələrində - mədrəsələrdə oxuyanlar tələbə adlanırdı. Onların illik təhsil haqqı gümüş pulla 3-10 rubl təşkil edirdi. Təhsil haqqının müəyyənləşdirilməsi tələbələrin dərsi necə qavramasından və mənimsəmə səviyyəsindən asılı idi.



1884-cü ildə İrəvan quberniyasında 26 məscidin nəzdində məktəb fəaliyyət göstərirdi[2]. 1886-cı ildə həmin məktəblərdə 672 şagird təhsil alırdı.

XX əsrin 80-ci illərinin ikinci yarısından başlayaraq dünyəvi təhsil müəssisələri tədricən ənənəvi məktəb və mədrəsələri üstələməyə başladı. Dünyəvi təhsilin genişlənməsi nəticəsində yeni tipli məktəblərdə oxuyan azərbaycanlıların sayı xeyli artdı. 1887-ci ildə məscid məktəblərində təhsil alanların sayı 1 il müddətində 105 nəfər azalaraq 567 nəfər oldu.[3]

Məscid elm ocağı olmaqla yanaşı, siyasi və ictimai məsələlərin həll edildiyi, xütbələr oxunduğu, insanların cihada çağırıldığı,

---

[1] **Əhmədov H.** Azərbaycan məktəb və pedaqoji fikir tarixi. Bakı:Elm və təhsil, 2014, s.161

[2]Обзор Эриванской губернии за 1884. Эриван.Типография **Р.К.Эделсона,**1885, s.44

[3] **Məmmədov İ.** Tariximiz.Torpağımız.Taleyimiz. Bakı:Adiloğlu,2002, s.537

dövlət başçılarına beyət edilən yer olmuşdur[1]. Tanınmış ilahiyyatçı alim Hacı Sabir Həsənlinin təbirincə desək, *məscid ictimai həyatda bir növ parlament rolunu oynamışdır*.

Orta əsrlərdə formalaşan bu ənənə sonrakı illərdə də qorunub saxlanıldı. Məscidlər Cənubi Qafqazda XX əsrin 20-ci illərinə, yəni bolşevik işğalına kimi bu və ya digər şəkildə öz nüfuzlarını qoruyub saxlaya bildi. Əgər 1897-ci ildə İrəvan quberniyasında 21[2], 1909-cu ildə 42[3]məscid məktəbi fəaliyyət göstərirdisə, 1910-cu ildə onların sayı 53[4] olmuşdur.

Azərbaycanın digər bölgələrində olduğu kimi, İrəvan quberniyasında da azərbaycanlıların dini təhsil almaları üçün həm məktəblər (ibtidai təhsil), həm də mədrəsələr (orta dini təhsil) fəaliyyət göstərirdi.

İrəvanda yeni məktəb sisteminin yaradılması XIX əsrin 30-cu illərinə təsadüf edir. Yerli xalqları itaətdə saxlamaq, ***ruslaşdırma, xristianlaşdırma*** və ***rusiyalaşdırma*** siyasətini həyata keçirmək, çarizmin hökmranlığını möhkəmləndirmək məqsədilə milli ucqarlarda qəza məktəblərinin açılmasını nəzərdə tutan 2 avqust 1829-cu il tarixli Zaqafqaziya məktəblərinin ilk nizamnaməsi qəbul olundu.



Azərbaycanda ilk dünyəvi təhsil verən qəza məktəblərinin açılmasına Zaqafqaziyanın baş hakimi general A.P.Yermolovun[5] Rusiya Xalq Maarif Nazirliyinə ünvanladığı məktubun mühüm təsiri olmuşdur. General məktubunda yazırdı:*"Cənubi Qafqaz daxilindəki Azərbaycan xalqları ilə, həmçinin xarici qonşu hökumətlərlə saysız-hesabsız əlaqələr Azərbaycan dilini bilən bacarıqlı adamlar, tərcüməçilər olmadan mümkün deyil"* .

Qafqazda hərbi xidmətdə olan admiral Mordvinov A.P.Yermolovdan xeyli əvvəl, 1816-cı il iyunun 19-da mərkəzi hökumətə müraciəti də bu cəhətdən xarakterikdir. O yazırdı:"*Belə xalqları*

---

[1] **Rüstəmov F.** Pedaqogika tarixi. Bakı: Elm və təhsil, 2006,s.163

[2]Обзор Эриванской губернии на 1897 год. Эриван.Типография **Р.К.Эделсона,**1898, с.31

[3] Кавказский календарь на 1910 год..Тифлись, 1909, Ч.1, отд.4, с.591

[4] Кавказский календарь на 1912 год..Тифлись, 1911, Ч.1, отд.4, с.310-311

[5] General A.P.Yermolov Qafqazdakı rus qoşunlarının baş komandanı olub. Qafqazın müsəlman xalqlarının, xüsusilə azərbaycanlıların qəddar düşməni olub. Diplomatik fəaliyyətində kobudluğu və özbaşınalığı ilə yadda qalıb.

*silah gücü ilə həmişəlik ram etmək mümkün deyil. Təhsilli xalqa nisbətən, savadsız, dəliqanlı xalqı idarə etmək üçün ona ehtiyac hiss etdiyi şeyləri vermək gərəkdir.Bu xalqlarda yeni arzular, yeni ehtiyaclar, yeni adətlər yaratmaq, onları bizim təsəvvürümüzə, zövqümüzə, ehtiyacımıza yaxınlaşdırmaq vacibdir. İlk növbədə isə bizim məktəbləri Cənubi Qafqaz şəhərlərinə aparıb çıxarmaq lazımdır. O vaxt nəinki onlarla dostlaşacağıq, həm də daimi düşmənçiliyi artırmağa səbəb olan bizim süngü və mərmilərimizin heç bir vaxt çatmadığı sərvətli dağlarını təpələrinə qədər fəth edəcəyik*".

Admiralın fikrincə, *bu yerlərin maarifinə 100 min manat pul xərcləməklə, sərhədləri qorumaqda, böyük ordunu saxlamağa sərf olunan milyonlarla manata qənaət edilmiş olardı.*

Cənubi Qafqazı gəzən general-adyutant Sipyaginin fikirləri isə daha maraqlıdır. O yazırdı:*"İstər yerli zadəganların, istərsə də digər silklərə mənsub olanların heç bir təhsil imkanı olmadığından öz uşaqlarını oxutdurub, onlara vəzifələr barədə sadə təsəvvür təlqin edə bilmirlər. Ona görə də burada yaşayan əhaliyə həyat üçün zəruri olanları öyrətməyin yollarını axtarmağı özümə borc bilirəm. Təlim- tərbiyə ilə yerli əhalinin xasiyyətini yumşaltmaq, onların gedəcəyi yolları göstərməklə çoxlu fayda əldə etmək olar. Bu dövrdə həmçinin yerli əhali arasında təhsilə, rus dilini öyrənməyə tədricən meyil və həvəs oyanırdı."*



Tiflis hərbi qubernatoru, general-adyutant Sipyagin 1827-ci ildə Cənubi Qafqazın bir sıra şəhərlərində, o cümlədən, Nuxada (Şəkidə), Qazax distansiyasında, Şamaxı, Şuşa, Bakı və Qubada qəza məktəbləri açmaq fikrini irəli sürmüşdü.

Zaqafqaziya məktəblərinin ilk nizamnaməsinə görə, Cənubi Qafqazın Gəncə, Şuşa, Nuxa (Şəki), Şamaxı, Quba, Bakı, Naxçıvan Ordubad, İrəvan şəhərlərində, Qazax distansiyasında və digər bölgələrdə 20 qəza məktəbi açılmalı idi.

Azərbaycan ərazisində ilk qəza məktəbi 1830-cu il dekabrın 30-da ***Şuşa şəhərində*** 19 şagirdlə fəaliyyətə başladı. Sonrakı illərdə Nuxada (1831), Bakıda (1832), Gəncədə (1833), Şamaxı (1837), Naxçıvanda (1837) qəza məktəbləri açıldı.

Bu məktəblərdə yerli dillərin, həmçinin kənd təsərrüfatı kursunun tədrisi və bağçılıq peşəsinin öyrədilməsi zəruri hesab edilirdi. Məktəblərin hər birinə 2 müəllimin təyin edilməsi, bunlardan baş müəllimə ildə gümüş pulla 300 manat, kiçik müəllimə isə 250 manat maaş təyin edilməsi məsləhət görülürdü.

Rusiya Xalq maarif naziri Sişkov 1825-ci ilin aprelində general Yermolova göndərdiyi xüsusi məktubunda onu əmin edirdi ki, maarif və məktəb vasitəsilə yerli əhalidə Rusiyaya rəğbət oyatmaq üçün ondan asılı olan hər şeyi edəcəkdir. O, həmçinin Yermolovun məktəb üçün pul vəsaiti tələbini ödəməyi öhdəsinə götürürdü.

İrəvanda ikisinifli ***qəza məktəbi*** 14 yanvar 1832 -ci ildə açıldı[1]. Bəzi tədqiqatlarda[2] qəza məktəbinin 11 yanvar 1931-ci ildə açıldığı bildirilir. Məktəbin ilk müdiri Moskva Universitetinin məzunu ***F.Zuboev*** olmuşdur. Qəza məktəblərinin məqsədi yerlərdə ibtidai təhsili və rus dilini yaymaq, uşaqları dövlət xidmətinə hazırlamaq idi. İki sinifdən ibarət olan qəza məktəblərinin tədris planına ilahiyyat, qiraət, hüsnxət, hesab, rus dili və yerli dillər (Azərbaycan və erməni dilləri) daxil idi. Məktəb üçün illik maliyyə xərci 3800 rubl nəzərdə tutulmuşdu. Həmin vəsaitin 2850 rublu müəllimlərin əməkhaqqı, 150 rublu məktəbin kitabxanası, 50 rublu müəllimlərin mükafatlandırılması, 750 rublu məktəbin digər xərcləri üçün nəzərdə tutulmuşdu.



8 fevral 1834-cü ilin məlumatına görə, qəza məktəbində 37 şagird təhsil alırdı[3]. İrəvan qəza məktəbinin direktoru F.Zuboevin verdiyi məlumata görə 1836-cı ildə İrəvan şəhərindəki qəza məktəbində[4] 60 şagird təhsil alırdı. Bundan başqa şəhərdə Eçmiədzindən köçürülmüş 1 erməni və 8 tatar (Azərbaycan -R.F.) məktəbi fəaliyyət göstərirdi. Şagirdlər sosial vəziyyətlərinə uyğun olaraq 20 qəpikdən 1 rubla (gümüş pulla) kimi ödəniş edirdilər.

İrəvan qəza məktəbində 1844-cü ildə Azərbaycan dili fənninin tədrisinə ayrılan saatlar I sinifdə 2 saat, II sinifdə 1 saat artırıldı. Həmin dövrdə qəza məktəbində Azərbaycan dili və şəriət fənlərini *Mirzə Molla Tağı Mahmud oğlu* tədris edirdi[5].

---

[1]**Məmmədov İ.** İrəvan dəftəri. Bakı:Adiloğlu, 2002,s.97

[2]**Əmrahov Z.** İrəvan quberniyasının tarixi (1850-1917). Bakı:Nurlar, 2022, s.137

[3] Yenə orada,s.140

[4] Həmin dövrdə İrəvan quberniyasında üç qəza məktəbi (İrəvan, Naxçıvan, Aleksandropol) fəaliyyət göstərirdi.

[5]1856-cı ildə **Mirzə Molla Tağı Mahmud oğlu** vəfat etdikdən sonra onun yerinə həmin ilin noyabr ayında **Mirzə Molla Ələkbər oğlu Elxanov** Azərbaycan dili və şəriət müəllimi təyin olunmuşdur.

Bir neçə ildən sonra heç bir səbəb göstərilmədən yerli dillər (Azərbaycan və erməni dilləri) tədris planından çıxarıldı. Bununla bağlı İrəvan qəza məktəbinin müfəttişi X.Abovyan tədris dairəsinin popeçitelinə məktub yazaraq öz etirazını bildirir, ana dilinin nə qədər vacib olduğunu əsaslandırırdı. Məktubda yazırdı:"*yerli dillər birinci sinifdə keçilən fənlər sırasına tamamilə daxil edilməmişdir. Bu da istər tatarlar (azərbaycanlılar-F.R.), istərsə də ermənilər arasında az narazılıq törətmir, həftədə bir dəfə uşaqlara rus dilində dua oxumaq öyrədilir. Bu, tatar (Azərbaycan-F.R.) uşaqlarının nəyinə gərəkdir? Bunun əvəzində bir neçə saat da başqa fənlərdən ixtisar edib imkan yaratmaq lazımdır ki, tatar (Azərbaycan-F.R.) uşaqlarına ana dilində hər gün heç olmasa, bir saat dərs keçilsin. Onlara mane olan əngəlləri yalnız bu yolla aradan qaldırmaq olar*".[1]

Qeyd edək ki, həmin dövrdə İrəvana köçürülən ermənilər yerli əhali ilə qaynayıb-qarışmaq üçün Azərbaycan dilinin öyrənilməsinə böyük maraq göstərirdilər. X.Abovyan bu xüsusda yazırdı:"*Tatar (Azərbaycan-F.R.) dili bizdə elə geniş yayılıb ki, onu hətta qadınlar və uşaqlar da başa düşür. Ona görə də xalq arasında hər birinin tatar (Azərbaycan - F.R.) dilində şeirlərin yaradılması və oxunması adi hala çevrilib... Kim bilmir ki, insanın qəlbi qaralanda, heç bir qılınc, heç bir dərman, yuxu – söz, xüsusən də oxşama, aşıq havası və bayatı kimi təsir etmir*".



Yuxarıda da qeyd etdiyimiz kimi, qəza məktəbinin illik xərci 3800 rubl idi. Bu vəsaiti xəzinə (dövlət) ödəyirdi. İkisinifli qəza məktəblərinin hər birində iki müəllim işləyirdi. Bunlardan biri Zaqafqaziya məktəbləri direktorunun təyinatı ilə göndərilirdi, o, həm də məktəbin nəzarətçisi (müdiri) vəzifəsini yerinə yetirirdi. Digəri isə ilahiyyatı və yerli dili tədris edirdi. İrəvan qəza məktəbində isə ilahiyyatı və yerli dilləri (Azərbaycan və erməni dili) 2 müəllim tədris edirdi.

İrəvan qəza məktəbi 1839-cu ildə üçsinifli qəza məktəbinə çevrildi. Məktəbin müəllim heyətinin tərkibi 5 nəfər təsdiq edildi. Həmin müəllimlərdən biri rus dili, coğrafiya və tarix, ikincisi hesab, hüsnxət, rəsm və rəsmxət, üçüncüsü isə birinci sinifdə oxu və yazı, hesabdan ilk dörd əməli öyrətməli, iki müəllim isə ilahiyyatı və yerli dilləri tədris etməli idi.

[1] Bax:**Məmmədov İ.** İrəvan dəftəri. Bakı:Adiloğlu, 2002, s.97

1867-ci ildə Qafqaz və Zaqafqaziya məktəblərinin yeni nizamnaməsi qəbul edildi. Bu nizamnamə ilə qəza məktəbləri yenidən təşkil edildi. Üç əsas sinifdən əlavə hazırlıq sinifləri açıldı. İlk dəfə olaraq təhsil haqqı tətbiq olundu. Tədris planına yeni fənlər, latın və Avropa dilləri daxil edildi.

İrəvan qəza məktəbinin statusunun genişləndirilməsi ildən-ilə orada oxuyan azərbaycanlıların sayının artmasına səbəb oldu.

İrəvan progimnaziyasının hazırlıq sinfinin müəllimi S.P.Zelinskinin hesablamalarına[1] görə 1850-1869-cu illərdə həmin təhsil müəssisəsində təhsil alanların milli tərkibi və sayı aşağıdakı kimi olmuşdur.

***İrəvan üçsinifli qəza məktəbində oxuyanların sayı***

| **İllər** | **rus** | **erməni** | **tatar (Azərb.)** | **Digərləri** | **Cəmi** |
|---|---|---|---|---|---|
| 1850 | 9 | 72 | 15 | - | 96 |
| 1851 | 9 | 111 | 16 | - | 136 |
| 1852 | 6 | 127 | 20 | - | 153 |
| 1853 | 5 | 124 | 14 | - | 143 |
| 1854 | 5 | 102 | 8 | - | 116 |
| 1855 | 8 | 99 | 8 | - | 115 |
| 1856 | 7 | 60 | 10 | - | 77 |
| 1857 | 8 | 75 | 9 | - | 92 |
| 1858 | 8 | 83 | 6 | - | 97 |
| 1859 | 6 | 81 | 5 | - | 92 |
| 1860 | 9 | 97 | 18 | - | 124 |
| 1861 | 20 | 129 | 22 | - | 171 |
| 1862 | 9 | 118 | 24 | - | 151 |
| 1863 | 8 | 145 | 28 | - | 181 |
| 1864 | 7 | 174 | 30 | - | 211 |
| 1865 | 7 | 142 | 27 | - | 176 |
| 1866 | 10 | 131 | 22 | - | 163 |
| 1867 | 12 | 129 | 20 | - | 161 |
| 1868 | 16 | 134 | 17 | 7 | 174 |



[1] **Зеленский С.** Город Эривань.Сборник материалов для описания местностей и племен Кавказа.Выпуск 1-й.Тифлис.1881, отд . 1,с.48

1850-1869-cu illərdə qəza məktəbində 2623 nəfər təhsil almışdır ki, onlardan da 317 (12%) nəfərini azərbaycanlılar təşkil etmişdir.

1869-cu ildə üçsinifli qəza məktəbi 4 sinifli progimnaziyaya çevrildi[1]. Progimnaziyanın nəzdində 20 nəfərin yaşaması və təhsil-tərbiyə alması üçün pansion təşkil edildi. Həmin dövrdə progimnaziyanın öz binası olmadığından 420 rubla kirayə bina tutulmuşdu.

İrəvan kişi progimnaziyasının fəaliyyəti Rusiya Xalq Maarif Nazirliyi tərəfindən 19 noyabr 1864-cü ildə təsdiq edilmiş *"Gimnaziya və progimnaziyaların əsasnaməsi"*nə uyğun tənzimlənirdi. 1870-ci ildə İrəvan şəhər cəmiyyəti progimnaziyaya ildə 700 rubl ayırmaq qərarına gəldi. 1873-cü ildən verilən həmin vəsaitin məbləğinə uyğun olaraq progimnaziyada ikinci hazırlıq sinfi açıldı və 1879-cu ilə kimi fəaliyyət göstərdi.

S.P.Zelinskinin hesablamalarına[2] görə 1869-1879-cu illərdə progimnaziyada təhsil alanların milli tərkibi və sayı aşağıdakı kimi olmuşdur.



***İrəvan kişi progimnaziyasında oxuyanların sayı və milli tərkibi (1869-1879-cu illər)***

| İllər | rus | erməni | Azərb. | digərləri | cəmi |
|---|---|---|---|---|---|
| 1869 | 17 | 120 | 12 | 7 | 156 |
| 1870 | 24 | 131 | 21 | 4 | 180 |
| 1871 | 23 | 148 | 24 | 4 | 199 |
| 1872 | 33 | 160 | 26 | 5 | 224 |
| 1873 | 31 | 220 | 27 | 8 | 286 |
| 1874 | 22 | 268 | 26 | 12 | 328 |
| 1875 | 17 | 270 | 27 | 6 | 320 |
| 1876 | 17 | 238 | 30 | 10 | 295 |
| 1877 | 22 | 201 | 14 | 10 | 247 |
| 1878 | 22 | 156 | 14 | 10 | 202 |
| 1879 | 18 | 138 | 17 | 11 | 184 |

[1] Ermənistan DTA .f.1.siy.1,iş311, v.1

[2] **Зеленский С.** Город Эривань. Сборник материалов для описания местностей и племен Кавказа. Выпуск 1-й.Тифлис.1881, отд.1,с.48

Deməli, İrəvan progimnaziyasında 1869-1879-cu illərdə 2621 nəfər təhsil almşdır ki, ondan da 238 (9%) nəfərini azərbaycanlılar təşkil etmişdir.

31 mart 1881-ci ildə isə *İrəvan kişi progimnaziyası* 8 sinifli ***İrəvan kişi gimnaziyasına*** çevrildi[1]. İrəvan kişi gimnaziyasının fəaliyyəti Rusiya Xalq Maarif Nazirliyi tərəfindən 19 noyabr 1864-cü ildə təsdiq edilmiş *"Gimnaziya və progimnaziyaların əsasnaməsi"* ilə tənzimlənirdi[2].

1882-ci ildə gimnaziyada 1 hazırlıq və 6 əsas sinif fəaliyyət göstərirdi.

1883-cü ilin yanvarın 1-də gimnaziyada 231 nəfər təhsil alırdı ki, onlardan da 37 nəfəri azərbaycanlı idi[3]. 1885-ci ildə gimnaziyanın 6 nəfərdən ibarət ilk buraxılışı olub. Məzunlardan 2-si Rusiya ali məktəblərinin riyaziyyat, 2-si tibb, 2-si hüquq ixtisaslarına qəbul olunmuşdur[4].





*İrəvan kişi gimnaziyasının binası*

[1] Gimnaziya 1921-ci ilin dekabr ayında vahid əmək məktəbinə, 1925-ci ildə isə X.Abovyan adına orta məktəbə çevrilib.

[2] Bax**: Rüstəmov F.A.** Pedaqogika tarixi. Dərslik. Bakı:Elm və təhsil, 2010, s.487

[3] Ermənistan DTA .f.1.siy.1,iş.311, v.1

[4] Ermənistan DTA .f.1.siy.1,iş373

"Qafqaz kalendarı"nda verilən məlumata görə, 1883-cü ildə gimnaziyanın direktoru V.O.Brajnikov, tatar (Azərbaycan-F.R.) dili müəllimi isə ***Mirzə Ələkbər Elxanov*** olmuşdur.

1892-ci ilin yanvarın 1-nə olan məlumata görə, İrəvan kişi gimnaziyasında 245 nəfər təhsil alırdı ki, onlardan da 46-sı hazırlıq, 48-i birinci, 44-ü ikinci, 19-u üçüncü, 25-i dördüncü, 20-si beş və altıncı, 12-si 7-ci, 11-i 8-ci sinifdə oxuyurdu[1].

İldən-ilə gimnaziyada oxuyan azərbaycanlıların sayı artırdı. Belə ki, 1902-ci ildə İrəvan kişi gimnaziyasında oxuyan 376 nəfər şagirdin 194-ü erməni, 92-si rus, 61-i tatar (azərbaycanlı-F.R.), 2-si yəhudi, 13 -ü digər millətin övladları idi[2]. 1908/09-cu tədris ilində gimnaziyada təhsil alanların sayı 568 nəfərə yüksəlsə də, azərbaycanlıların sayı 1902-ci ildə olduğu kimi 61 nəfər qalmışdı.[3] 1910-cu ildə gimnaziyada təhsil alan 590 nəfərdən 128-i[4], 1 yanvar 1916-cı ildə 727 nəfərdən 141-i azərbaycanlı[5] olmuşdur.



*İrəvan gimnaziyasının müəllim və şagirdlərindən bir qrupu*



[1] **Bax:Məhərrəmov Z.** İrəvanda məktəbdarlıq və maarifçilik (1800-1920-ci illərdə ədəbi-mədəni mühit).Bakı:Nurlan,2010, s.40

[2] Кавказский календарь на 1904 год.Тифлись, 1903. Отд.3-й,с.78

[3] Кавказский календарь на 1910 год.Тифлись, Ч I, 1909. Отд. 4, с.595

[4] Кавказский календарь на 1912 год.Тифлись, Ч I, 1911. Отд.4, с.312-313

[5] Кавказский календарь на 1917 год.Тифлись, 1916, s.283-284

Ümumiyyətlə, 1881-1916-cı illərdə gimnaziyanı 582 nəfər azərbaycanlı bitirmişdir.

1914-cü ilin məlumatına görə, gimnaziyanın direktoru Y.A.Çoqoşvili, tatar (Azərbaycan- F.R.) dili müəllimi isə ***Şeyx Əbusəttar Kazımov*** olmuşdur.

Qeyd edək ki, gimnaziyada 1836-1856-cı illərdə *Molla Tağı Mahmud oğlu*, 1856-1885-ci illərdə *Mirzə Ələkbər Elxanov*, 1885-1895-ci illərdə *Firidun bəy Köçərli*, 1895-1905-ci illərdə *İsmayıl bəy Şəfibəyov*, 1905-1906-cı illərdə *Mirzə Məhəmməd Şeyxzadə*, 1907-1918-ci illərdə *Şeyx Əbusəttar Kazımov* şəriət və tatar (Azərbaycan -F.R.) dili fənlərini tədris ediblər.

XX əsrin əvvəllərində Qafqazda cəmi 23 gimnaziya fəaliyyət göstərirdi ki, onlardan da 3-ü Bakıda, 5-i Tiflisdə, 1-i Yelizavetpolda (Gəncədə-F.R.), 1-i isə İrəvanda idi. Həmin dövrdə azərbaycanlı şagirdlərin sayına görə Yelizavetpol (Gəncə - F.R.) və İrəvan kişi gimnaziyaları daha çox fərqlənirdi. Belə ki, Yelizavetpol (Gəncə-F.R.) kişi gimnaziyasında 1912-ci ildə 149, İrəvan kişi gimnaziyasında 123 azərbaycanlı oxuduğu halda, 1-ci Bakı gimnaziyasında 50, 2-ci Bakı gimnaziyasında 49, 3-cü Bakı gimnaziyasında cəmi 14 azərbaycanlı oğlan oxuyurdu.



"Qafqaz kalendarı"nın 1913-cü ilə aid sayında Rusiya Maarif Nazirliyinin Qafqaz Tədris Dairəsinin popeçitelinin hesabatına istinadən 1911-ci ildə şagirdlərin sayı və milli tərkibi ilə bağlı verdiyi statistikanı olduğu kimi verməyi məqsədəmüvafiq sayıram.

***1911-ci ildə Qafqazda azərbaycanlıların təhsil aldığı gimnaziyalar***

| **Gimnaziyalar** | **cəmi** | **rus** | **gürcü** | **erməni** | **Azərb.** | **digər** |
|---|---|---|---|---|---|---|
| 1-ci Bakı | 728 | 187 | 30 | 325 | 50 | 136 |
| 2-ci Bakı | 491 | 146 | 20 | 191 | 49 | 85 |
| 3-cü Bakı | 425 | 96 | 14 | 225 | 14 | 76 |
| Batumi | 431 | 131 | 135 | 59 | 3 | 103 |

| | | | | | | |
|---|---|---|---|---|---|---|
| Vladiqafqaz | 613 | 320 | 39 | 56 | 6 | 192 |
| 1-ci Yekaterinodar | 506 | 403 | 5 | 46 | 3 | 49 |
| Yelizavetpol | 600 | 129 | 10 | 286 | 149 | 26 |
| Kutaisi | 673 | 110 | 494 | 30 | 5 | 34 |
| Petrovski | 273 | 148 | 16 | 19 | 17 | 73 |
| 1-ci Tiflis | 862 | 226 | 250 | 218 | 72 | 96 |
| 2-ci Tiflis | 726 | 309 | 153 | 158 | 7 | 99 |
| 3-cü Tiflis | 644 | 55 | 62 | 443 | 13 | 71 |
| 4-cü Tiflis | 372 | 81 | 69 | 138 | 8 | 76 |
| 5-ci Tiflis | 409 | 86 | 77 | 192 | 10 | 44 |
| İrəvan | 624 | 106 | 21 | 340 | 123 | 34 |


F.B.Köçərli

Görkəmli Azərbaycan maarifçisi F.B. Köçərlinin[1] pedaqoji fəaliyyətinin mühüm bir hissəsi bu gimnaziya ilə bağlı olmuşdur. O, 1885-1895-ci illərdə İrəvan gimnaziyasında Azərbaycan dili müəllimi işləyib, hətta bir müddət həm də şəriət dərslərini keçib. 1887-ci ilin noyabr ayının 6-da pansion mürəbbisinin köməkçisi vəzifəsinə təyin olunub. "Əla və həvəslə" dərs dediyinə görə dəfələrlə mükafata layiq görülüb. Pedaqoji fəaliyyətinə görə ona "titulyar sovetnik", "statski sovetnik" "kollejiski sekretari" rütbələri verilib, qızıl medalla təltif edilib.1894-cü ildə "Əla xidmətinə görə" III dərəcəli Stanislav ordeni ilə təltif olunub. F.B.Köçərli kişi gimnaziyasında müəllim işlədiyi illərdə İrəvanda maarifin və maarifçiliyin inkişafında mühüm rol oynamış, təlim-tərbiyə məsələləri ilə bərabər ictimai-ədəbi, elmi-pedaqoji fikrin inkişafı sahəsində böyük xidmətlər göstərmişdir. O, İrəvanda yaşayarkən "Təlimi-lisani-türk" dərsliyini tərtib etmiş, A.S.Puşkinin "Torçu və balıq" əsərini Azərbaycan dilinə tərcümə

[1] **Rüstəmov F.** Firidun bəy Köçərli müəllim kadrları hazırlığı haqqında //"Kaspi" qəzeti, 26 noyabr 2014-cü il

etmiş,"İrəvandan məktub" adlı məqalələr yazmış,"Təlimati-Sokrat" əsərini nəşr etdirmişdir.

İrəvan şəhərində yeni üsullu ***ana dilli*** məktəblərin meydana gəlməsi də həmin dövrə təsadüf edir. Seyid Əzim Şirvaninin Şamaxıda, Məhəmməd Tağı Sidqinin Naxçıvanda və Ordubadda, Mirzə İsmayıl Qasirin Lənkəranda, Mir Möhsün Nəvvabın Şuşada açdığı ana dilli məktəblərin təsiri ilə İrəvan şəhərində də ana dilli məktəblər yaradıldı.

B.A.Baqdasaryanın yazdığına görə, XIX əsrin sonu, XX əsrin əvvəllərində yalnız İrəvan şəhərində müsəlmanlara (azərbaycanlılara-F.R.) məxsus 30-dan çox təhsil müəssisəsi fəaliyyət göstərirdi[1].

İrəvanlı ziyalılar yeni məktəbləri maarifçiliyin milli şüur təliminin müqəddəs idealı hesab edirdilər. Onlar dərk edirdilər ki, orta əsrlərdə Azərbaycanda elmin, mədəniyyətin, maarifin inkişafında çox böyük tarixi rol oynamış məktəb və mədrəsələr yeni maarifçiliyin ideya və təşkilati mərkəzi, hərəkat və fəaliyyət orqanı ola bilməz. Yeni maarifçilik hərəkatının qarşısında onu dəyişmək, yeni dövr məktəbinə çevirmək dururdu.



***Məşədi İsmayıl Hacı Kazımzadə*** (1845-1888) və ***Mirzə Kazım Əsgərzadə*** (1832-1893) 1882-ci ildə, ***Mirzə Həsən Rüşdiyyə*** (1851-1944) 1883-cü ildə Təbrizdən İrəvana gələrək orada ***yeni üsullu*** məktəblər açdılar.



*M.H.Rüşdiyyə*

M.H.Rüşdiyyənin məktəbi 1888-ci ilə kimi fəaliyyət göstərmişdir. O, Təbrizə qayıtdıqdan sonra burda 1888-ci ildə "Mədrəsə-Rüşdiyyə, 1893-cü ildə isə "Rüşdiyyeye müzəffəriyyə" adlı məktəb açmışdır.

1882-ci il martın 28-də Məşədi İsmayıl Hacı Kazımzadənin və Mirzə Kazım Əsgərzadənin açdıqları məktəbə ilk tədris ilində 14 nəfər şagird qəbul edilmişdi ki, onlardan da 12-si azərbaycanlı, 2-si erməni idi. Məktəbdə ana dili və şəriət fənləri ilə bərabər dünyəvi fənlər də öyrədilirdi.

[1] Армения. Российская Педагогическая Энциклопедия. Москва: Боль шая Российская Энциклопедия.1993, с.49

Cənubi Azərbaycandan İrəvana gələrək burada yeni tədris metodlarını öyrənənlərin içərisində M.H.Rüşdiyyənin böyük qardaşı ***Axund Mirzə Əli*** də olmuşdur.

İrəvanda məktəb yaratmaq sahəsində qazanılan təcrübə ziyalıların yeni məktəb yaratmasına təkan verdi.

1880-ci ildə İrəvanda yeni bir ibtidai məktəb açıldı. Məktəbdə 60 şagird təhsil alırdı. Məktəbdə ana dili və şəriət fənnini *Ələsgər Hacı Məmmədəli oğlu* tədris edirdi.

1881-ci ildə Uluxanlıda dünyəvi təhsil verən məktəb açıldı. ***Allahverdi Hacı Hüseyn oğlunun*** mülkündə açılan bu məktəbin ilk müdiri o zamanın tanınmış maarifçisi ***Muxin*** olmuşdur. 1899-cu ildə ikisinifli məktəbdə 35 şagird oxuyurdu. Məktəbin nəzarətçisi *Məmməd bəy Lütvəli bəy oğlu Qazıyev*, şəriət müəllimi *Molla Axund Hacı Məşədi Hüseyn* idi[1].



*Abbasqulu xan İrəvanski*

İrəvan maarifçilərinin və 104 nəfər şəhər sakininin tələbi, təklifi və vəsaiti hesabına İrəvanda ***rus-tatar*** (Azərbaycan - F.R.)[2] ikisinifli oğlan məktəbinin açılması məqsədilə xüsusi komissiya yaradılmışdı. Komissiya üzvləri dövlət tərəfindən belə bir məktəbin açılması təşəbbüsü ilə çıxış etsələr də, istəklərinə nail ola bilmədilər. Ona görə də komissiya üzvlərinin təklifi ilə şəhər sakinlərdən yığılan pul vəsaiti ilə məktəb açmaq qərarına gəlindi.

14 nəfərlik komissiyanın tərkibinə *Abbasqulu xan İrəvanski* (sədr), İrəvan gimnaziyasının Azərbaycan dili müəl-

[1] Кавказский календарь ... - Тифлис : Гл. упр. Кавказ. Наместника 1845-1916. на 1899 год: 54-й год / под ред. стат. советника **Е. Кондратенко** . – 1898, с.321

[2] XIX əsrin sonu -XX əsrin əvvəllərində Qafqaz azərbaycanlıları arasında geniş yayılmış məktəblər. Daha çox rus-müsəlman məktəbi adı ilə tanınır. Əsası 1887-ci ildə Bakıda ***Həbib bəy Mahmudbəyov*** *və* ***Sultanməcid Qənizadə*** tərəfindən qoyulmuşdur. Xüsusi şəkildə açılmış ilk rus-Azərbaycan məktəbi dörd il şagirdlərdən toplanmış təhsil haqqı hesabına fəaliyyət göstərmişdir. Sonralar bu tip məktəblər Azərbaycanda dövlət vəsaiti hesabına fəaliyyət göstərmişdir.

limi *İsmayıl bəy Şəfibəyov*, İrəvan Müəllimlər Seminariyasının Azərbaycan dili müəllimi *Rəhim Xəlilov*, *Eynulla Sultanov* (katib) və b. daxil edildi.

Eynulla Sultanovun tərtib etdiyi siyahıya görə, yeni məktəbin açılması üçün Abbasqulu xan İrəvanski 50 rubl, Pənah xan Makinski 50 rubl, 17 nəfərin hər biri 25 rubl, 31 nəfərin hər biri 15 rubl, 51 nəfərin hər biri 10 rubl. vermişdi. Məktəbin açılışı 21 oktyabr 1896-cı ildə baş tutdu. İlk tədris ilində məktəbə nəzərdə tutulan 70 şagird əvəzinə 110 şagird qəbul edildi. Göy məsciddə çağırılmış toplantıda ***Haşım bəy Nərimanbəyov*** həmin məktəbin müdiri təyin edildi.


*Haşım bəy Nərimanbəyov*

1900-cü ildə məktəbin 1-ci sinfində 54 şagird oxuyurdu. Məktəbin tədris planına Azərbaycan, rus, fars, ərəb dilləri, şəriət və hesab daxil idi. Ana dili səs üsulu ilə A.O.Çernyayevskinin "Vətən dili", fars dili Sədi Şirazinin "Gülüstan", rus dili M.Volperin "Rus dili", hesab Yevtuşevskinin "Məsələlər kitabı", şəriət dərsləri isə Firudin bəy Köçərlinin tərtib etdiyi mətnlər üzrə tədris edilirdi. İrəvan ziyalıları məktəbə tez-tez ianə edirdilər. Teatr həvəskarları tamaşalardan toplanan vəsaiti rus-tatar (Azərbaycan- F.R.) məktəbinin nəfinə verirdilər. İrəvan quberniya məscidi də məktəbə maddi yardım edirdi.



Şagirdlərin sayı ildən-ilə artırdı. 27 noyabr 1915-ci ildə məktəbin müdiri Haşım bəy Nərimanbəyov yazırdı:*"Bu il yer olmadığından 27 şagirdi məktəbə qəbul edə bilmədik"*.[1]

1899-cu ildə Haşım bəy Nərimanbəyovun təşəbbüsü ilə məktəbin nəzdində yaşlı müsəlmanlar üçün ***axşam kursları*** açılmışdır. Orada rus dili, hesabdan dörd əməl və ana dili öyrədilirdi. Rus dili və hesab fənnini Haşım bəy Nərimanbəyovun özü, ana dili fənnini ***Mirzə Məmmədvəli Qəmərlinski*** tədris edirdi. İrəvana gələn Müzəffərəddin şah Qacar rus-tatar (Azərbaycan-F.R.) məktəbində olmuş və onun şagirdlərinə 300 manat ianə vermişdi.

1906-cı ilin məlumatına görə, rus-tatar (Azərbaycan-F.R.) məktəbinin himayəçisi Abbasqulu xan İrəvanski, müdiri Haşım bəy

[1] Ermənistan DTA.f.19,siy.1,iş.823, v.121

Nərimanbəyov, müəllimləri Həmid bəy Şahtaxtinski, Mustafa Rəcəbov, şəriət müəllimləri Məmməd Qazıyev və Mirzə Məmmədvəli Qəmərlinski idi[1].

1914-cü ildə məktəbin müdiri Haşım bəy Nərimanbəyov, müəllimləri isə Yevsyukov, Məmmədvəli Qəmərlinski, Vasilyev, şəriət müəllimi Axund Abdulla Qazıyev olmuşdur[2].

1902-ci ildə İrəvanda *rus-tatar* (Azərbaycan- F.R.) *oğlanlar məktəbinin* təcrübəsi əsasında *rus-tatar* (Azərbaycan -F.R.) *qızlar məktəbi* açılmışdı.

İrəvan quberniya xalq məktəbləri direktoru şəhər rəisinə göndərdiyi məktubda rus-tatar (Azərbaycan- F.R.) qız məktəbi ilə bağlı yazırdı:*"**Rus-tatar (Azərbaycan- F.R.) qızlar məktəbi nadir tədris ocağıdır.** Qafqazda müsəlman qızlarının oxuduğu 3 ibtidai məktəb var. Bu məktəbə Bakı şəhərindəki məktəbin nümunəsində rus-tatar adı verilib.Tatar uşaqları təkcə tatar dilində deyil, həm də rus dilində təhsil alırlar."*

İrəvan şəhər rəisinə yazılan məktubun əsas məqsədi oğlan və qız məktəblərinin saxlanılması üçün nəzərdə tutulan vəsaitin artırılması ilə bağlı idi. İrəvan quberniya xalq məktəbləri direktoru məktubunda rus-Azərbaycan qız məktəbi üçün 620 rublun, rus-Azərbaycan oğlan məktəbi üçün isə məktəbə əvvəllər verildiyi qədər vəsaitin verilməsini xahiş etmişdir. Məktubda 1905-ci ildə rus-Azərbaycan oğlan məktəbi üçün ayrılan 200 rublun çox az olduğu, buna görə də müəllimlərin bir neçə ay əməkhaqqı ala bilmədikləri bildirilirdi.



Prof.E.Məmmədov "İrəvandan başlanan yol"[3] kitabında ikisinifli rus-tatar (Azərbaycan-F.R.) qızlar məktəbinin onun babası İrəvan quberniya ruhani məclisinin sədri, Axund Məmmədbağır Qazızadənin təşəbbüsü ilə açıldığını və onun öz evində yerləşdirildiyini bildirir.

Məktəbin himayəçisi knyagina ***Yelena Çaqodaeva*** (İrəvan quberniyasının vitse-qubernatoru knyaz Aleksey Çaqodayevin arvadı),

---

[1]Памятная книжка Эриванской губернии на 1906 года./под ред. **А.И.Марченко.-** Эриван: Изд. Эриван. губ. стат. ком., 1905.с.57

[2] Памятная книжка Эриванской губернии на 1914 год / Под ред. **К.А.Водчанина.** Эривань: Изд. Эриван. губерн. стат. ком-та, 1914. с59

[3] **Məmmədov E.** İrəvandan başlanan yol. Şeyx Məmmədbağır İrəvani və onun törəmələri.Bakı:2018,s.43



*Sağdan: Axund Məmmədbağır Qazızadə, nəvəsi İsmayıl Qazızadə, həyat yoldaşı Şəhrubani xanım, İrəvan quberniyasının vitse-qubernatoru knyaz Aleksey Çaqodayev, Yelena Çaqodayeva, Antonina Valeriyanovna Kalinina, Yevgeniya Georgiyevna Pxadze, Məmmədvəli Qəmərlinski, Mirzə Cabbar Məmmədzadə, İbadulla bəy Muğanlinski və b. (İrəvan 1902)*



müdiri ***Antonina Kalinina,*** rus dili və hesab müəllimi ***Yevgeniya Georgiyevna Pxakadze,*** Azərbaycan dili və şəriət müəllimi ***Məmmədəli Qəmərlinski*** olmuşdur.

***

1900-cü ilin 30 oktyabrında İrəvan şəhər ibtidai məktəbi ***Puşkin adına üçsinifli məktəbə*** çevrildi. 1901-ci ildə məktəbdə azərbaycanlı uşaqlara şəriət dərsi keçmək üçün ilahiyyat müəllimi dəvət edildi[1].

Məktəbi hər il 8-10 nəfər azərbaycanlı bitirib. Arxiv sənədlərindən aydın olur ki, məktəbi 1915-ci ildə Nağı Abbasov, Əsəd Bağırov, Saleh Güllücinski, Hüseyn Nabatəliyev, Həsən Səmədov,1916-cı ildə Kərim Əhmədov, Əli Cəfərov, Yaqub Cümşüdov, İsmayıl İbrahimov, Fərəməz Muğanlinski, Əsgər Süleymanov bitirmişdir[2].

Məktəbin nəzdində bazar günü məktəbi açılmışdı. Məşğələlər bazar günü saat 11-dən 3-ə kimi davam edirdi. 15-20 yaşlı oğlanlar ilahiyyat, rus dili, riyaziyyat, rəsmxət və yerli dilləri (Azərbaycan, erməni) öyrənirdi.

1901-ci ildə bazar günü məktəbində 80 müdavim oxuyurdu ki, onlardan da 45 nəfərinin 18-30, 25 nəfərinin 30-40, 10 nəfərinin 40-50 yaşı var idi. Müdavimlərin 5-i rus, 47-si erməni, 25-i azərbaycanlı, 1-i gürcü, 2-si aysor idi[3].

[1]Bax:Ermənistan DTA.f.12,iş.14.

[2] Ermənistan DTA.f.19,siy.1, iş122a,v.57, 65, 75,77

[3] Обзор Эриванской губернии за 1901. Эривань: Тип. Эриван. губ. Правления.

## İrəvanda ilk rus-tatar (Azərbaycan) qız məktəbi

Azərbaycanda qadın təhsilinin təşkili ilə bağlı ilk məlumatlara 1836-cı ilə aid rəsmi sənədlərdə rast gəlinir. Həmin mənbədə[1] Bakıda, İçərişəhərdə 2 qadın müəlliminin yanında 25 qızın təhsil aldığı bildirilir. Sonrakı illərdə ayrı-ayrı ziyalı qadınlar tərəfindən Şuşa, Şamaxı, Gəncə və Nuxada (Şəki) qız məktəbləri açılmışdır. Mənbələrdə[2] Məşədi Səkinə, Xırdaxanım və Güllübəyim adlı qadınların açdığı məktəblər haqqında geniş məlumat vardır.

1846-cı ildə Tiflisdə "Müqəddəs Nina"xeyriyyə cəmiyyətinin yaradılması qızların dünyəvi təhsilə cəlb edilməsində mühüm rol oynadı. 1848-ci ilin aprelin 30-da Şamaxıda "Müqəddəs Nina" xeyriyyə cəmiyyətinin qız məktəbi təsis edildi. İlk il məktəbə 16 şagird qəbul edildi.

İki il sonra, 1850-ci ildə İrəvanda Müqəddəs Pipsima qadın məktəbi fəaliyyətə başlayıb. Məktəbin açılmasının təşəbbüskarı Qafqaz qubernatoru M.Vorontsovun həyat yoldaşı Yelizaveta Vorontsova olub. 1953-cü ildə məktəbdə təhsil alan 19 qızdan 3-ü, 1954-cü ildə isə 24 qızdan 5-i, 1857-ci ildə 31 qızdan 8-i, 1858-ci ildə 35 qızdan 7-si azərbaycanlı olub. Məktəbdə tatar (Azərbaycan-F.R.) və şəriət dərslərini *Seyid Molla Mir Mehdi* tədris edib.

1858-ci il mayın 30-da qız məktəblərinin ilk nizamnaməsi təsdiq olundu. İki il sonra "Müqəddəs Nina" qadın xeyriyyə cəmiyyəti imperatriça Mariya Aleksandrovanın himayəsinə keçdi. 1860-cı ildə xeyriyyə cəmiyyətinin yeni nizamnaməsi qəbul edildi. Nizamnamədə cəmiyyətin açdığı məktəblərə bir sıra hüquq və üstünlüklər verildi.

Ripsima ikiillik qadın progimnaziyasında 70-ci illərdə azərbaycanlı qızların sayı azaldı. Belə ki, 1871-1880-ci illərdə həmin məktəbdə cəmi 7 nəfər azərbaycanlı qız təhsil almışdır. Fikrimizcə, azərbaycanlı qızların sayının ildən-ilə azalması İrəvanda müsəlman qızları üçün ayrıca məktəblərin açılması ilə bağlı idi.

İrəvanda azərbaycanlı qızların təhsilə cəlb olunmasında 1877-ci ildə xanım Stasyuleviç tərəfindən açılan Sofiya pansionu mühüm rol



---

[1] **Əhmədov H.** XIX əsr Azərbaycan məktəb tarixi. Bakı: Maarif,1985, s.203

[2] Yenə orada,s.203

oynadı. Pansion şəxsi təhsil müəssisəsi idi. S.Zelenskinin verdiyi məlumata görə, 1877-ci ildə pansionda təhsil alan 105 şagirddən 58 nəfəri azərbaycanlı, 43 nəfəri erməni idi[1]. Pansionda təhsil alanların 55,2 %-nin azərbaycanlı qızlardan ibarət olması və erməniləri üstələməsi o dövr üçün çox yüksək göstəricidir.

Pansiondan fərqli olaraq ibtidai məktəblərdə oxuyan azərbaycanlı qızların sayı o qədər də çox deyildi. 1894-cü ildə İrəvan quberniyasındakı 28 ibtidai məktəbdə 1433 nəfər təhsil alırdı ki, onların da 42 nəfərini azərbaycanlı qızlar təşkil edirdi.

Bakıda ilk müsəlman rus-müsəlman qız məktəbinin açılması məşhur messanat Hacı Zeynalabdin Tağıyevin adı ilə bağlı olduğu kimi, İrəvanda ilk rus-müsəlman məktəbinin açılması ***Məhəmmədqulu bəy Kəngərlinin*** adı ilə bağlıdır .

Ermənistan SSR Xalq təhsili nazirinin müavini vəzifəsində işləmiş, tanınmış tarixçi alim İsrafil Məmmədov Həmidə xanım Məmmədquluzadəyə istinadən bildirir ki, *"köhnə zabit Məmmədqulu bəy Peterburqda Hüquq fakültəsini bitirib, vətənə qayıtdıqdan sonra öz vəsaiti hesabına İrəvanda oğlan və qız leyli[2] məktəbi açmış, qızlara dərs vermək üçün Peterburqdan institut bitirmiş xüsusi müəllim dəvət etmişdi"*[3].





*Kəngərli Məhəmmədqulu bəy Şəfi bəy oğlu*

Mətndə adı çəkilən ***Kəngərli Məhəmmədqulu bəy Şəfi bəy oğlu*** kimdir?

Məhəmmədqulu bəyi əsl "millət və vətən övladı" adlandıran Məmməd Səid Ordubadi onun millət yolundakı fədakarlığını yüksək dəyərləndirərək yazırdı: "Zabitliyi, vəkilliyi ilə bərabər pedaqoq silkinə də girdi. Ömürlərini müəllimlikdə çürüdüb Qafqazın bu qədər böyük şəhərlərində bir müsəlman pansionu aça bilməyən müəllimlərə ən ibrətbəxş bir nümunə, bir müəllim oldu. Pansionunu az vaxtda tərəqqi dərəcəsinin ən üst mər-

[1] **Зеленский С.** Город Эривань.Сборник материалов для описания местностей и племен Кавказа.Выпуск 1-й.Тифлис.1881, отд.1,с.55

[2] Şagirdlərin həm oxuduqları, həm də gecə qaldıqları məktəb; internat.

[3] **Məmmədov İ.** Tariximiz.Torpağımız.Taleyimiz.Bakı:Adiloğlu,2002, s.540

təbəsinə çıxardı. Günlərinin bütün saatlarını gah vəkillikdə, gah məktəb müfəttişliyində, gah millət müşavirliyində keçirərdi".[1]

Kəngərli Məhəmmədqulu bəy Şəfi bəy oğlu 1864-cü ildə Naxçıvanda anadan olub. İlk təhsilini rus ordusunun zabiti olan atasından alıb, sonra Tiflisdə kadet korpusunda oxuyub. Ali təhsilini Peterburqda Mixail Ali Topçuluq Məktəbində alıb. 1884-cü ildə məktəbi bitirib və xidmətə başlayıb. 1893-cü ildə ştabs-kapitan rütbəsi ilə istefaya çıxaraq Naxçıvana qayıdıb. Tiflis Dairə Məhkəməsində ekstern yolu ilə imtahan verərək vəkillik hüququ qazanıb. Fəaliyyətinə İrəvan şəhərində başlayıb.

1901-ci ildə İrəvan quberniya xalq məktəbləri direktorluğu ona müəllim işləməyə icazə verib. İrəvanda ***ilk müsəlman qız leyli məktəbinin*** açılması onun adı ilə bağlıdır. Məktəbdə dərs demək üçün Peterburqdan rus, fransız, alman dillərini bilən ***Nikolay İvanoviç Pivenşteyn*** və ***Luiza Fay*** adında iki ali təhsilli müəllim dəvət etmişdir.

Məhəmmədqulu bəyin açdığı rus-tatar (Azərbaycan-F.R) qız məktəbi qısa bir müddətdə böyük şöhrət tapmışdır. Məhəmməd ağa Şahtaxtlı "Böyük təəssüf və rizaməndi" məqaləsində yazırdı: *"İrəvan quberniyasında müsəlman qızlar üçün tam mükəmməl bir rus və müsəlman məktəbi təsis edən o himmətli millətdust Məhəmmədqulu bəydir ki, bu möhtərəm bəyə məhəbbətimiz daha artıq olur, əgər onu da bilsək ki, qız məktəbindən əlavə müsəlman uşaqlarını gimnaziyaya hazırlamaq üçün Məhəmmədqulu bəyin bir də bir oğlan rus və müsəlman məktəbi var"*[2]

Məmmədqulu bəyin İrəvanda oğlanlar üçün açdığı III dərəcəli ibtidai məktəb şəhər əhalisi tərəfindən rəğbətlə qarşılanmışdır. İrəvan quberniya xalq məktəbləri direksiyasının 1904-cü ilə aid hesabatının Məmmədqulu bəy Kəngərlinin məktəbi ilə bağlı hissəsində[3] bildirilir ki, Məhəmmədqulu bəy Kəngərlinin birsinifli III dərəcəli məktəbi 2 sentyabr 1901- ci ildə Qafqaz Tədris Dairəsinin popeçitelinin verdiyi razılıq məktubu əsasında açılıb. Məktəb

[1] **Ordubadi M.S.** Qanlı illər. Bakı: Qarabağa xalq yardımı komitəsi, 1991, s. 144

[2] **Şahtaxtlı M.** Seçilmiş əsərləri. /Toplayanı, tərtib edəni və müqəddimənin müəllifi akademik İsa Həbibbəyli/. Bakı: Çaşıoğlu, 2006, s. 432

[3] "Отчет ведомости о частном одноклассном III разряда училищ Мамедкули бек Кенгерлинского в г. Эривани за 1904 г.

15 sentyabr 1901-ci ildən fəaliyyət göstərir. İllik büdcəsi 3285 rubl təşkil edir. İlin başlanğıcında siniflər üzrə şagirdlərin sayı aşağıdakı kimi olmuşdur: I sinifdə -4, II sinifdə -4, III sinifdə 6 nəfər şagird. Məktəbdə ilin sonunda 18 şagird olmuşdur ki, bunlardan 17 nəfər pansionda qalır, biri evə gedib gəlir. Hazırlıq sinfində isə 4 nəfər uşaq olmuşdur.[1]



*İrəvan rus-müsəlman qız məktəbi (1902)*
*Soldan: Məmmədqulu bəy Kərim Soltan, Yevgeniya Georgiyevna Pxadze, Məmmədvəli Qəmərlinski, Antonina Valerianovna Kalinina*



AMEA-nın müxbir üzvü Əziz Mirəhmədov da Məhəmmədqulu bəy Kəngərlinin qızlar üçün rus-Azərbaycan məktəbi, oğlanlar üçün *məktəb-pansion* (gimnaziyaya hazırlamaq məqsədilə) açmasını bildirir[2]. Mükəmməl qiraətxanası olan məktəb-pansionda 3 il müddətində 40-a yaxın uşaq təhsil almaq üçün toplanmışdı.

Məktəbdə iki müəllim-tərbiyəçi və bir şəriət müəllimi fəaliyyət göstərirdi:1) İrina Nikolayevna Serebryaçenko (Tiflis gimnaziyasını bitirib, müəllim-tərbiyəçi); 2)Nadejda Timofeyevna Zapon (İrəvan Müqəddəs Ripsima cəmiyyətinin gimnaziyasını bi-

[1] **Rzayev V.** Naxçıvanda məktəb və pedaqoji fikir (XIX əsr və XX əsrin əvvəlləri). Naxçıvan, "Əcəmi" Nəşriyyat-Poliqrafiya Birliyi,2018, s. 261

[2] **Mirəhmədov Ə.** Azərbaycan Molla Nəsrəddini. Bakı: Yazıçı, 1980, s.115

tirib,müəllim-tərbiyəçi); 3)Mirzə Hüseyn Axundov (mədrəsə təhsilli, şəriət müəllimi).

Məhəmmədqulu bəy Kəngərlinin açdığı rus-tatar (Azərbaycan-F.R.) məktəbində ana dili və şəriət fənlərini tədris edən Mirzə Məmmədvəli Qəmərlinski "Şərqi-rus" qəzetinin 1903-cü ilin 14-cü sayında 1902-ci ildə İrəvanda açılan ilk qızlar məktəbindən bəhs edərək yazırdı: *"Bir neçə illərdən bəri şəhərimizdə iqdamat edən Məmmədqulu bəy Kərim Soltani cənabları zükur (oğlan) məktəbi açıb, hər il beş-on müsəlman uşağı gimnaziyaya verməkdən başqa bir xüsusi qız məktəbi dəxi təsis etmişdi ki, milyonlar ocağı Bakıdan savayı Qafqaz və Azərbaycanın heç bir yerində belə xeyirli və lazımlı işə əqdəm olunmayıbdır. Hansı ki, bu saatdə 18 nəfər müsəlman qız uşağı məktəbdə öz dilində oxuyub yazmaq və ehkami dinyəsini öyrənməkdən əlavə rusca dəxi kəmali-intizam və tərəqqi ilə təhsil etməkdədirlər"*[1] .

Məhəmmədqulu bəy Kəngərlinin həyat və fəaliyyətini araşdıran M.Mərdanov və Ə.Tahirzadə həmin məktəb haqqında "Həyat" (№69) qəzetinə istinadən belə yazırlar:*"Bir neçə ay oxuduqdan sonra İrəvanın əyan və ağsaqqallarını, din alimlərini, görkəmli tacir və sənətkarlarını məktəbə dəvət etdikdə "bu qızların gözəlcə şəriət bilmələri və əl işləri və yazıb-oxumaları nəzərə verildiyi vaxt bədxahların deməyə bir sözləri qalmayıb çox məmnun qaldılar. İndi oğlan uşağını rusca oxumağa qoymayan bir camaatın içində böylə bir qız məktəbi açmaq və bunlara rusca, müsəlmanca təlim etmək nə qədər zəhmətə və məşəqqətə möhtac olduğu hesaba alınırsa Məhəmmədqulu*



*Yuxarıda soldan: Q.A.Simirnov, M.Kəngərli, H.Nərimanbəyov, Aşağıda soldan: A.Kalinina, Y.G.Pxadze, (İrəvan,1903)*

[1] **Məmmədova S. Musayeva S.** Mirzə Məmmədvəli Qəmərlinski kimdir? // "Palitra" qəzeti, 2015, 10 iyun



M.Kəngərli şagirdləri ilə
(İrəvan, 1902)

*bəyin bu yolda etdiyi himmət və qoyduğu xərcü[1] məsarif behəqq təqdir olunur"*[2]

Məhəmmədqulu bəy özü də qızlar məktəbində dərs demişdir. Məktəbdə əvvəlcə 3[3], sonra 5 müəllim çalışmışdır. Məktəb 1905-ci ildə fəaliyyətini dayandırmışdır. Çar hökumətinin və ermənilərin təzyiqinə dözə bilməyən Məhəmmədqulu bəy həyatı üçün təhlükə yarandığını hiss etdiyindən məktəbinin bütün əşyalarını (30 dan çox parta, stul, stol, yazı lövhəsi, xəritə, tikiş maşını və s.), 300-dən çox kitabını qız məktəbinə bağışlayaraq Parisə yola düşmək üçün Batumiyə gedir. 29 avqust 1905-ci ildə Batumidə ermənilər tərəfindən vəhşicəsinə öldürülür.



Məhəmmədqulu bəy Kəngərli öldürülsə də, onun azərbaycanlı qızlara təhsil vermək ideyası daha geniş yayılır. Onunla birlikdə çalışanlar az sonra ikisinifli rus-tatar (Azərbaycan-F.R.) qız məktəbinin açılmasına nail olurlar.

"İrəvan quberniyasının 1914-cü il üçün yaddaş kitabçası"nda[4] məktəbin rəhbərliyi və müəllimləri aşağıdakı kimi təqdim olunur: 1)knyagina Yelena Georgiyevna Çeqodayeva (məktəbin fəxri sədri); 2) Antonina Valerianovna Kalinina (müdir); 3)Yevgeniya Georgiyevna Pxakadze (müəllim); 4) Mirzə Məmmədvəli Qəmərlinski (şəriət müəllimi).

---

[1] Məhəmmədqulu bəy vəkillikdən qazandığı pulun ən azı 5 mindən çoxunu oğlan və qız pansionlarının saxlanılmasına sərf edirdi.

[2] Bax:**Mərdanov M.,Tahirzadə Ə.** 1920-ci ilədək ali məktəblərdə oxumuş azərbaycanlılar. IV c. Bakı:Təhsil,2020,s.127

[3] İlk vaxtlar məktəbdə Kəngərli Məhəmmədqulu bəy Şəfi bəy oğlu, Yevgeniya Georgiyevna Pxakadze və Məmmədvəli Qəmərlinski fəaliyyət göstərmişdir.

[4] Памятная книжка Эриванской губернии на 1914 год / Под ред. **К.А.Водчанина.** /Эривань:Изд. Эриван. губерн. стат. ком-та , 1913.с59



Tərlan xanım Sultanova

İrəvanın "Yaddaş kitabı"nda daha bir rus-tatar (Azərbaycan -F.R.) qız məktəbinin fəaliyyət göstərdiyi bildirilir. Lakin məktəbin müəllimləri haqqında heç bir məlumat verilmir.

Ehtimal etmək olar ki, bu məktəb 1898-1917-ci illərdə ***Tərlan xanım Sultanovanın*** müdiri olduğu ***rus-tatar (Azərbaycan-F.R.) qız məktəbidir.*** Tərlan Sultanova İrəvan oğlan gimnaziyasının müəllimi İsfəndiyar bəy Sultanovun bacısı idi. F.Köçərli "İrşad" qəzetində (1906, 2 iyul) yazırdı ki, Tərlan xanım 25 ildir ki, pedaqoji sahədə yorulmadan çalışır, bilik və bacarığını vətən qızlarına öyrədir.



Tərlan xanım Sultanova İrəvan qadın gimnaziyasının qızları ilə birlikdə (İrəvan, 1918)

Prof.Sadıq Şükürov da T.Sultanovanın fəaliyyətini yüksək qiymətləndirərək yazırdı: *"Yüksək mədəniyyətə, ağıl və işgüzarlığa malik olan Tərlan xanım öz vəzifəsini ləyaqətlə yerinə yetirir, azərbaycanlı qızların təlim-tərbiyəsinə xüsusi diqqət verirdi. O, şagirdlərin əmək dərslərində hazırladıqları tikmələrdən ibarət hər kvartalda bir dəfə sərgi düzəltmiş, şəhərin nüfuzlu adamlarını baxmağa dəvət etmiş və satılan işlərdən əldə olunan maddi vəsaiti təhsil alan yetim və kasıb qızlara xərcləmişdir. Bu metod məktəbi "Müqəddəs Ripsima" xeyriyyə cəmiyyətindən müəyyən dərəcədə asılılıqdan yüngülləşdirmişdir"*[1].

1913-cü il sentyabrın 15-də İrəvanda azərbaycanlı qızların təhsil aldığı yeni bir rus-tatar məktəbi açıldı. Baydzar Vartanovna

[1] **Sadıqov Ş.** Gəncə məktəblərinin tarixindən. Bakı:Maarif,1990,s.39

Miansarova quberniya xalq məktəbləri idarəsinin direktorluğuna yazırdı: *"Sentyabrın 16-da məktəbin açıldığını elan etmişdik. Şagirdlərin gəlmədiyini nəzərə alaraq ancaq sentyabrın 30-da məşğələlərə başlaya bildik. Cəmi 8 şagirdimiz vardı. İndi 18 şagirdimiz var. Məktəb iki sinifdən ibarət idi. 1-ci sinifdə evdarlıq, davranış qaydaları, məişət məsələləri, şeir öyrədilirdi. 2-ci sinifdə proqram xeyli mürəkkəb idi. 1915/16-cı tədris ilində 1-ci sinifdə 19, 2-ci sinifdə 5 azərbaycanlı qız oxuyurdu.*

1914-cü il yanvarın 20-nə olan məlumata görə, 15 rus-tatar məktəbində 911 şagird təhsil alırdı ki, onlardan da 60 nəfəri qız idi"[1].

9 iyul 1884-cü ildə üçillik qadın progimnaziyasına çevrilən Ripsima qadın məktəbi, 30 may 1898-ci ildə ***səkkizsinifli qadın gimnaziyasına*** çevrildi. Həmin ildən sonra gimnaziyada təhsil alan azərbaycanlı qızların sayı tədricən artmağa başladı. 1 yanvar 1916-cı ilin məlumatına görə, gimnaziyada təhsil alan 405 nəfərdən 14 nəfəri azərbaycanlı idi. Ümumiyyətlə, 1916-1918-ci illərdə gimnaziyanı 35 azərbaycanlı qız bitirmişdir.



*Soldan: Mirzə Cabbar Məmmədzadə, Mirzə Abbas, İbadulla Muğanlinski*



***

İrəvanda maarifin və maarifçiliyin inkişafında ***İbadulla bəy Muğanlınski*** və ***Cəfər bəy Cəfərbəyov*** mühüm rol oynamışlar.

İbadulla bəy Muğanlınski şəhərin mərkəzi küçələrindən hesab olunan Daşlı küçədə[2] pansion açmışdır. İkimərtəbəli binada yerləşən pansionun birinci mərtəbəsində sinif otaqları, ikinci mərtə-

[1] **Məmmədov İ.** İrəvan dəftəri. İctimai fikir tariximizin qəribsəyən üfüqləri. Bakı: "Adiloğlu", 2002,s.99

[2] XIX əsrin sonu, XX əsrin əvvəllərində İrəvan şəhərində bu küçələr məşhur idi: Şəriət, Karvansara, Qala, Sultan, Çölməkçi, Naxçıvan, Bazar, Daşlı, Paşa xan, Qəriblər ocağı, Dəyirmanlı, Məscid, Fəhlə bazarı, Təpəbaşı, Qəbiristan, Naib, Mir Cəfər, Rüstəm xan, İmamrə, Korbulaq, Bəy, Kətan, Dükanlı, Sallaxlar və s.

bəsində yataq otaqları yerləşirdi. Görkəmli ictimai-siyasi xadim *Əziz Əliyev*, ədəbiyyatşünas alim *Əziz Şərif* də həmin pansionda oxumuşdur.

Yeri gəlmişkən qeyd edək ki, pansionlar geniş statusa və səlahiyyətə malik idi. Qafqaz məktəbləri üçün təsdiq edilən 1867-ci il nizamnaməsində bu tip məktəblərin fəaliyyət dairəsi xeyli genişləndirilmiş, uşaqlardan təhsil haqqı alınmasına, məktəblərdə rəsm, gimnastika, sənətkarlıq, bağçılıq, bostançılıq, nəğmə, oyun və musiqi məşğələlərinin təşkilinə icazə verilmişdir[1].

Cəfər bəy Cəfərbəyov da şəhərdə pansion açmışdı. Qafqaz popeçitelinin İrəvan quberniyası xalq məktəbləri direktoruna göndərdiyi 20 noyabr 1907-ci il tarixli məktubunda Cəfər bəy Cəfərbəyova üçüncü dərəcəli xüsusi təhsil müəssisəsi (Azərbaycan dilindən başqa digər fənlərin rus dilində tədris edilməsi şərtilə) açmağa icazə verilmişdi.

Son illərdə İrəvanda maarif və maarifçiliklə bağlı xeyli araşdırmalar[2] aparılsa da, bu tədqiqatların heç birində İrəvan şəhərində Kəlbəlixan Naxçıvanskinin təşəbbüsü ilə açılmış ***məktəb-pansion*** haqqında məlumat verilməmişdir.



S.P.Zelinski[3] həmin məktəbin yaranması tarixçəsini aşağıdakı kimi təsvir etmişdir: *"Uşaqların təhsili ilə məşğul olan xanım Stasyuleviç Kəlbəlixan Naxçıvanski ilə tanış olmuş və onun övladlarını təhsil vermək üçün qəbul etmişdir. Kəlbəlixan uşaqlarının təhsil sahəsindəki nailiyyətlərindən razı qalmış və həmin müəlliməyə müsəlman uşaqlarına dərs demək üçün İrəvana və ya Naxçıvana gəlməyi təklif etmiş, bunun üçün öz tərəfindən olacaq köməkliyi nəzərə çatdırmışdır. Xanım Stasyuleviç (Sofya Stasyuleviç)*

---

[1] Bax:**Əhmədov H.** XIX əsr Azərbaycan məktəbi. Bakı:Maarif,1985,s.61

[2] **Məmmədov İ.** Tariximiz. Torpağımız. Taleyimiz. Bakı: Adiloğlu, 2002, 699 s.; Ermənistan Azərbaycanlıların tarixi coğrafiyası. Bakı: Gənclik,1995 ,464 s.; **Məhərrəmov Z.** İrəvanda məktəbdarlıq və maarifçilik. Bakı: Nurlan,2010; **Allahverdiyev C.** İrəvan ədəbi mühiti. Bakı: Elm,2010, 250 s.; yenə onun: İrəvan pedaqoji məktəbi. Bakı: ADPU, 2015, yenə onun: İrəvanda milli maarifçilik mühiti. Bakı: Şərq-Qərb, 2017,440 s.; **Zeynalov Ə.** İrəvan ziyalıları. Bakı: Oğuz eli, 1999,368 s.

[3] İrəvan progimnaziyasının hazırlıq sinfinin müəllimi Stepan Pavloviç Zelinski "Qafqaz ölkəsi və xalqlarının təsviri üçün materiallar" (SMOMPK) məcmuəsinin 1881-ci ilin birinci sayında "İrəvan şəhəri", "Dərəçiçək", "Tatar atalar sözləri, məsəlləri, tapmacaları və qadın adları", 1882-ci ilin ikinci sayında "İrandan köçürülüb İrəvan quberniyasının Naxçıvan qəzasında yerləşdirilmiş ermənilərin məişətindən etnoqrafik oçerklər" adlı məqalələri İrəvan şəhəri haqqında obyektiv bilgi almaqda əhəmiyyətli rol oynayır.

*bu təkliflə razılaşmışdır. İrəvan şəhərinə gələn xanım ilk növbədə müsəlman uşaqları üçün pansion açmaqdan ötrü yerli müsəlman xanlarına müraciət etmiş və müsbət cavab almışdır. Onun xoşbəxtliyindən Şəfi bəy adlı bir nəfər müəlliməyə digər uşaqlar üçün örnək olsun deyə özünün iki övladına ödənişli qaydada təhsil verilməsini təklif etmişdir. Ev kirayə edən xanım Stasyuleviç Şəfi bəyin uşaqlarını təhsil vermək üçün qəbul etmişdir. ...Az sonra təhsil alan uşaqların sayı artmış, ikinci ilin sonunda onun himayəsində 15 müsəlman uşağı təlim görmüşdür. Son vaxtlar xanımın böyük ana qayğısı və təlim məharəti sayəsində şagirdlərin sayı 45 nəfərə çatmışdır... Bu, İrəvan şəhərinin birinci özəl pansionu idi... 1877-ci ildə həmin pansionda 105 şagird təhsil almışdır. Beləliklə, xanım Stasyuleviçin İrəvan şəhərində təhsil müəssisəsi yaratmaq səyləri baş tutmuşdur. Buna görə o, yerli cəmiyyətin, xüsusən müsəlman əhalisinin hər cür minnətdarlığını qazanmağı haqq etmişdir"*[1].

1911 -ci ildə İrəvan quberniyasında 1 kişi, 2 qadın gimnaziyası, 1 qadın progimnaziyası, 1 müəllimlər seminariyası, 7 şəhər məktəbi, 158 ibtidai məktəb fəaliyyət göstərirdi. Bu məktəblərin əksəriyyətində azərbaycanlılar və ermənilər birlikdə oxuyurdular. Bundan əlavə yalnız azərbaycanlıların təhsil aldığı 11 məktəb, 1 kommersiya məktəbi və xüsusi progimnaziya fəaliyyət göstərirdi[2].



İrəvan quberniyasında ilk şəhər ***üçsinifli məktəbi*** Aleksandropolda (direktor A.O.Mirakov) açılmışdır.

10 mart 1879-cu ildə Naxçıvan qəza məktəbi şəhər məktəbinə (direktor K.A.Nikitin), 1880-ci ildə Novo Bayazid qəza məktəbi şəhər məktəbinə çevrilmişdir.

İrəvan kişi gimnaziyasında təhsil alan 624 nəfərdən 106-sı rus, 21-i gürcü, 340-ı erməni, 123-ü azərbaycanlı, 2-si dağlı , 32-si digər millətin uşaqları idi[3].

İrəvan qadın gimnaziyasında təhsil alan 462 nəfərdən 16-sı, qadın progimnaziyasında təhsil alan 252 nəfərdən 4-ü azərbaycanlı idi[4].

---

[1] **Həbibbəyli İ.** XIX əsrin axırlarında İrəvan şəhərinin məhəllə adları //525-ci qəzet.- 2020.- 14 oktyabr.

[2] Кавказский календарь на 1913 год: Сприл.: Справочная книга по гор. Тифлись, Краткий путеводитель по Кавказу.Под ред. **А.А.Эльзенгера, Н.П.Стельмащука**; Издан по распоряжению Наместника его Императорскаго Величиства на Кавказе - Тифлись, 1912.s.409

[3] Yenə orada,s.411

[4] Yenə orada,s.412

İrəvan Müəllimlər Seminariyasında 128 nəfər təhsil alırdı ki, onlardan da 30-u (23,4%) azərbaycanlı, 37-si (28,9 %) erməni, 52-si ( 40,6%) rus idi.

Həmin dövrdə Zaqafqaziya Müəllimlər Seminariyasında təhsil alan 132 nəfərdən 54-ü (40,9%) azərbaycanlı idi[1].

İrəvan şəhər məktəbində təhsil alan 152 nəfərdən 39-u azərbaycanlı idi[2].

Ümumiyyətlə, İrəvan xalq məktəbləri direksiyasına tabe olan məktəblərdə təhsil alan 9561 nəfər oğlandan 1580 nəfəri, 1855 qızdan 119 nəfəri azərbaycanlı idi[3].

XIX əsrin ikinci yarısından Cənubi Qafqazda yaşayan azərbaycanlılar arasında böyük vüsət almış və mühüm siyasi, mədəni hadisə olmaqla cəmiyyətin tərəqqisi üçün əlverişli şərait yaratmış maarifçilik hərəkatı İrəvanda dünyəvi məktəblərin (ibtidai məktəblər, gimnaziya, seminariya, rus-Azərbaycan məktəbi və s.), teatrın, mətbuatın, pansionun, bazar günü məktəblərinin yaranmasına və ziyalı potensialının formalaşmasına güclü təkan vermişdir. 1912-ci ildə İrəvanda təhsilə cəlb edilən oğlanların 16,5%-nin, qızların 6,4%-nin azərbaycanlı olması mühüm elmi-pedaqoji hadisə olmaqla yanaşı, həm də Bakı və Tiflislə müqayisədə azərbaycanlıların (xüsusilə də qızların) dünyəvi təhsilə daha yüksək şəkildə inteqrasiya olunduğunu sübut edir.



İrəvan quberniyasında ildən-ilə yeni qəza məktəblərinin və ibtidai məktəblərin açılması[4] xalq müəllimlərinə olan ehtiyacı daha da artırmışdı. O dövrdə ibtidai məktəblər üçün müəllimlər seminariyalarda və müəllimlər institutlarında hazırlanırdı. Xalq məktəbləri direksiyasında və müəllimlər seminariyasında mütəxəssislərin iştirakı ilə eksternat yolu ilə də ibtidai məktəb müəllimi adı almaq mümkün idi.

[1] Yenə orada, s.416

[2] Yenə orada,s.409

[3] Yenə orada, s.409

[4]1883-cü ildə İmanşalıda, 1884-cü ildə Zodda,1889-cu ildə Böyük Vedidə, 1895-1896-cı illərdə Qəmərlidə, Basarkeçərdə, Mahmudluda, Qurdquluda, Başkənddə, Yengicədə, Çobankərədə belə məktəblər açılmışdı.

## Avropada təhsil alan ilk azərbaycanlı qız

XIX əsrin sonu, XX əsrin əvvəllərində İrəvanda təhsil və maarifçilik mühitinin inkişafı qızların ibtidai təhsillə yanaşı, həm də gimnaziya və ali təhsil almasına imkan vermişdi. 1911-ci ildə 1-ci və 2-ci Bakı qadın gimnaziyalarında cəmi 17 nəfər azərbaycanlı qız təhsil alırdısa, İrəvan qadın gimnaziyasında 16 nəfər azərbaycanlı qız oxuyurdu. İrəvan qadın progimnaziyasında 4 nəfər azərbaycanlı qız oxuduğu halda, Balaxanı qadın progimnaziyasında oxuyan 76 nəfər qızın içərisində 1 nəfər də olsun azərbaycanlı yox idi[1].



*Leyla xanım Şahtaxtinskaya*



İrəvanın vitse-qubernatoru İsmayıl bəy Qazıyevin qız nəvəsi *Tacı xanım* İrəvan qadın gimnaziyasını qızıl medalla bitirmişdi. İrəvan şəhər dumasının üzvü olan Mir Bağır Mirbabayevin hər iki qızı *Kübra və Ruqiyyə* İsveçrədə ali təhsil almışdı. Ruqiyyə xanım tibb, Kübraxanım isə ümumi humanitar fənlər ixtisasına yiyələnərək İrəvana qayıtmışdılar.

Avropaya ali təhsil almağa gedən ilk azərbaycanlı qadın İsasultan Nəcəf oğlu Şahtaxtinskinin[2] qızı ***Leyla xanım Şahtaxtinskaya*** olmuşdur. O, 1886-cı ildə Qars şəhərində anadan olmuş, 1902-ci ildə Tiflis Nücəba Qızlar İnstitutunu bitirmişdir. H.Z.Ta-

[1] Кавказский календарь на 1913 год. Тифлисъ.1912, с.412-413

[2] İsasultan Nəcəf oğlu Şahtaxtinski İrəvanda zadəgan ailəsində anadan olub.Tiflisdə D.Kipianinin pansionunda və realni gimnaziyada oxuyub.1872-1875-ci illərdə Sankt-Peterburqda Əkinçilik İnstitutunda ali təhsil alıb.Parisdə və Londonda 2 il siyasi iqtisad, Sürixdə isə təbiətşünaslıqla bağlı mühazirələr dinləyib. "Təbiət və cəmiyyətin inkişafında meşənin rolu" mövzusunda dissertasiya müdafiə edib. 1875-ci ildə Tiflisdə jurnalistlik fəaliyyətinə başlayıb, "Tiflisski vestnik" qəzetində şöbə müdiri, "Kavkazski almanax"ın təsisçisi, naşiri və redaktoru, Türkiyədə "Qars" qəzetinin (rusca) əməkdaşı olub.



*İrəvan qadın gimnaziyasında təhsil alan azərbaycanlı qızlar*

ğıyevin vəsaiti ilə İsveçrəyə ali tibb təhsili almağa göndərilmiş, 1904-1907-ci illərdə İsveçrədə Tibb Universitetində oxumuşdur. Təhsilini başa vurmasına 2 il qalmış xəstələnərək orada vəfat etmişdir.

Molla Nəsrəddin" jurnalının 1908-ci ilin 52-ci nömrəsində Leyla xanım haqqında dərc edilən nekroloqda deyilirdi: *"İki ildən sonra həkimlik dərsini qurtarıb şəhadətnamə alacaq idi və gəlib vətənində biçarə müsəlman övrətlərinin min-min dərdlərinə şəfa verəcəkdi...* ***Yevropada elm dalınca gedən müsəlman qızlarından Leyli xanımdan savayı biz özgəsini eşitməmişik."***



*Kübra və Ruqiyyə bacıları İsveçrədə*

## Müəllim seminariyaları

İlk müəllim seminariyaları Fransa (1684) və Almaniyada (1695) açılmışdır. Sonrakı illərdə, xüsusilə də XIX əsrin birinci yarısında Almaniya, Avstriya, İsveçrə və Skandinaviya ölkələrində müəllim seminariyalarının geniş şəbəkəsi yaradılmışdır. Rusiyada müəllim hazırlığını həyata keçirən ilk seminariya II Yekaterinanın dövründə 1786-cı ildə Sankt-Peterburq baş məktəblər idarəsinin nəzdində F.İ.Yanukoviç de Mireyev tərəfindən açılmışdır.

XIX əsrin 60-cı illərindən başlayaraq Rusiyada pedaqoji təhsilin inkişafına xüsusi diqqət yetirilməyə başlandı. Bu da hər şeydən əvvəl, ölkə daxilində baş verən siyasətlə bağlı idi. Bu dövr Rusiyada siyasi, iqtisadi və mədəni həyatın bütün sahələrini əhatə edən tamamlanmamış inqilabi hərəkat dövrü idi.

60-cı illərin pedaqoji hərəkatı o dövrdəki ictimai hərəkatın bir hissəsi idi. Təhkimçilik tərbiyəsinin kəskin tənqidi, silki məktəb və erkən ixtisaslaşma əleyhinə çıxışlar, ümumi təhsil, qadın təhsili uğrunda mübarizə, uşaq şəxsiyyətinə ehtiram, xalq məktəblərinin sayının artırılması tələbi XIX əsrin 60-cı illərində mütərəqqi rus pedaqoji fikir nümayəndələrinin irəli sürdüyü mühüm məsələlərdən idi. Həmin illərdə rus pedaqogikasının inkişafında bir neçə cərəyan özünü göstərirdi.



Bunlardan ən mütərəqqisi inqilabi-demokratik pedaqoji cərəyan idi. Bu cərəyanın nümayəndələri yeni məktəblərin açılmasını, müəllim kadrlarının hazırlanmasını vacib hesab edirdilər. İlk vaxtlar Rusiyada ibtidai məktəb müəllimləri ikiillik pedaqoji kurslarda, kilsə-müəllimlər məktəbində, gimnaziyaların nəzdindəki pedaqoji siniflərdə və müəllimlər seminariyalarında hazırlanırdı.

XIX əsrin 60-cı illərində Rusiyada müəllimlər seminariyası ən geniş yayılmış təhsil ocaqlarından birinə çevrildi. Müəllimlər seminariyalarının planı görkəmli rus pedaqoqu K.D.Uşinski tərəfindən hazırlanmışdı.

Onun hazırladığı "*Müəllim seminariyasının layihəsi*" 1861-ci ildə nəşr olunmuşdu. Bu layihədə ibtidai xalq məktəbləri üçün müəllim hazırlığının geniş planı verilmişdi. K.D.Uşinski bu əsərində Rusiyada ibtidai məktəb müəllimləri hazırlamaq məqsədi ilə seminariyaların təşkilinin zəruriliyini əsaslandırmış, müəllim şəxsiyyəti, onun əqli və əxlaqi yetkinliyi ilə bağlı öz fikirlərini şərh etmişdir.


K.D.Uşinski

K.D.Uşinskiyə görə, müəllim məktəbdə mühüm simadır, onun şəxsiyyəti tərbiyədə hər şeydir, buna görə də onun elmi-metodiki səviyyəsi və əxlaqi yetkinliyi yüksək olmalıdır.

Onun fikrincə, ***seminariyanın əsas vəzifəsi dövlət məktəbləri, qapalı tip təhsil müəssisələri üçün müəllimlər hazırlamaqdan ibarət idi***.

K.D.Uşinski rus pravoslav kilsəsini məktəbin əsas dayağı hesab edirdi. Əxlaq onun tərəfindən yalnız bütün rus mentalitetinə nüfuz edən pravoslavlıq çərçivəsində düşünülürdü. Seminariyanın tədris planına onun tərəfindən ilahiyyat, hesab, qrammatika, kilsə slavyan dili, tarix, qanunvericilik, botanika və zoologiya, coğrafiya, təbiət elmləri, kənd təsərrüfatı, tibb, xəttatlıq, rəsmxət, rəsm və nəğmə fənləri daxil edilmişdi.



Rusiyada müəllimlər seminariyalarının yaradılması, həm də imperiyanın hüdudları daxilində şəbəkələşdirilməsi ideyası K.D. Uşinskiyə məxsusdur.

1863-cü ildə Moskvada müəllimlər seminariyası açıldı. Burada progimnaziyalar üçün müəllim və tərbiyəçilər hazırlanırdı. 1864-cü ildə Qərbi Belarusda eksperiment olaraq müəllimlər seminariyası açıldı. Həyatını ibtidai məktəblərdə işləməyə həsr edən pravoslav dininə mənsub olanların seminariyaya qəbulu planlaşdırıldı. Xalq Maarif Nazirliyi tərəfindən seminariyalar üçün təlimat və qaydalar hazırlandı.

1870-ci ildə qəbul edilən ***"Müəllimlər seminariyası haqqında əsasnamə"*** 1917-ci ilə kimi qüvvədə qaldı. Əsasnamədə seminariyaların yaradılmasının məqsədi belə müəyyənləşdirilirdi***: "müəllim seminariyaları özlərini ibtidai məktəblərdə müəllimliyə həsr etmək istəyən pravoslav dininə mənsub bütün təbəqələrdən olan gənclərə pedaqoji təhsil vermək məqsədi ilə yaradılmışdır"***[1]**.**

[1] **Фальборк Г., Чарнолуский В.** Настольная книга по народному образованию. Законы, распоряжения, инструкции, уставы, справочные сведения и пр.Т. II. СПб.: «Знание», 1901, s.1152

Göründüyü kimi, çar hökuməti bu məktəblərə siyasi məna verirdi. Belə ki, digər dinə və millətə mənsub olanlar deyil, yalnız pravoslav dininə mənsub olanlar ibtidai məktəblərdə müəllim işləyə bilərdilər.

Seminariyaya fiziki cəhətdən sağlam və 16 yaşı tamam olan pravoslav dininə mənsub oğlanlar qəbul oluna bilərdi. Müəllimlik vəzifəsini yerinə yetirərkən çətinliklə qarşılaşmamaq üçün tələbənin fiziki qüsurunun olmaması vacib idi. Seminariyaya tələbə qəbulunda sağlamlıq müayinəsi aparılan zaman həkimlə yanaşı Pedaqoji şuranın təmsilçisi də iştirak edirdi. Seminariyada oxumaq istəyənlərin epilepsiya və vərəm xəstəliyinə tutulub-tutulmamasına, fiziki qüsurunun (pəltəklik, görmə və eşitmə zəifliyi) olub-olmamasına xüsusi diqqət yetirilirdi.

5-6 illik təhsil müddəti olan ikisinifli ibtidai məktəbi bitirənlər seminariyaya daxil olmaq üçün sənəd verə bilərdi. Seçim zamanı şihahi və yazılı imtahanların hamısından uğur qazanmaq zəruri idi. Tələbələr pansionda (yataqxanada) yaşayır, ehtiyacı olanlara təqaüd verilirdi. Təhsil müddəti 3-4 il (bəzi seminariyalarda 5 il) idi[1].



Seminariyada ilahiyyat, rus dili, kilsə slavyan dili, hesab, həndəsə, rus tarixi, ümumi tarix, coğrafiya, təbiətşünaslıq, hüsnxət və rəsm, pedaqogikanın əsasları, gimnastika, nəğmə və s. fənlər tədris olunurdu. Seminariyaların nəzdində tələbələrin pedaqoji təcrübəsinin təşkili məqsədilə nümunəvi ibtidai məktəblər açılmışdı. Həm seminariyanın, həm də onun nəzdində fəaliyyət göstərən ibtidai məktəblərin xərcləri dövlət tərəfindən ödənilirdi.

Dövlət müəllim kadrları hazırlığına xüsusi diqqət yetirdiyindən ictimai təşkilatların və ayrı-ayrı şəxslərin müəllim hazırlayan təhsil müəssisələri açmaq hüquqları məhdudlaşdırdı. Buna görə də Rusiyada zemstvolara məxsus pedaqoji məktəb və seminariyalarının bir çoxu bağlandı. Bununla yanaşı zemstvolara seminariya tələbələrinə müavinət və təqaüd ayırmalarına icazə verildi. Müəllimlər seminariyalarında dövlət hesabına oxuyan şagirdlər üçün təhsil pulsuz idi. Bununla yanaşı, zemstvoların, kənd icmasının,

[1] **Фальборк Г., Чарнолуский В.** Настольная книга по народному образованию. Законы, распоряжения, инструкции, уставы, справочные сведения и пр.Т.II.СПб.: «Знание», 1901, s.1153-1154

xeyriyyə cəmiyyətlərinin, habelə fərdi şəxslərin təqaüdləri hesabına şagird qəbuluna da icazə verilirdi.

Müəllimlər seminariyasının direktoru tədris dairəsinin popeçiteli tərəfindən seçilir, Xalq Maarif Nazirliyi tərəfindən təsdiq edilirdi. Direktor ali təhsilli olmaqla yanaşı, həm də pravoslav dininə mənsub olmalı idi. Seminariya direktoruna gimnaziya direktorları ilə eyni səlahiyyətlər verilirdi. Seminariyada dünyəvi fənləri tədris edən müəllimlər tədris dairəsinin popeçitelinin təqdimatı ilə Xalq Maarif Nazirliyi, ilahiyyat müəllimləri isə dini icmaların razılığı ilə tədris dairəsinin popeçiteli tərəfindən təsdiq edilirdi. Ana dili müəllimlərini də tədris dairəsinin popeçiteli təsdiq edirdi.

Seminariyalar xalq məktəbləri üçün ibtidai məktəb müəllimi hazırlamaqla yanaşı, yerləşdiyi bölgədə elm, təhsil və metodik mərkəz rolunu oynayır, əhali arasında maarifləndirmə missiyasını həyata keçirirdi.

1872 - ci ildə Rusiyada 52 müəllimlər məktəbi və seminariya fəaliyyət göstərirdi. 1874 – 1899-cu illərdə Rusiya ərazisində 23 yeni müəllimlər seminariyası açıldı.



Rusiya Xalq Maarif Nazirliyi yaranma şərtlərinə, maliyyələşmə mənbələrinə və idarəedilməsinə görə müəllim seminariyalarının 3 tipini müəyyən etmişdi:

1) yalnız xəzinə hesabına deyil, həm də digər mənbələr hesabına maliyyələşən dövlət müəllimlər seminariyaları;

2) qeyri-ruslar üçün dövlət müəllim seminariyaları;

3) zemstvo və özəl müəllimlər seminariyaları və məktəblər.[1]

1870-ci il noyabrın 8-də Xalq Maarif Nazirliyinin icazəsi ilə müəllimlər seminariyalarında hazırlıq siniflərinin açılmasına icazə verildi. Müəllimlər seminariyalarının və kənd müəllimlərinin nüfuzunu yüksəltmək məqsədi ilə 28 dekabr 1871-ci ildə xüsusi fərman verildi. Fərmanda müəllimlər seminariyasının kənd ibtidai dövlət məktəbində 12 il qüsursuz işləyən məzunlarına *fəxri və-*

[1]**Пругавин А.С.** Инструкции для учительских семинарий Министерства Народного Просвещения: Утв. Министерством Народного Просвещения 4-го июля 1875 г./ А.С.Пругавин //Законы и справочные сведения по начальному народному образованию. — СПб., 1898, 806 с.

***təndaş*** adının verilməsi qərara alındı. Bu qayda qəza məktəblərindəki pedaqoji kursları bitirmiş şəxslərə şamil edilmirdi.

Müəllim seminariyalarının tədris və tərbiyə fəaliyyətini tənzimləyən ikinci normativ sənəd Xalq Maarif Nazirliyi tərəfindən 4 iyul 1875-ci ildə təsdiq edilmişdir. Təlimatda seminariyanın idarə edilməsinin qaydaları, gələcək müəllimlərdə dini-əxlaqi keyfiyyətlərin inkişaf etdirilməsi üçün onlara nəzarətin təşkili, direktorun və pedaqoji kollektivin üzvlərinin vəzifələri, tədris edilən fənlərinin həcmi və məzmunu, təlim metodları, dərslərin rüblər üzrə bölgüsü və təcrübəçi tələbələrin ibtidai məktəbdə keçəcəyi praktik dərslər haqqında geniş məlumat verilmişdir.

Təlimatda seminariyanın I və II siniflərində[1] həftəlik tədris yükü 31 saat, III sinifdə 32 saat və əlavə olaraq 6 saat ibtidai məktəblərdə praktik məşğələ nəzərdə tutulmuşdu. Ümumi saatların bölgüsündə dəyişikliklərin aparılması yalnız tədris dairəsinin popeçitelinin razılığı ilə ola bilərdi. Müəllimlər seminariyalarının əksəriyyətində tədris ili avqustun 7-də başlayıb iyunun 15-də başa çatırdı ki, bu da ən azı 38 tədris həftəsi demək idi.



Təlimatda fənn proqramlarının hazırlanması ilə bağlı geniş tövsiyələr və ibtidai məktəb müəllimi şəhadətnaməsinin nümunəsi də verilmişdi.

Rusiya Dövlət Şurasının 8 noyabr 1870-ci il tarixli qərarı ilə seminariyanın nəzdində *hazırlıq siniflərinin* açılmasına icazə verildi. Bunun əsas səbəbi kənd uşaqlarının əksəriyyətinin ilkin hazırlığının müəllimlər seminariyasında oxumaları üçün yetərli olmaması ilə bağlı idi.

1872-ci ildən digər dinlərə mənsub olan gənclərin də ayrı-ayrı müəllimlər seminariyalarına xüsusi icazələr əsasında qəbuluna başlanıldı. 3 ildən sonra xüsusi icazələr ləğv edildi, seminariyalarda pravoslavlarla yanaşı, qeyri-rusların, o cümlədən müsəlmanların da təhsil almasına icazə verildi.

1896-cı ildən müəllimlər seminariyalarının bəzilərində tədris planına nəğmə, musiqi, əl əməyi və kənd təsərrüfatı fənlərinin əlavə edilməsi ilə əlaqədar olaraq eksperiment kimi 4 illik təhsilə keçildi.

[1] Seminariyanın əsasnaməsində indiki kolleclərdə olduğu kimi kurs və ya tədris ili deyil, ümumtəhsil məktəblərində olduğu kimi sinif sözü işlədilir.



*Приложенie къ Циркуляру по управленiю Кавказскимъ Учебнымъ Округомъ за 1898 годъ. № 10.*

ОТЧЕТЪ

ПОПЕЧИТЕЛЯ КАВКАЗСКАГО УЧЕБНАГО ОКРУГА

О

СОСТОЯНIИ УЧЕБНЫХЪ ЗАВЕДЕНIЙ

ЗА 1897 ГОДЪ.

ТИФЛИСЪ.

Типографiя канцелярiи Главноначальствующаго граждан. частью на Кавказѣ, Лорисъ-Меликовская ул., домъ казенный.

1898.

1898-ci ildə müəllimlər seminariyalarının nəzdində *birsinifli* ibtidai məktəbin əvəzinə *ikisinifli məktəbin* açılmasına, məzunların orta təhsil müəssisələrində sinif müəlliminin köməkçisi vəzifəsi tutmasına icazə verildi.

15 oktyabr 1898-ci ildən müəllim seminariyalarının şagirdləri üçün xüsusi geyim forması təsis edildi. Uniforma gimnaziya tələbələrinin geyiminə bənzəyirdi. Onlar həm də papaqda metal nişan və məktəbin baş hərfləri yazılmış toqqa gəzdirirdilər

Həmin dövrdə Moskva, Peterburq, Xarkov, Kazan, Odessa tədris dairələrində xeyli müəllim seminariyaları fəaliyyət göstərsə də, bu təhsil ocaqları regionlar üzrə düzgün paylanmamışdı. Belə ki, Rusiyanın milli ucqarları bu bölgüdən kənarda qalmışdı. Yalnız yeni əsasnaməyə və 1875-ci ildə təsdiq edilmiş təlimati xarakterli məktuba əsasən Kubanda (1871), Qoridə (1876) və İrəvanda (1881) müəllim seminariyaları açıldı. Qori Müəllimlər Seminariyasında rus, erməni və gürcü şöbələri fəaliyyət göstərirdi. Milli maarifpərvərlərimiz belə bir təhsil müəssisəsinin Azərbaycan şəhərlərindən birində açılmasına çalışsalar da, buna nail ola bilmədilər. Uzun yazışmadan sonra ibtidai kənd məktəbləri üçün azərbaycanlılardan müəllim kadrları hazırlamaq məqsədilə Qori Müəllimlər Seminariyasının nəzdində Azərbaycan şöbəsi yaradıldı. Prof.F.Ə. Seyidov Azərbaycan şöbəsinin 1 sentyabr 1879-cu ildə fəaliyyətə başladığını bildirir[1].

1905-ci ildə Rusiyada 519 təhsil müəssisəsində, o cümlədən 77 seminariya və məktəbdə ibtidai məktəb müəllimi hazırlanırdı. Müəllimlər seminariyalarında 8162 nəfər təhsil alırdı. 1905-ci ilə kimi seminariya məzunlarının sayı 1519 nəfər olmuşdur. Müqayisə üçün qeyd edək ki, həmin dövrdə Rusiya imperiyasında 10

[1] Seyidov F.Ə. Qori seminariyası və onun məzunları. Bakı: Maarif, 1988, s.9


Изданъ по распоряженію Намѣстника ЕГО ИМПЕРАТОРСКАГО ВЕЛИЧЕСТВА на Кавказѣ
КАНЦЕЛЯРІЕЙ НАМѢСТНИКА.

Кавказскій
календарь
на 1913 годъ
(LXVIII г.).

Съ приложеніями:
1) Справочная книга по городу Тифлису.
2) Краткій путеводитель по Кавказу.

подъ редакціей
А. А. Эльзенгера и Н. П. Стельмащука.

ТИФЛИСЪ.
Типографія Канцел. Намѣстника ЕГО ИМПЕРАТОРСКАГО ВЕЛИЧЕСТВА на Кавказѣ.
1912.

müəllimlər institutunda 713 nəfər təhsil alırdı. Müəllimlər institutlarının cəmi 178 məzunu olmuşdur[1].

"Qafqaz təqvimi"ndə göstərilir ki, 1911-ci ildə Qafqazda 1 müəllimlər institutunda və 8 müəllimlər seminariyasında (Zaqafqaziya, Kutaisi, Stavropol, Terek, İrəvan, Yekaterinador, 1-ci və 2-ci Kuban müəllimlər seminariyaları) 896 tələbə təhsil alırdı ki, onlardan da 488-i rus, 103-ü gürcü, 84-ü azərbaycanlı, 49-u erməni, 17-si dağlı, 41-i digər millətin nümayəndələri idi. Zaqafqaziya Müəllimlər Seminariyasında təhsil alan 56 nəfər müsəlmandan 54-ü azərbaycanlı, İrəvan Müəllimlər Seminariyasında oxuyan 30 nəfər müsəlmanın 30-u da azərbaycanlı idi[2].



1913-cü ildə Rusiyada fəaliyyət göstərən 128 müəllimlər seminariyasında 12190 tələbə, Qafqazdakı 9 seminariyada isə 972 nəfər oxuyurdu[3]. 1914-cü ildə Rusiya imperiyasında 128 müəllimlər seminariyası fəaliyyət göstərdiyi halda, 1917-ci ildə onların sayı 192-yə çatdı.

14 may 1917-ci ildə müəllimlər seminariyalarının və müəllimlər institutlarının statusları müzakirə edilərək hər iki təhsil müəssisəsinə ***orta məktəb*** statusu verildi. 1917-ci il inqilabından sonra Rusiyadakı müəllimlər seminariyaları 3 illik pedaqoji kurslara, sonra isə pedaqoji texnikumlara çevrildi. İrəvan Müəllimlər Seminariyası 1918-ci ilə kimi öz statusunu qoruyub saxladı. 1918-ci ildə daşnak hökuməti tərəfindən ləğv edildi.

---

[1]**Войтеховская М.П.** История педагогического образования в России: учебное пособие. Часть I / М.П.Войтеховская. – Томск: Издательство Томского государственного педагогического университета, 2013. s.70.

[2]Кавказский календарь на 1913 год. Тифлисъ.1912,s.416

[3]**Войтеховская М.П.** История педагогического образования в России: учебное пособие. Часть I / М. П. Войтеховская. – Томск: Издательство Томского государственного педагогического университета, 2013, с.80

## İrəvan Müəllimlər Seminariyasının təşkili

Rusiyada XX əsrin 60-cı illərindən başlanan ictimai-pedaqoji hərəkat, imperiyanın digər regionlarında olduğu kimi, İrəvan quberniyasında da məktəb təhsili sahəsində canlanmaya səbəb oldu. İbtidai məktəb şəbəkəsinin sürətlə artması müəllim kadrlarına olan ehtiyacı kəskin şəkildə artırdı. Dünyəvi təhsilin səmərəli nəticələri azərbaycanlı oğlan və qızlarda rusdilli məktəblərə böyük maraq yaratmışdı.

Ona görə də İrəvana köçürülən ermənilər kilsə-prixod[1] məktəblərində, azərbaycanlılar isə dövlət məktəblərində (qəza məktəbləri, şəhər məktəbləri, realni məktəb və s.) oxumağa üstünlük verirdilər.

İrəvan şəhərində və quberniyanın digər kənd və şəhərlərində açılan ibtidai məktəblərdə müəllim kadrları çatışmırdı. Təhsilin rus dilində verildiyi həmin məktəblərdə dərs demək üçün müəllimlər Rusiyadan göndərilirdi.

1880-1885-ci illərdə İrəvan quberniyasına Xalq Maarif Nazirliyi 43 müəllim göndərmişdi. Göndərilənlərdən 21-i mərkəzi quberniyalardan, 22-si Qafqazın digər bölgələrindən idi. Göndərilənlərdən yalnız 21 nəfərinin ali təhsili var idi, digərləri isə gimnaziyanı və ya ibtidai məktəbi bitirmişdilər[2].



Rusiyadan göndərilən müəllimlərin əksəriyyəti yerli əhalinin adət-ənənəsinə, məişətinə, dilinə, dininə, ehtiyac və təsəvvürlərinə yaxından bələd olmadıqlarına görə onların hörmət və ehtiramını qazana bilmirdi. Çar Rusiyası isə təhsil vasitəsi ilə milli ucqarlarda öz strateji hədəflərinə nail olmaq arzusunda idi.

O dövrdə Cənubi Qafqazda Azərbaycan və erməni məktəbləri üçün xalq müəllimləri Zaqafqaziya Müəllimlər Seminariyasında hazırlanırdı.

Zaqafqaziya Müəllimlər Seminariyasının tatar (Azərbaycan-F.R.) şöbəsinə rəhbərlik edən fədakar maarifçi A.O.Çernyayevski yazırdı:***"İbtidai xalq məktəbinin canı müəllimdir.Tədris işinin***

[1] Prixod (yun. *Παροικία* ( yun. *παρά* — "yaxın" və yun. *οἶκος* — "ev") — xristianlıqda aşağı kilsə təşkilatı və bu təşkilat üzvlərinin yaşadığı yer, məhəllə.

[2] Национальный архив РА. Фонд 94, оп. 1, д.99



A.O.Çernyayevski

***müvəffəqiyyəti ondan asılıdır. O, kənd əhalisinin qaranlıqda qalan kütləsi içərisində maarifin pioneridir".***

1876-cı ildə Zaqafqaziya Müəllimlər Seminariyasının, 1879-cu ildə həmin seminariyanın nəzdində Azərbaycan şöbəsinin, elə həmin il Daşkənddə Türküstan Müəllimlər Seminariyasının, Orsk şəhərində Qazax Müəllimlər Seminariyasının açılması İrəvan ziyalılarını quberniya mərkəzində də belə bir seminariyanın açılması təşəbbüsü ilə çıxış etməyə sövq etdi. Uzun yazışmalardan sonra, nəhayət ki, İrəvanlı ziyalıların seminariya yaratmaq ideyaları reallaşdı.

Rusiya Dövlət Şurası 20 oktyabr 1880-cı ildə ***"Kutaisi və İrəvan quberniyalarında müəllimlər seminariyalarının təşkil edilməsi haqqında"*** qərar qəbul etdi[1]. Kutaisi Müəllimlər Seminariyası üçün 27800 rubl, İrəvan Müəllimlər Seminariyası üçün 28350 rubl illik xərc nəzərdə tutulmuşdu ki, bu vəsait də yerli büdcədən ödənilməli idi.





**61455.**—Октября 20 Высочайше утвержденное мнѣніе Государственнаго Совѣта (Собр. Узак. 1880 г Ноября 25, ст 807).—*Объ учрежденіи въ Кутаисской и Эриванской губерніяхъ Учительскихъ Семинарій*

Xalq Maarif Nazirliyi tərəfindən İrəvan Müəllimlər Seminariyasının ştat cədvəli[2] aşağıdakı kimi təsdiq olunmuşdu.

---

[1] Сборник постановлений по Министерству народного просвещения Царствование императора Александра II, Том 7, 1877-1881. С.Петербургъ.1883, с.1915-1916

[2] Сборник постановлений по Министерству народного просвещения Царствование императора Александра II, Том 7, 1877-1881. С.Петербургъ. 1883. Штаты и приложения. Высочайше утвержденный 20-го октября 1880 г. Штать учительский семинарии в Эриванской губернии. с.49-50

| | **əmək-daşların sayı** | **Bir nəfər üçün illik xərc** (rubl ilə) | | | | **Siniflər və dərəcələr** | | |
|---|---|---|---|---|---|---|---|---|
| | | **əmək haqqı** | **yemək üçün** | **mənzil üçün** | **Cəmi** | **vəzifəyə görə** | **xüsusi geyim üçün** | **təqaüd üçün** |
| Direktor | 1 | 1200 | 1300 | Dövlət mən-zili | 2500 | V | V | tədris xidmətinə görə |
| İlahiyyat fənnini tədris edənlər (pravoslav, erməni—qriqoryan və müsəlman) | 3 | — | — | — | 1500 | — | — | — |
| Rus və erməni dili müəllimi və digər fənn müəllimləri üçün | 4 | 650 | 550 | 195 | 5580 | VIII | VIII | tədris xidmətinə görə |
| Tatar (Azərbaycan) dilinin tədrisinə görə | — | — | — | — | 445 | — | — | — |
| Seminariyanın nəzdindəki hazırlıq sinfinin müəllimi | 1 | 650 | — | 195 | 845 | X | X | tədris xidmətinə görə |
| İbtidai məktəbin müəllimi | 1 | 600 | — | 180 | 780 | X | X | tədris xidmətinə görə |
| Müəllimlərin seminariyanın nəzdindəki növbətçiliyinə görə | — | — | — | — | 1500 | — | — | — |
| Nəğmə, musiqi, gimnastika və sənət öyrədilməsinə görə | — | — | — | — | 1200 | — | — | — |
| Bağçılığın öyrədilməsinə görə | — | — | — | — | 400 | — | — | tibbi xidmət |
| Həkim | 1 | 300 | | | | VIII | VIII | tibbi xidmət |
| Katib (həm də iqtisadçı) | 1 | 500 | | | 500 | — | — | — |
| Xəzinəhesabına oxuyan 50 nəfərin hər biri üçün 130 rubl | — | — | — | — | 6500 | — | — | — |
| Onlar üçün tədris vəsaiti | — | — | — | — | 400 | — | — | — |
| Kursu bitirənlərə mükafat | — | — | — | — | 200 | — | — | — |
| Dərman üçün | — | — | — | — | 200 | | | |
| Kitabxana və müəllimlər üçün vəsait | — | — | — | — | 300 | — | — | — |
| Onlar üçün mənzilə görə | — | — | — | — | 3000 | — | — | — |
| Evlərin qızdırılması, işıqlandırılması və mebellərin təmiri üçün | — | — | — | — | 1400 | — | — | — |
| Xidmətçilər, dəftərxana və d. xərclər üçün | — | — | — | — | 800 | — | — | — |
| Ümumi xərc | | | | | 28350 | | | |

Direktor, fənn müəllimləri, rus və erməni dili müəllimləri, seminariyanın nəzdindəki hazırlıq sinfinin və ibtidai məktəbin müəllimləri uzunmüddətli səmərəli pedaqoji fəaliyyətinə, seminariyanın həkimi isə tibbi xidmətlərinə görə dövlət tərəfindən təqaüdlə təmin edilirdi. İlahiyyat və Azərbaycan dili müəllimlərinin isə belə bir hüququ yox idi. İlk vaxtlar seminariyanın müəllim və tələbə kollektivini formalaşdırmaqda ciddi çətinliklər mövcud idi.

4 avqust 1881-ci ildə Y.S.Suşevski İrəvan Müəllimlər Seminariyasının direktoru təyin olunub[1]. Həmin vaxt o Çerniqov quberniyasının xalq məktəblərinin direktoru vəzifəsində işləyirdi. 20 sentyabr 1881-ci ildə İrəvana gələn Y.S.Suşevski elə həmin gün Qafqaz Tədris Dairəsinin popeçitelinə vəzifəsinə başlaması ilə bağlı məktub ünvanlayıb[2]. Məktubda deyilirdi: «*От директора. 20 сентября 1881 г. его превосходительству г-ну попечителю Кавказского учебного округа. Имею честь начмительнейше донести Вашему Превосходительству, что сего числа 20 сентября я прибыл в Эриван и вступил в должность и в отправление возможных на меня обязаннестой*»[3].



26 sentyabr 1881-ci ildə İrəvan Quberniya Məclisinin üzvü Axund Məmmədbağır Qazızadə İrəvan Müəllimlər Seminariyasına şəriət müəllimi təyin edilməsi ilə bağlı ərizə ilə direktora müraciət edib[4]. İrəvan Müəllimlər Seminariyasının direktoru Y.S.Suşevski Qafqaz Tədris Dairəsinin popeçitelinə (K.P.Yanovskiyə -F.R.) Axund Məmmədbağır Qazızadənin seminariyaya şəriət müəllimi qəbul edilməsi ilə bağlı məktub ünvanlayıb[5]. 18 noyabr 1881-ci ildə Qafqaz Tədris Dairəsinin popeçitelinin direktora ünvanladığı məktubda Axund Məmmədbağır Qazızadənin seminariyada şəriət müəllimi işləməsinə icazə verildiyi bildirilir.

Seminariyanın həmin tədris ilində fəaliyyətə başlamasına çalışan Qafqaz Tədris Dairəsinin təşəbbüsü ilə quberniya xəzinəsindən ilkin olaraq seminariyanın saxlanılmasına 14037 rubl.50

---

[1] Ermənistan DTA f.519, siy, 1, iş 6, v.2

[2] Yenə orada

[3] Ermənistan DTA f.519, siy, 1, iş 6, v. 1

[4] Ermənistan DTA f.519, siy, 1, iş 6, v.2

[5] Ermənistan DTA f.519, siy, 1, iş 6, v.2

qəpik vəsait ayrılıb. Şuşa şəhər sakininin İrəvan şəhərindəki evi seminariya üçün kirayə edildi. Bina şəhər bağı (Sərdar bağı) ilə üzbəüz, qubernatorun yaşadığı evlə aptekin yanında yerləşirdi.

10 oktyabrdan 9 dekabr 1881-ci ilə kimi seminariyaya qəbul aparılıb. Y.S.Suşevskinin fədakarlığı nəticəsində ilk tədris ilində seminariyaya 42 nəfər qəbul olunub ki, onlardan da 8 nəfəri pravoslav, 28 nəfəri erməni-qriqoryan, 6 nəfəri müsəlman idi. Ermənistan Dövlət Tarix Arxivindəki 159-cu fondda seminariyaya qəbul üçün müraciət edən ilk müsəlmanlardan Mirzə Cabbar bəy Qazıyevin atası Əli Əşrəf bəy Qazıyevin, Beytulla bəy Nəsib bəy oğlunun yaxın qohumu Həsənağa Hacı Kərim bəy oğlunun, ləzgi Cəmil Babayevin ərizələri saxlanılır.

İrəvan Müəllimlər Seminariyası 8 noyabr 1881-ci ildə bazar günü saat 12-də 9 müəllim, 42 şagirdlə təntənəli şəkildə açılmışdır. İrəvan quberniyasında təhsil və mədəniyyət hadisəsinə çevrilən seminariyanın açılışında qubernator, xalq məktəblərinin direktoru, tanınmış din xadimləri, maarifçilər, məktəbdarlar, seminariyaya yeni qəbul edilən tələbələr və onların valideynləri iştirak etmişdir. Təntənəli açılışdan sonra seminariyanın direktoru Y.S.Suşevski Qafqaz Tədris Dairəsinin popeçitelinə göndərdiyi məktubda[1] yazırdı:

*"Тифлис. Господину Попечителю Кавказского учебного округа*

*Вашему Превосходительству честь имею всепоучительнейшей донести, что сего числа, 8 ноября, после торжественного Господу Богу молебствую, последовало открытие Эреванской учительской семинарии в присутствии Господина начальника губернии, начальствующих лиц и весьма многих членов здешнего общества обоего пола.*

*Проникнутые чувствами беспредельной благодарности к своему августейшему Монарху за эту новую для здешнего края Высочайшую милость, эриванское население и педагогический совет эриванской учительской семинарии. Осмеливаются всепокорнейшее просит Ваше превосходительство по случаю открытия семинарии в радостный день тезоименитства. Августейшего Покровителя Кавказского края, Его Императорского Высочества, Великого Князя Михаила Николаевича, исходатайствовать для Эриванской учительской семинарии названия Михайловской.*

*Директор Сушевский"*



[1] Ermənistan DTA f.519, siy, 1, iş 14, v.2

Saxta tarix yaradan ermənilər İrəvan Müəllimlər Seminariyasının da tarixini təhrif edirlər. "Ermənistanda rus təhsilinin təşəkkülü. Respublikada məktəb, gimnaziya və digər təhsil müəssisələrinin yaranma tarixi" adlı məqalədə göstərilir ki, 1850-ci ilin yanvarında İrəvan Müəllimlər Seminariyası yaradılıb və onun ilk direktoru İ.N.Pekçinski olub. 1850-ci ildə seminariyada 9 rus, 42 erməni və 15 tatar (azərbaycanlı-F.R.), 1861-ci ildə 20 rus, 128 erməni və 22 tatar (azərbaycanlı-F.R.) təhsil alıb. 1880-1885-ci illərdə İrəvan Müəllimlər Seminariyasının direktoru V. Brajnikov, 1885-1890-cı illərdə K.Suşçevski, sonra A.Lyudanski olub."[1]

Yuxarıda da qeyd etdiyimiz kimi, Rusiyanın milli ucqarlarında qeyri-ruslar üçün seminariyaların açılmasına 1875-ci ildə icazə verildiyi halda, 1850-ci ildə İrəvanda müəllimlər seminariyasının açılması qeyri-mümkün idi. Rusiya Dövlət Şurası İrəvan quberniyasında Müəllimlər Seminariyasının açılması ilə bağlı qərarı 20 oktyabr 1880-cı ildə qəbul etmişdir. Müəllif ya bilərəkdən saxtakarlığa yol verir, ya da məlumatsızlıqdan faktları təhrif edir.



İrəvan Müəllimlər Seminariyasının açılması ilə bağlı qərar 1880-ci ildə verilsə də, tədris müəssisəsi bir ildən sonra fəaliyyətə başladı.

Seminariyanın açılması bir neçə səbəbdən yubanmışdı:

1) tədris üçün yararlı binanın olmaması;

2) fənn müəllimlərinin Rusiyanın mərkəzi quberniyalarından vaxtında göndərilməməsi;

3)şagird kontingentinin yığılmasında çətinliklərin olması;

4)tədris resurslarının olmaması və s.

Sadaladığımız bu problemlər seminariyanın ilk direktoru görkəmli maarifçi ***Yakob Stepanoviç Suşevski*** tərəfindən çətinliklə olsa da dəf edildi.[2]

Qori Müəllimlər Seminariyasının Azərbaycan şöbəsinin popeçiteli A.O.Çernyayevskinin seminariyaya azərbaycanlı tələbələrin cəlb edilməsində yaşadığı çətinlikləri Yakob Stepanoviç Suşevski də yaşamalı olmuşdur.

---

[1] Становление русского образования в Армении. История появления в Республике школ, гимназий и других учебных заведений //https:tsargrad.tv/articles/stanovlenie-russkogo-obrazovanija -v armenii_357397

[2] Кавказский календарь... Текст на 1882 год». Тифлисъ.1881, с. 104

Kuban və Zaqafqaziya (Qori) Müəllimlər Seminariyasının mütərəqqi ənənələrindən, A.O.Çernyayevskinin seminariyaya tələbə toplaması təcrübəsindən bəhrələnən Yakob Stepanoviç Suşevski çətinliklə də olsa ilk tədris ilində seminariyaya 9 müəllimin, 42 şagirdin cəlb edilməsinə, maliyyə məsələlərinin həllinə nail oldu.

Seminariyaya qəbul olunan azərbaycanlı tələbələrin hazırlıq səviyyəsi müxtəlif olurdu. İrəvan quberniyası üzrə 1888-ci ilə aid olan məlumatda bildirilir ki, ikisinifli və üçsinifli şəhər məktəbini bitirənlərin təlim səviyyəsi və davranışı yüksək olduğuna görə 1-ci sinfə qəbul edilirdi. Xəzinə hesabına oxuyan belə tələbələr tədris uğurlarına görə fərqlənir, xidmətə əsl xalq müəllimi kimi başlayırdılar[1].

1899-cu il İrəvan Müəllimlər Seminariyasının həyatında mühüm bir hadisə ilə yadda qaldı.

Belə ki, 8 fevral 1899-cu ildə Dövlət Şurasının sədri Mixoilin sədrliyi ilə keçən iclasda İrəvan Müəllimlər Seminariyasının ştat cədvəlində müəyyən dəyişikliklərin edilməsi qərara alındı[2]. Yeni ştat cədvəlinə aşağıdakı mütərəqqi düzəlişlər əlavə edildi: 1) seminariyada fəaliyyət göstərən tatar (Azərbaycan -F.R.) və erməni dili müəllimlərinin hər birinə ildə 500 rubl əmək haqqının, təsərrüfat işləri və uniforma tikişi üçün vəsaitin ödənilməsi və təhsil xidmətlərinə görə dövlət təqaüdünün verilməsi nəzərdə tutuldu.



Halbuki, İrəvan Müəllimlər Seminariyasının 20 oktyabr 1880-ci ilə aid ştat cədvəlində Azərbaycan dili müəllimlərinə belə hüquq və güzəştlər nəzərdə tutulmamışdı; 2) seminariyada rəsm, rəsmxət və hüsnxət fənləri ilə bağlı yeni ştatların yaradılması, həmin fənləri tədris edən müəllimlərə gimnaziya və progimnaziyaların müəllimləri ilə bərabər hüquq və güzəştlərin (pensiya təminatı və s.) verilməsi qərara alındı; 3) seminariyanın həkiminin əmək haqqı 440 rubla kimi yüksəldildi. Əvvəlki ştat cədvəlində həkimin əməkhaqqı 330 rubl nəzərdə tutulmuşdu[3].

Tatar (Azərbaycan-F.R.) dili, rəsm, rəsmxət, hüsnxət müəllimləri və həkim üçün ildə nəzərdə tutulan səkkizyüz doxsan beş rublun formalaşdırılması üçün erməni müəllimlərinin əməkhaqqının

[1] Обзор Эриванской губернии за 1888- Эривань: Тип. Эриван. губ. правления, s.131

[2] Журнал Министерства Народного Просвещения. Седьмое десятилетие. Часть CCCXXXIII. С.Петербург. 1899, с.3

[3] Yenə orada, s.4

1395 rubldan 500 rubla endirilməsi və digər müəllimlərlə eyniləşdirilməsi nəzərdə tutulmuşdu.

Dəyişikliklər aşağıdakıları əhatə edirdi:İrəvan Müəllimlər Seminariyası fəaliyyətə başladığı ilk illərdə tədris prosesi üçün o qədər də yararlı olmayan və illik icarə haqqı 3 min rubl olan birmərtəbəli binada yerləşdirilmişdi[1].

Binanın qapısının üzərindən kiçik bir lövhə asılmışdı. İrəvan təhsil tarixinin tanınmış tədqiqatçısı dos.Cəlal Allahverdiyevin yazdığına görə, həmin lövhənin üzərində əski ərəb əlifbası ilə bu sözlər yazılmışdı: *"Əcəb səadətə çatdıq görüb əsl səidi, bu zülmət içrə göründü gözə "Ziyayi-Rəşidi"*[2].

1901-ci ildə seminariyanın pedaqoji şurası təhsil müəssisəsi üçün ayrıca bina tikmək qərarına gəldi, şəhərin yuxarı hissəsində (Daşlı küçədə) ağaclarla əhatə olunmuş ərazi məktəb binası üçün ayrıldı. Bir il sonra memarlar *Vasili Mirzoyan* və *Nikolay Kitkinin* layihəsi əsasında tədris binasının tikintisinə başlanıldı. 1905-ci ildə tikintisi başa çatan binada[3] İrəvan Müəllimlər Seminariyası on il fəaliyyət göstərdi.



Daşlı küçədə XX əsrin əvvəllərində tikilən binaların böyük əksəriyyəti (xüsusilə azərbaycanlılara məxsus) sökülsə də, azərbaycanlı tələbələrin içərisində ruhu yaşayan seminariyanın binası daşınmaz tarix və mədəniyyət abidəsi (№1.6.177) kimi qorunur.

1914-1918-ci illərdə Cənubi Qafqazda "erməni məsələsi"nin ön plana keçməsi region üçün böyük təhlükə yaratdı. Ermənilər Cənubi Qafqazda dinc müsəlman-türk əhalisinə qarşı vəhşiliklər törətdilər. İrəvanda təhsil məbədi kimi tanınan İrəvan Müəllimlər Seminariyasının binası 1915-ci ildə hərbi kazarmaya çevrildi. Az sonra isə Osmanlıdan köçürülən ermənilər həmin binada yerləşdirildi. Seminariya isə müəllim və tələbələri ilə birlikdə Şimali

---

[1] Отчеть попечителя Кавказскаго учебнаго округа: состоянии учебныхъ заведений за 1890 год.- Тифлись, 1891, таблица №160

[2] Cənubi Qafqazda dünyəvi təhsil verən məktəb. //https://www.yeniazerbaycan.com/Sosial_e65324_az.html

[3] Təhsil müəssisəsi ikimərtəbəli bina kimi layihələndirilsə də, 1930-cu ildə ümumi memarlıq üslubunu pozmadan binanın üstündə üçüncü mərtəbə tikildi. Binaya yeni sinif otaqları ilə yanaşı müəllimlər otağı, kitabxana, mətbəx, yeməkxana, idman, oxu və iclas zalları əlavə edildi. Hazırda İrəvan Dövlət Universitetinin üç fakültəsi (ilahiyyat, tarix, iqtisadiyyat və idarəetmə) həmin binada yerləşir.



*İrəvan Müəllimlər Seminariyası 1905-1915-ci illərdə bu binada yerləşmişdir*



Qafqaza - Armavirə köçürüldü. Həmin dövrdə seminariyada 117 şagird təhsil alırdı.

Rusiya Dövlət Şurasının "Müəllimlər seminariyasının əsasnaməsinin və ştatlarının dəyişdirilməsi" ilə bağlı 14 iyun 1917-ci ildə qəbul etdiyi qərarda seminariyalar ibtidai məktəb müəllimi hazırlamaqla yanaşı, 5 illik təhsil verən orta təhsil müəssisəsinə çevrildi. Bəzi mənbələrdə fevral burjua inqilabından sonra Rusiya imperiyasında fəaliyyət göstərən seminariyaların üçillik pedaqoji kursa çevrilməsi bildirilir. Qeyd edək ki, həm Qoridə, həm də İrəvanda ibtidai kənd müəllimi hazırlığını həyata keçirən seminariyalar 1918-ci ilə kimi öz fəaliyyətini davam etdirdi. 1918-ci ildə Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan şöbəsi görkəmli maarifçi və məktəbdar F.B.Köçərlinin təşəbbüsü və fədakarlığı ilə Qazax şəhərinə köçürüldü və burada müstəqil Qazax Müəllimlər Seminariyası kimi fəaliyyətə başladı[1].

Müasir erməni mənbələrində də İrəvan Müəllimlər Seminariyasının 3 illik pedaqoji kursa çevrilməsi bildirilir[2]. Amma bununla bağlı nə seminariyanın son direktoru V.Dobrotinin 1918-ci ilə aid hesabatında, nə də tatar (Azərbaycan-F.R.) dili müəllimi Mirzə

[1]Qazax Pedaqoji Məktəbi adı ilə 1956/57-ci tədris ilinə kimi fəaliyyət göstərən seminariyanın 3000 -ə yaxın məzunu olmuşdur.

[2]Ераванская учительская семинария https://hy-m-wikipedia-org. translate.goog/wiki/

Cabbarın xatirələrində heç bir qeyd yoxdur. V.Dobrotin tərcümeyi halında 1918-ci ilə kimi İrəvan Müəllimlər Seminariyasının direktoru vəzifəsində işlədiyini yazır.

Qeyd etmək lazımdır ki, 1917/18-ci tədris ilində ermənilərin törətdikləri dəhşətli qırğınların nəticəsində seminariyaya azərbaycanlı tələbələrin qəbulu aparılmamışdır.

Qafqazdakı digər seminariyalar kimi, İrəvan Müəllimlər Seminariyasının tələbə kontingentinin tərkibi beynəlmiləl idi. Seminariyada azərbaycanlılarla bərabər, erməni, gürcü, rus və digər xalqların uşaqları təhsil alırdı.

İlk təhsil ilində seminariyaya qəbul olunan 42 şagirdin 8-i rus, 28-i erməni, 6-sı azərbaycanlı idi. İkinci tədris ilində azərbaycanlıların sayı xeyli artdı. İkinci tədris ilinin sonunda tələbələrin ümumi sayı 54 nəfər oldu ki, onlardan da 7-si rus, 23-ü azərbaycanlı, 23-ü isə erməni idi.[1]

İrəvanda ilk meteoroloji stansiya 1883-cü ildə İrəvan Müəllimlər Seminariyasının nəzdində yaradılmışdır[2].



Seminariyaya qəbul olunan tələbələrin sayı və tərkibi ildənilə fərqli olmuşdur. Məsələn, 1884-cü ildə seminariyada 78 nəfər tələbə, onun nəzdindəki ibtidai məktəbdə 70 şagird oxuyurdu[3] ki, bu da İrəvan quberniyasındakı 60 təhsil müəssisəsində oxuyan 2453 şagirdin (2322 kişi, 131 qadın) 6 %-ni təşkil edirdi.

1888-ci ildə seminariyada təhsil alan 83 nəfərin 8-i rus, 2-si gürcü, 15-i azərbaycanlı, 50-si erməni, 2-si aysor, 6-sı yunan, 2-si digər millətin nümayəndəsi idi[4]. 1891-ci ildə burada təhsil alan 66 tələbədən 6-sı rus, 3-ü gürcü, 39 –u erməni, 11-i azərbaycanlı, 2-si aysor, 5-i yunan olub[5].

Sonrakı illərdə seminariyada oxuyan tələbələrin ümumi sayı nəinki artmış, əksinə azalaraq 1900-cü ildə 76 nəfər olmuşdur[6].

---

[1]**İbrahimov N.** İrəvan Müəllimlər Seminariyası // "Azərbaycan məktəbi" jurnalı, 2018, № 1, s.69-72

[2]Ераванская учительская семинария // https://hy-m-wikipedia-org. translate.goog/wiki/

[3] Обзор Эриванской губернии за 1884.Эривань: Тип. Эриван. губ. правления,1885,таблица №9

[4] Обзор Эриванской губернии за 1888.Эривань: Тип. Эриван. губ. правления,1889, с.131

[5] Обзор Эриванской губернии за 1891 год.Эриван.1892, с. 90

[6] Обзор Эриванской губернии за 1900.Эривань: Тип. Эриван. губ. правления,1901,с.67

Seminariyada 1889-cu ildə 69, 1890-cı ildə 69, 1891-ci ildə 66, 1892-ci ildə 54, 1893-cü ildə 52, 1894-cü ildə 52, 1895-ci ildə 49, 1896 -cı ildə 59, 1897-ci ildə 62, 1898-ci ildə 67, 1899-cu ildə 73 tələbə təhsil almışdır. Həmin tələbələrdən 1889-cu ildə 13-ü, 1890-cı ildə 12-si, 1891-ci ildə 11-i, 1892-ci ildə 10-u, 1893-cü ildə 7-si, 1894-cü ildə 7-si, 1895-ci ildə 7-si, 1896-cı ildə 8-i, 1897-ci ildə 15-i, 1898-ci ildə 18-i, 1899-cu ildə 13-ü, 1900-cü ildə 15-i azərbaycanlı olmuşdur.

Deməli, 1888-1900-cü illərdə seminariyada təhsil alan 831 tələbədən 151-i (18,2 %) azərbaycanlı olmuşdur.

İrəvan quberniyasının 1884-1913-cü illərə aid hesabatında bəzi illərdə seminariyada oxuyan tələbələrin siniflər (kurslar) üzrə bölgüsü, məzunların və tələbələr sırasından xaric olunanların sayı, illik maliyyə xərci və s. haqqında da ətraflı məlumat verilmişdir.

***Seminariyada təhsil alan tələbələrin inkişaf dinamikası (1891-1896-cı illər)***



| **İllər** | **Haz. s.** | **I s.** | **II s.** | **III s.** | **Cəmi** | **Məzun** | **Xaric olunub** | **İllik xərc (rubl)** |
|---|---|---|---|---|---|---|---|---|
| 1890 | 27 | 20 | 8 | 14 | 69 | 12 | | 27.570 |
| 1891 | 27 | 19 | 16 | 4 | 66 | 12 | 12 | 28.173 |
| 1892 | 6 | 25 | 8 | 15 | 54 | 9 | 4 | 29336 rubl, 75 qəp. |
| 1893 | 12 | 6 | 25 | 9 | 52 | 15 | 2 | 28.173 |
| 1894 | 14 | 14 | 8 | 16 | 52 | 9 | 5 | 28.173 |
| 1895 | 16 | 18 | 8 | 7 | 49 | 14 | 3 | 28.173 |
| 1896 | 21 | 16 | 15 | 7 | 59 | 7 | 1 | 28.173 |

1891-1896-cı illərdə seminariyada 332 tələbə oxumuşdur. Bu tələbələrdən 61-i məzun olaraq ibtidai məktəb müəllimi adını almış, 32 nəfəri isə müxtəlif səbəblərdən (ailə vəziyyətinə, xəstəliyinə, davranışına) seminariyanın tələbələri sırasından xaric edilmişdir.

Seminariyanın illik hesabatlarının müqayisəli təhlili göstərir ki, 1881-1896-cı illərdə seminariyanı 123 nəfər bitirərək ibtidai məktəb müəllimi adı almışdır. Məzunlardan 8-i rus, 10-u gürcü, 67-si erməni, 25-i azərbaycanlı, 2 -si dağlı olmuşdur.

Seminariyanın özünün, nəzdindəki ibtidai məktəbin və pansionatın (yataqxana) saxlanılması üçün yerli büdcədən illik 28173 rubl vəsait ayrılmışdır.

Seminariyada tədris işləri Qori Müəllimlər Seminariyası üçün təsdiq edilən əsasnamə ilə tənzimləndiyindən hər iki təhsil müəssisəsinin fəaliyyətində oxşar cəhətlər çox olmuşdur.

Rusiyanın mərkəzi quberniyalarında fəaliyyət göstərən seminariyalarda olduğu kimi, İrəvan Müəllimlər Seminariyasında da yaşı on altıdan az olmayan gənclər oxuyurdu. Seminariyaya qəbul ildə bir dəfə, tədris ili başlamazdan əvvəl və yalnız birinci sinfə aparılırdı. Tələbələrə həm dövlət, həm də zemstvolar (yerli özünüidarə təşkilatı) tərəfindən təqaüd verilirdi. Dövlət tərəfindən verilən təqaüdlərinin sayı məhdud idi və ona ciddi nəzarət olunurdu. Dövlət təqaüdçüləri seminariyanı bitirdikdən sonra təlim dairəsinin popeçitelinin təyin etdiyi məktəbdə ən azı altı il ibtidai məktəb müəllimi kimi işləməli idi.



Əgər dövlət təqaüdçüsü təhsil müddətini başa vurmamış seminariyadan xaric edilərdisə, təyinat yerində xalq müəllimi kimi işləməkdən imtina edərdisə o aldığı təqaüdü xəzinəyə qaytarmalı idi.[1]

İrəvan Müəllimlər Seminariyasında təhsil müddəti 1881-1905-ci illərdə 3 illik, 1905-1918-ci illərdə isə 4 illik olmuşdur. Seminariyanın nəzdində hazırlıq sinfi, nümunəvi ibtidai məktəb fəaliyyət göstərirdi. Seminariya fəaliyyətə iki qrupla (hazırlıq qrupu və birinci sinif) başlamışdı. Hər il hazırlıq qrupuna və birinci sinfə şagird qəbulu elan edilirdi. Şagirdlərin II və III siniflərə birbaşa qəbuluna icazə verilmirdi. İbtidai məktəb müəllimi olmaq istə-

[1]**Фальборк Г.,Чарнолуский В.** Настольная книга по народному образованию. Законы, распоряжения, инструкции, уставы, справочные сведения и пр. Т. II. СПб.: «Знание», 1901, с.1158-1159

yənlər progimnaziyanın ikinci sinfinin proqramına uyğun olaraq ilahiyyat, rus dili, hesab, həndəsə, coğrafiya, tarix və biologiya fənlərindən imtahan verməli olurdular.



*İrəvan Müəllimlər Seminariyasının müəllimləri və məzunları (1902)*

Qafqaz Tədris Dairəsinin popeçiteli K.Yanovski hesabatında 1890-cı ilə kimi İrəvan Müəllimlər Seminariyasının 69 nəfər məzunu olduğunu bildirir[1]. Həmin məzunların 12 nəfəri seminariyanı son ildə bitirmişdir. 69 nəfər məzundan 12-si azərbaycanlı idi.

Seminariyaya qəbulun şərtləri ağır idi. Kənd müəllimlərinə ciddi ehtiyac olsa da, seçimdə heç kimə güzəşt edilmirdi. 1890-cı ildə seminariyaya qəbul üçün sənəd verən 45 nəfərdən yalnız 28-i[2] (62,2%) seçilmişdi.

[1] Отчеть попечителя Кавказскаго учебнаго округа : состоянии учебныхъ заведений за 1890 год.- Тифлись, 1891, таблица №151

[2] Yenə orada, cədvəl 169

1896-cı ilə kimi seminariyanın cəmi 130 məzunu olub ki, onlardan da 7-si seminariyanı həmin il bitirmişdir. 1896-cı ildə seminariyanın hazırlıq sinfinə 17 nəfər qəbul olunub, 1 nəfər xaric edilib.

XX əsrin əvvəllərində seminariyada oxuyan azərbaycanlı tələbələrin sayı əvvəlki illərlə müaqayisədə artmağa başladı. Bunun müxtəlif səbəbləri vardı. *Birincisi,* Rusiyada baş verən ictimai-siyasi hadisələr, xüsusilə 1905-1907-ci illər inqilabı nəticəsində məktəb təhsilində demokratikləşmənin ilkin rüşeymləri cücərməyə başlamışdı. *İkincisi,* seminariyanın direktoru M.A.Miropiyevdən sonra bu təhsil ocağına rəhbərlik edənlər *(İvan Andreyeviç Pasyuteviç, Aleksey Martinov Zazuboviç, Sergey Nikolayeviç Streletski və Valentin Vasilyeviç Dobrotin*) burada demokratik mühit yaratmağa nail ola bilmişdilər. *Üçüncüsü,* azərbaycanlı tələbələri seminariyaya cəlb etmək üçün əlavə 20 təqaüd təsis edilmişdi.


№ 79. 1908 Г. №

По Архиву

ГОСУДАРСТВЕННАГО СОВѢТА

ФИНАНСОВОЙ КОММИСІИ.

ДѢЛО

объ отпускѣ изъ средствъ государственнаго казначейства по 2.600 р. въ годъ на учрежденіе при Эриванской учительской семинаріи 20 стипендій для воспитанниковъ-татаръ, о дополнительномъ ассигнованіи по 140 р. въ годъ на вознагражденіе учителя пѣнія при названной семинаріи и о преобразованіи одноклассного начальнаго училища при сей семинаріи въ двухклассный составъ, съ дополнительнымъ ассигнованіемъ на его содержаніе по 970 р. въ годъ.
(Сессія III)

Началось 25 Мая 1908 года.

Кончено 11 Іюня 1908 года.

на 24 листахъ

ЦГИАЛ
Фонд № 1158 опись 1-1908
Ед. хр. № 79

*Dövlət Şurasının maliyyə komissiyasının təqaüdlə bağlı qərarı*

Erməniپərəstliyi ilə məşhur olan Qafqaz canişini qraf Vorontsov-Daşkovun 1905-1910-cu illərə aid hesabatında İrəvan Müəllimlər Seminariyasında tatarlar (azərbaycanlılar -F.R) üçün 20 təqaüdün təsis edildiyi bildirilir.[1]

Araşdırma zamanı məlum oldu ki, bu məsələ III Dövlət Dumasında müzakirə edilərək İrəvan Müəllimlər Seminariyası ilə bağlı iki mühüm qərar qəbul edilib: 1) azərbaycanlı tələbələr üçün ildə 2600 rubl həcmində 20 təqaüdün və musiqi müəlliminin mükafatlandırılması üçün 140 rublun ayrılması; 2) seminariyanın nəzdindəki birsinifli ibtidai



[1] РГИА. Ф. 391. Оп. 4. Д. 563. 1910. Л. 4.

məktəbin ikisinifli məktəbə çevrilməsi və onun saxlanılması üçün xəzinədən ildə 930 rublun ödənilməsi[1].

Birsinifli məktəbin ikisinifli məktəbə çevrilməsi nəticəsində yeni bir sinif müəllimi və əl əməyi müəllimi ştatı təsis edildi. 1908-ci ildən əl əməyinin tədrisi birinci sinif müəlliminə həvalə olundu. Onun əməkhaqqının doqquzuncu, ikinci sinif müəlliminin əməkhaqqının isə onuncu dərəcə ilə hesablanması qərara alındı.

1901-1917-ci illərdə İrəvan Müəllimlər Seminariyasında təhsil alan azərbaycanlı tələbələrin inkişaf dinamikası aşağıdakı kimi olmuşdur[2].

| İllər | Tələbələrin ümümi sayı | Azərbaycanlılar |
|---|---|---|
| 1901 | 78 | 19 (24,3%) |
| 1902 | 78 | 15 (19,2%) |
| 1903 | 70 | 10 (14,2%) |
| 1907 | 71 | 13 (18,3%) |
| 1908 | 85 | 20 (23,5%) |
| 1909 | 104 | 25 (24%) |
| 1910 | 120 | 30 (25%) |
| 1911 | 128 | 30 (23,4%) |
| 1913 | 125 | 28 (21,2%) |
| 1914 | 131 | 28 (21,4%) |
| 1915 | 105 | 19 (18%) |
| 1916 | 101 | 22 (21,8%) |
| 1917 | 106 | 23 (21,7%) |

[1] Государственная дума. Третий созыв: Стенографические отчеты. Сессия первая. Часть 1. СПб., 1908. Стб. 1097

[2] Ayrı-ayrı mənbələrdə tələbələrin ümumi sayında fərq vardır. Fərqin yaranmasının əsas səbəbi eyni tədris ilinə aid bir neçə məlumatın (dərs ilinin əvvəlinə, dərs ilinin sonuna və ilin yarısına aid) verilməsidir.

1914-cü ilin məlumatına görə, Qafqaz Tədris Dairəsində 8 kişi və 1 qadın müəllimlər seminariyası fəaliyyət göstərirdi[1]. Həmin seminariyalarda 850 kişi,122 qadın təhsil alırdı ki, onlardan da 77 nəfəri azərbaycanlı idi.

1 yanvar 1913-cü ilin məlumatına görə, İrəvan Müəllimlər Seminariyasında 125, 1 yanvar 1914-cü ilin məlumatına görə isə 131 tələbə təhsil alırdı[2]. 1914-cü ildə seminariyaya 33 nəfər tələbə qəbul edilmiş, 24-ü məzun olmuş, 3-ü tələbələr sırasından xaric edilmişdir. 83 tələbə yataqxanada yaşayırdı. 131 tələbədən 28-i (21,4%) azərbaycanlı idi.

Cənubi Qafqazdakı Qori və Kuban seminariyaları 5 illik, İrəvan seminariyası 4 illik idi. Zaqafqaziya (Qori) seminariyasının binası tədris üçün o qədər də yararlı olmasa da, İrəvan Müəllimlər Seminariyasının iki mərtəbəli tədris binası və yataqxanası var idi. Digər seminariyalardan fərqli olaraq İrəvan Müəllimlər Seminariyası 1665 rubl çox vəsait xərcləmişdi[3]. Seminariyanın nəzdində 1903-cü ildə yaradılan meteoroloji stansiya fəaliyyətini davam etdirirdi.



Seminariyada tədris prosesinin yüksək səviyyədə təşkilinin nəticəsi idi ki, 1913-cü ilin hesabatında[4] dərs buraxma halları çox olan seminariyaların sırasında İrəvan Müəllimlər Seminariyasının adı çəkilmir.

Qafqaz Tədris Dairəsinin popeçitelinin 1907-ci ilə aid hesabatında İrəvan Müəllimlər Seminariyasını hesabat ilinə kimi 248 nəfərin[5] bitirdiyi bildirilir. Hesabat ilində seminariyanı cəmi 7 nəfər bitirmişdi.

1914-cü ilin məlumatına görə, Qafqaz Tədris Dairəsində 8 kişi və 1 qadın müəllimlər seminariyası fəaliyyət göstərirdi . Həmin seminariyalarda 850 kişi,122 qadın təhsil alırdı ki, onlardan da 77 nəfəri azərbaycanlı idi.

---

[1] Отчет о состоянии учебных заведений Кавказского Учебного Округа за 1913 год.Тифлис.1914,с.51

[2] Yenə orada,s.149

[3] Yenə orada,s.52

[4] Отчет о состоянии учебных заведений Кавказского Учебного Округа за 1913 год. Тифлис.1914,с.54

[5] Отчет о состоянии учебных заведений Кавказского Учебного Округа за 1907 год.Тифлис.1914,с.206




*İrəvan Müəllimlər Seminariyasının müəllimləri və məzunları (1915)*



İrəvan Müəllimlər Seminariyasının azərbaycanlı məzunlarının sayı ilə bağlı tədqiqatçılar arasında vahid fikir yoxdur. Qafqaz Tədris Dairəsinin popeçitelinin 1913-cü ilə aid hesabatında[1] İrəvan Müəllimlər Seminariyasını 1913-cü ilə kimi 358 nəfərin (24 nəfər həmin ilin məzunu idi) bitirməsi haqqında məlumat verilir. Məzunlardan 10 nəfərinin Kuban, 11 nəfərinin Terek, 3 nəfərinin Tiflis, 3 nəfərinin Kutaisi, 260 nəfərinin İrəvan-Yelizavetpol, 4 nəfərinin Bakı-Dağıstan xalq məktəblərində müəllim işlədiyi bildirilir, 63-ü haqqında məlumat verilmir.

Hesabatdan məlum olur ki, məzunların 56-sı tatar (azərbaycanlı -F.R), 104-ü rus, 105-i erməni, 15-i gürcü, 2-si dağlı, 76-sı digər millətin nümayəndələri olmuşdur.

28 il müddətində cəmi 358 nəfərin seminariyanı bitirərək ibtidai məktəb müəllimi şəhadətnaməsi alması qəbul edilənlərlə məzunlar arasında ciddi fərqin olduğunu göstərir.

[1] Yenə orada,s.154-155



*İrəvan Müəllimlər Seminariyasının tələbələri, ibtidai məktəbin şagirdləri, müəllimlər və bir qrup valideyn (1917)*
*Sağdan: 3-cü sırada 6-cı Axund Əbülhəsən Qazızadə, 8-ci seminariyanın direktoru V.V.Dobrotin*



Bu da təbiidir. Belə ki, ayrı-ayrı illərdə xeyli tələbə ailə vəziyyətinə, səhhətinə, başqa təhsil müəssisəsinə köçürüldüyünə, təlim uğursuzluğuna və dərslərdə müntəzəm iştirak etmədiyinə görə seminariyanın tələbələri sırasından xaric edilmişdir. Məsələn, 1891-ci ildə seminariyanı cəmi 12 nəfər bitirdiyi halda, bir o qədər də tələbə seminariyadan xaric edilmişdi[1]. 1894-cü ildə seminariyanın hazırlıq sinfinə 14 nəfər qəbul edildiyi halda, ayrı-ayrı siniflərdən 5 nəfər xaric edilmişdi.

---

[1] Обзор Эриванской губернии за 1891 - Эривань: Тип. Эриван. губ. правления,1892, с.89

## Nümunə məktəbi

İrəvan Müəllimlər Seminariyasının nəzdində nümunə məktəbi - ibtidai məktəb fəaliyyət göstərirdi[1]. Ümumiyyətlə, xalq müəllimi hazırlayan seminariyaların hamısının nəzdində ibtidai məktəblər fəaliyyət göstərirdi. Qori Müəllimlər Seminariyasının nəzdində 1876-cı ildə gürcü, 1878-ci ildə erməni,1879-cu ildə rus və 1880-ci ildə müsəlman uşaqlar üçün ibtidai məktəb açılmışdır.

İrəvan Müəllimlər Seminariyasının nəzdində ikisinifli ibtidai məktəb 1882-ci ildə açılmışdır ki, buraya qəbul olunan 64 şagirddən[2] 13 nəfəri azərbaycanlı olmuşdur.

Məktəbin ilk müdiri və müəllimi *Dmitri Popov* olmuşdur. O, 1887-ci ilə kimi həmin vəzifədə işləyib. 1888-ci ildə ibtidai məktəbə müəllim təyin edilən *Nikolay Suvorov* bir il sonra isə həmin məktəbin müdiri vəzifəsinə təyin olub. O, cildçilik, M. Elimirzoyev isə xarrat və tokar sənətlərini tələbələrə öyrədirdi. Seminariyanın katibi, hesabdarı və nəğmə müəllimi Simon Kaspadze, gimnastika müəllimi Vasili Zaytsev, həkim Aleksey Zrelov idi.

1884-cü ildə ibtidai məktəbdə oxuyan şagirdlərin sayı 70 olub. 1888-ci ildə ibtidai məktəbdə təhsil alan 66 şagirdin 8-i rus , 44-ü erməni, 4-ü gürcü, 10-u azərbaycanlı olub[3]. Sonrakı illərdə ibtidai məktəbə qəbul olunan şagirdlərin sayı artıb. 1900-cü ildə ibtidai məktəbdə oxuyan 82 şagirddən 18 nəfəri azərbaycanlı olub.



1905-ci ildə ibtidai məktəbdə 44 şagird oxuyurdu ki, onların da 7 -si rus, 35 -i erməni, 1-i gürcü, 1-i yunan idi. Həmin ildə ibtidai məktəbdə azərbaycanlı uşaqların oxumaması ermənilərin azərbaycanlılara qarşı qətliam törətməsi ilə bağlı idi. İrəvan şəhərində baş verən toqquşmalar nəticəsində azərbaycanlı əhalinin böyük bir hissəsi Türkiyəyə, İrana və Azərbaycana qaçmaq məcburiyyətində qalmışdı.

---

[1]*B.Kərimov "XX əsrin əvvəllərində İrəvan şəhərində maarif sisteminin vəziyyəti" ("Tarix və onun problemləri", 2014, №2, s.105) adlı məqaləsində həmin dövrdə İrəvanda Müəllimlər İnstitutunun nəzdində ibtidai məktəbin* fəaliyyət göstərdiyini bildirir. Bu fikir yanlışdır. Belə ki, Cənubi Qafqazda XX əsrin əvvəllərində Müəllimlər İnstitutu yalnız Tiflis şəhərində yerləşirdi.

[2]Кавказский календарь на 1891 год. Главное управление главноначальствующего гражданскою частью на Кавказе, Кавказский статистический комитет. Тифлисъ. 1890, с.164

[3] Обзор Эриванской губернии за 1888 - Эривань: Тип. Эриван. губ. правления,1889, с.131

Azərbaycanlı müəllimlərin, tələbə və şagirdlərin həyatı üçün təhlükə yarandığından seminariyada da bir müddət dərslər dayandırılmış, azərbaycanlıların məktəbə getməsinə icazə verilməmişdi.

İbtidai məktəbdə ilk vaxtlar şəriət dərsini Axund Məmmədbağır Qazızadə demişdir. 1890-1892-ci illərdə ibtidai məktəbdə şəriət dərsini Məmməd Axundov tədris etmişdir.

1895-ci ildə İrəvan Seminariyasının nəzdindəki ibtidai məktəbdə N.A.Suvorov, Q.Qanbarov (keşiş), Q.Amanasyans (erməni-qrioqoryan) və Məmmədbağır Qazızadə (şəriət)[1], 1896-cı ildə N.A.Suvorov, A.İ.Sokolov (keşiş), Q.Amanasyans (erməni-qrioqoryan) və Məmmədbağır Qazızadə (şəriət) dərs deyirdilər[2]. 1899-cu ildə keşiş A.İ.Sokolovu M.K. Dobrovolski əvəz etmişdi[3]. 1900-cü ildə müəllim heyəti dəyişməmişdir.

1905-ci ildə İrəvan Müəllimlər Seminariyasının nəzdindəki birsinifli ibtidai məktəb ikisinifli məktəbə çevrildi. Məqsəd seminariyanın tələbələrinin pedaqoji təcrübəsinin səmərəliliyinin yüksəldilməsi idi.



Birsinifli ibtidai məktəbdə təhsil müddəti 3 il, ikisinifli məktəbdə 4 il idi. Rus dili və hesab birinci dərəcəli fənlər hesab edildiyindən onların tədrisinə xüsusi diqqət yetirilirdi. Ana dili, nəğmə, rəsm, təbiət və digər fənlər ikinci dərəcəli fənlər hesab edilirdi. İbtidai məktəbdə şagirdlərin ətraf aləmlə tanışlığına, sinfdənxaric tədbirlərin təşkilinə, onların fiziki, əxlaqi, estetik tərbiyəsinə mühüm əhəmiyyət verilirdi. Seminaristlər ibtidai məktəbin tədbirlərində iştirak edir, şagirdlərlə müxtəlif oyunlar təşkil edir, müəllimin ən yaxın köməkçisi rolunda çıxış edirdilər. Seminaristlər pedaqoji təcrübəni həmin məktəbdə keçirdilər.

Hazırlıq sinfində azərbaycanlı şagirdlər həftədə 5 saat rus dili, 5 saat riyaziyyat, 4 saat ilahiyyat, 2 saat tarix, 2 saat coğrafiya, 2 saat fizika, 2 saat təbiətşünaslıq, 2 saat nəğmə, 2 saat hüsnxət, 2 saat rəsm, 2 saat rəsmxət (həftədə cəmi 30 saat) keçirdilər.

---

[1]Кавказский календарь на 1895 год. Главное управление главноначальствующего гражданскою частью на Кавказе, Кавказский статистический комитет. Тифлисъ. 1894, с.270

[2]Кавказский календарь на 1896 год. Главное управление главноначальствующего гражданскою частью на Кавказе, Кавказский статистический комитет. Тифлисъ. 1895, с.287

[3] Yenə orada,s.331

Azərbaycanlı şagirdlər rus dilini, rus adət-ənənəsini, tarixini və coğrafiyasını öyrəndikdən sonra xristian uşaqları ilə birlikdə oxuyurdular. Hazırlıq sinfinə rus dilini zəif bilənlər qəbul edilirdi. Şagirdlərin hazırlıq siniflərinə daxil olması və seminariyada 4 il oxuması məcburi deyildi. Siniflər komplektləşdirilərkən şagirdlərin hazırlıq səviyyələri nəzərə alınırdı. Rus dilində danışmağı bacaran, müəyyən hazırlıq səviyyəsi olan şagirdlər birinci sinfə (birinci tədris ilinə) qəbul edilirdi. Seminaristlər 2-ci sinifdə həftədə 4 saat, 3-cü sinifdə 8 saat ibtidai məktəbdə təcrübədə olurdular.

İbtidai məktəbə 8-9 yaşlı oğlan uşaqları qəbul olunurdu. Uşaqlar valideynlərinin ərizəsi əsasında qəbul olunurdu. Qəbul olunmuş uşaqlar dövlət hesabına oxuyur, pansionda yaşayır və seminariyanın rejiminə tabe olurdular. Seminaristlər ibtidai məktəb şagirdlərinin ən yaxın dostu və böyük yoldaşı hesab olunurdu. Şagirdlər onları maraqlandıran bütün suallarla seminaristlərə müraciət edə bilərdilər. İbtidai məktəbdə aparılan bütün tərbiyəvi işlər seminaristlər tərəfindən təşkil olunurdu. Seminaristlər ibtidai məktəbdə növbətçilik edir, şagirdlərin dərslərinin hazırlanmasına, istirahətinə, ekskursiyasına və sinifdənxaric oxusuna rəhbərlik edirdilər.



İbtidai məktəb seminariya üçün bir növ laboratoriya rolu oynayırdı. Seminaristlər ixtisas və peşə biliklərini ibtidai məktəbdə tətbiq edir, pedaqoji peşəyə nə dərəcədə hazır olduqlarını müəyyənləşdirə bilirdilər.

Mətbuat səhifələrində Ordubad məktəbinin[1] seminariyanın təcrübə məktəbi olması ilə bağlı yazılanlar həqiqəti əks etdirmir. Belə ki, 1854-cü ildə açılan Ordubad birsinifli ibtidai məktəbi 1897-ci ildə ikisinifli şəhər məktəbinə[2] çevrilmişdir. Seminariyanın tələbələri şəhər məktəblərində deyil, ikisinifli kənd ibtidai məktəblərində müəllimlik etməyə hazırlanırdılar. Belə olan halda, onlar şəhər

---

[1] Keçilmiş yolun səhifələri: Ordubad şəhər ibtidai məktəbi. https: //www. google. com/ search?client=opera&q=Keçilmiş+yolun+səhifələri%3A+Ordubad+şəhər+ibtidai+ məktəbi&sourceid=opera&ie=UTF 8&oe=UTF-8

[2]Şəhər məktəbləri 1912-ci ilə kimi fəaliyyət göstərmişdir. 1912-ci ildə şəhər məktəblərinin əsasında 4 illik təhsil müddəti olan ali ibtidai məktəblər (ibtidai məktəblərdən sonra) yaradılmışdır.

məktəbində necə təcrübə keçə bilərdilər? Digər tərəfdən, İrəvan şəhərində qəza məktəbi, ibtidai məktəb və yaxınlıqda Uluxanlı kənd məktəbi olduğu halda, seminaristlərin İrəvan şəhərindən xeyli uzaqlıqda yerləşən Ordubad şəhər məktəbinə təcrübəyə aparılması real görünmür. Yanlışlığa əsas səbəb "Qafqaz təqvimi"ndə Ordubad məktəbindən bəhs edildikdən sonra İrəvan seminariyasının nəzdindəki ibtidai məktəb haqqında yazılmasıdır. İlk baxışda elə görünür ki, söhbət Ordubad məktəbindən gedir. Əslində isə seminariyanın nəzdindəki ibtidai məktəbdən, onun müəllimləri N.A.Suvorov, M.K.Kapiton, Q.Amanasyanç və Məmməd Bağır Qazızadə haqqında məlumat verilir. Həmin dövrdə Ordubad məktəbində ilahiyyat müəllimi Mirzə Yəhya Səməndərov olmuşdur.



## Seminariyanın kitabxanası və laboratoriyası

Seminariyada 2 kitabxana (fundamental və şagird kitabxanası) fəaliyyət göstərirdi. Müəllimlər və tələbələr *fundamental,* ibtidai məktəbin şagirdləri isə *şagird kitabxanasından* istifadə edirdi. 1890-cı ildə seminariyanın kitabxanasında (fundamental və şagird kitabxanasında) 3281 adda, 6916 rubl dəyərində 6791 cild kitab saxlanılırdı[1]. Həmin tədris ilində kitabxanaya 351 rubl dəyərində yeni kitab alınmışdı.

1895-ci ilin məlumatına görə, hər iki kitabxanada 3896 adda bədii və elmi kitablar, 885 adda tədris ədəbiyyatı saxlanılırdı. Kitabların alınmasına 8972 rubl vəsait xərclənmişdi[2]. Seminariyanın fizika kabineti var idi. Burada Rusiyanın mərkəzi şəhərlərindən gətirilmiş 3674 rubl dəyərində olan 319 adda cihaz var

---

[1] Отчеть попечителя Кавказскаго учебнаго округа: состоянии учебныхъ заведений за 1890 год.- Тифлись, 1891, таблица №152

[2] Обзор Эриванской губернии за 1895. Эривань: Тип. Эриван. губ. Правления.1896,с.29

idi[1]. 1896-cı ildə kitabxanada 15530 rubl dəyərində 3901 adda 8389 kitab saxlanılırdı[2].

1907-ci ildə seminariyanın kitabxanalarında 5547 adda, 11733 rubl dəyərində 9777 cild kitab saxlanılırdı. Həmin il kitabxanaya 369 rubl dəyərində yeni kitab alınmışdı. Fizika kabinetində 6533 rubl dəyərində 789 adda cihaz var idi[3].

1913-cü ildə seminariyanın kitabxanasında 6811 adda, 13593 rubl dəyərində 12082 cild kitab saxlanılırdı. 1913-cü ildə kitabxana üçün 818 rubl dəyərində kitab alınmışdı. Həmin il seminariyanın fizika kabinetində 6459 rubl dəyərində 758 adda cihaz saxlanılırdı[4].



СВИДѢТЕЛЬСТВО.

№ 569.

Отъ Педагогическаго Совѣта **Эриванской Учительской Семинаріи,** на основаніи Положенія объ учительскихъ Семинаріяхъ, дано сіе свидѣтельство воспитаннику Семинаріи Кадымову Алекберу Молла-Гусейнъ-оглы въ томъ, что онъ при отличномъ поведеніи, оказалъ успѣхи въ:

1) Законѣ Божіемъ отличные (5),
2) Педагогикѣ отличные (5),
3) Русскомъ и Церковно-славянск. языкѣ удовлетворительные (3),
4) Татарскомъ языкѣ отличные (5),
5) Математикѣ (ариѳметикѣ, геометріи и землемѣріи) отличные (5),
6) Исторіи хорошие (4),
7) Географіи отличные (5),
8) Естествовѣдѣніи отличные (5),
9) Чистописаніи хорошие (4),
10) Рисованіи и черченіи хорошие (4),
11) Практическихъ занятіяхъ въ преподаваніи хорошие (4),
12) Ручной трудъ хорошие (4).

Сверхъ того обучался: сельскому хозяйству, гимнастикѣ, пѣнію. ~~и музыкѣ.~~

Вслѣдствіе сего онъ удостоивается званія учителя начальнаго училища и при поступленіи на означенную должность имѣетъ пользоваться всѣми правами, той должности присвоенными. Обязанъ прослужить 6 лѣтъ по назначенію начальства, или же уплатить въ казну за воспитаніе 670 рублей (Шестьсотъ семьдесятъ руб.).

„5-го“ іюня 1914 года. Г. Эривань.

Предсѣдатель Педагогическаго Совѣта,
Директоръ В. Добротинъ.

Члены Педагогическаго Совѣта:

*Qədimov Ələkbər Molla Hüseyn oğluna İrəvan Müəllimlər Seminariyası tərəfindən verilmiş Şəhadətnamə*



---

[1] Yenə orada,s.29-30

[2] Обзор Эриванской губернии за 1896. Эривань: Тип. Эриван. губ. Правления.1897,с.32

[3] Отчеть попечителя Кавказскаго учебнаго округа: состоянии учебныхъ заведений за 1907 год.- Тифлись, 1908, с.206а

[4] Отчет о состоянии учебных заведений Кавказского Учебного Округа за 1913 год.Тифлис.1914,с.155

## Seminariyada təhsilin məzmunu

8 noyabr 1881-ci ildə fəaliyyətə başlayan İrəvan Müəllimlər Seminariyasında dərslər sentyabrın 16-da başlayıb mayın 31-də başa çatırdı. 181 dərs günü müəyyənləşdirilmişdi.[1]

Qeyd edək ki, Qafqaz Tədris Dairəsindəki seminariyalarda tədris ilinin başlanması və bitməsi fərqli idi. Məsələn, 1890-cı ildə Kuban Müəllimlər İnstitutunda dərslər 4 sentyabrda, Zaqafqaziya Müəllimlər Seminariyasında 1 sentyabrda, Kutaisi Müəllimlər Seminariyasında 5 sentyabrda, İrəvan Müəllimlər Seminariyasında isə, yuxarıda qeyd etdiyimiz kimi, 16 sentyabrda başlamışdır. Qeyd edək ki, dərslər bütün seminariyalarda eyni vaxtda (31 may) başa çatırdı.

### Tədris planı

Seminaristlər üç il müddətində Azərbaycan dili ilə bərabər, ilahiyyat, rus dili, riyaziyyat, tarix, coğrafiya, fizika, təbiətşünaslıq, pedaqogika, nəğmə, hüsnxət, rəsmxət, rəsm, gimnastika fənlərini öyrənirdilər. Rusiyada digər tədris müəssisələri kimi, seminariyaların da tədris planları tez-tez dəyişdirilirdi. Məsələn, 1890-cı ildə təsdiq edilən müəllimlər seminariyalarının tədris planında 1 və 2-ci siniflərdə həftədə 24, 3-cü sinifdə 20 saat tədris yükü nəzərdə tutulmuşdur.



***Müəllim seminariyalarının 1890-cı ilə aid tədris planı***

| Fənlər | Siniflər | | | Cəmi |
|---|---|---|---|---|
| | I | II | III | |
| İlahiyyat | 4 | 3 | 3 | 10 |
| Rus dili | 5 | 4 | 3 | 12 |
| Pedaqogika və metodikanın əsasları | | 2 | 2 | 4 |
| Slavyan dili | 2 | 1 | - | 3 |
| Coğrafiya | 3 | 2 | 2 | 7 |

[1] Отчеть попечителя Кавказскаго учебнаго округа: состоянии учебныхъ заведений за 1890 год.- Тифлись, 1891, таблица №164

| | | | | |
|---|---|---|---|---|
| Tarix | - | 2 | 2 | 4 |
| Təbiətşünaslıq | 2 | 2 | 2 | 6 |
| Hesab | 3 | 2 | 2 | 7 |
| Həndəsə, ölçmə, rəsmxət | 1 | 2 | 2 | 5 |
| Nəğmə | 2 | 2 | 2 | 6 |
| Hüsnxət | 2 | 2 | - | 4 |
| Cəmi: | 24 | 24 | 20 | 68 |

Gimnastika, əl əməyi və yerli dillər (Azərbaycan dili, erməni dili) fakültativ məşğələ formasında keçirilirdi.

1903-cü ildə həftəlik tədris yükləri xeyli artırıldı. Seminaristlər hazırlıq qrupunda həftədə 30, 1-ci sinifdə 31, II sinifdə 33, III sinifdə 28 saat dərs keçməli oldular.

***Müəllim seminariyalarının 1903-cü ilə aid tədris planı***

| Fənlər | Siniflər | | | | Cəmi |
|---|---|---|---|---|---|
| | Hazırlıq | I | II | III | |
| İlahiyyat | 4 | 4 | 2 | 2 | 12 |
| Rus dili | 5 | 5 | 4 | 3 | 17 |
| Riyaziyyat | 5 | 5 | 5 | 3 | 18 |
| Tarix | 2 | 2 | 2 | 2 | 8 |
| Coğrafiya | 2 | 2 | 2 | 1 | 7 |
| Fizika | 2 | 2 | 2 | - | 6 |
| Təbiətşünaslıq | 2 | 3 | 3 | 2 | 10 |
| Pedaqogika | - | - | 3 | 3 | 6 |
| Nəğmə | 2 | 2 | 2 | 2 | 8 |
| Hüsnxət | 2 | 2 | 2 | - | 6 |
| Rəsmxət | 2 | 2 | 1 | 1 | 6 |
| Rəsm | 2 | 2 | 1 | 1 | 6 |
| Məktəbdə təcrübə | - | | 4 | 8 | 12 |
| Cəmi: | 30 | 31 | 33 | 28 | 122 |

Cədvəldəki həftəlik saatlar tədris planının invariativ (məcburi) hissəsidir və bütün müəllimlər seminariyalarında olduğu kimi istifadə edilirdi. Variativ (dəyişə bilən) hissə isə yerli şəraitə uyğunlaşdırılır, yerli dillər (Azərbaycan, erməni) və könüllü olaraq xarratlıq, tərəvəzçilik, cildçilik, ipəkçilik üzrə dərslər tədris edilirdi. Tədris planının invariativ hissəsi eyni olduğundan seminariyaların hamısında eyni fənlər tədris edilir, seçim yalnız fakültativ fənlərlə bağlı olurdu.

Seminariyalarda ümumtəhsillə bağlı şagirdlərə gimnaziya və realni məktəblərlə müqayisədə verilən biliyin həcmi az olsa da, onların (məzunların) pedaqoji hazırlığı çox yüksək idi. O dövrdə qadın gimnaziyalarının 8-ci sinfində də (pedaqoji sinif) müəllimlər hazırlanırdı. Pedaqoji sinfin məzunları ümumtəhsillə bağlı geniş biliyə malik olsalar da, onların pedaqoji hazırlıqları çox zəif idi. Şəhər məktəblərinin nəzdindəki bir və ikiillik pedaqoji kursların məzunları isə nəzəri və praktik cəhətdən ibtidai məktəblərin müəllim kadrlarına olan ehtiyacını ödəyə bilmirdi.



XIX əsrin sonu, XX əsrin əvvəllərində ibtidai məktəb müəllimi və ana dili müəllimi olmağın yollarından biri də eksternat yolu idi. Ekstern[1] yolu ilə müəllim adı alanlar pedaqoji hazırlıqdan daha çox ümumtəhsil səviyyələri ilə fərqlənirdilər.

İbtidai məktəb müəllimlərinin ümumi hazırlığını yüksəltmək məqsədilə mütəmadi tədbirlər həyata keçirilir, tədris planında ümumtəhsil fənlərinin xüsusi çəkisi artırılırdı. Müəllimlər seminariyalarının 1890 və 1903-cü illərə aid olan tədris planlarını müqayisə etsək bu dinamikanı görmək mümkündür.

[1] Ekstern – [lat. externus – daxili] hər hansı bir təhsil müəssisəsində oxumadan kənarda hazırlaşaraq orada imtahanlarını verən adam.

***Müəllimlər seminariyalarının 1890 və 1903-cü illərə aid tədris planlarının müqayisəli təhlili***

| **Fənlər** | **Siniflər** | | | | **Cəmi** | **1890-cı il tədris planı (hazırlıq** | **1903-cü il tədris planı (hazırlıq** |
|---|---|---|---|---|---|---|---|
| | Hazırlıq | I | II | III | | | |
| İlahiyyat | 4 | 4 | 2 | 2 | 12 | -2 | +2 |
| Rus dili | 5 | 5 | 4 | 3 | 17 | 0 | +5 |
| Riyaziyyat | 5 | 5 | 5 | 3 | 18 | +1 | +6 |
| Tarix | 2 | 2 | 2 | 2 | 8 | +2 | +4 |
| Coğrafiya | 2 | 2 | 2 | 1 | 7 | -2 | 0 |
| Fizika | 2 | 2 | 2 | - | 6 | +4 | +6 |
| Təbiətşünaslıq | 2 | 3 | 3 | 2 | 10 | +2 | +4 |
| Pedaqogika | - | - | 3 | 3 | 6 | 0 | +2 |
| Nəğmə | 2 | 2 | 2 | 2 | 8 | 0 | +2 |
| Hüsnxət | 2 | 2 | 2 | - | 6 | +4 | +2 |
| Rəsmxət | 2 | 2 | 1 | 1 | 6 | +4 | +6 |
| Rəsm | 2 | 2 | 1 | 1 | 6 | - | +6 |
| Məktəbdə təcrübə | - | | 4 | 8 | 12 | - | - |
| Slavyan dilləri | - | - | - | - | - | -3 | -3 |
| Cəmi: | 30 | 31 | 33 | 28 | 122 | | |



Tədris planının xeyli zəngin olmasına baxmayaraq seminariyanı bitirənlər həmin dövrdə təhsillərini yalnız o qədər də yüksək statusu olmayan müəllimlər institutlarında davam etdirə bilərdilər.

1911-ci ildə Qafqaz Təlim Dairəsinin tabeliyində 8 müəllimlər seminariyası fəaliyyət göstərdiyi halda, yalnız 1 müəllimlər insti-

tutu (Aleksandrovski Müəllimlər İnstitutu)[1] var idi ki, o da Tiflisdə yerləşirdi.

Yarandığı gündən funksiyası ibtidai məktəblər üçün müəllim hazırlamaq olan seminariyalar statusuna görə, ibtidai məktəbdən yuxarı, orta məktəbdən aşağı idi.

Ona görə də XX əsrin əvvəllərində Maarif Nazirliyinin müəllimlər institutlarında və seminariyalarda müəllim hazırlığı ilə bağlı siyasəti ciddi tənqid edilirdi. Dövlətin bu siyasətini kəskin tənqid edən P.Klunnı müəllimlər institutlarının məzunlarını ***"universitetlərin bağlı qapılarını döyənlər"*** adlandırırdı.[2]

Həmin dövrdə Rusiyada və onun milli ucqarlarında kənd məktəbləri üçün müəllim kadrları hazırlığında müəllimlər seminariyaları mühüm rol oynayırdı. Bu səbəbdən də müəllim seminariyalarının sayı ildən-ilə artırdı.

Müəllimlər seminariyaları Rusiyada pedaqoji təhsilin ən kütləvi formasına çevrilmişdi. Seminariyada pulsuz peşə təhsilinin verilməsi bu təhsil müəssisələrinin kasıb əhali, xüsusilə də kəndlilər arasında cəlbediciliyini artırmışdı. Digər tərəfdən ***kənd müəllimləri vergidən və hərbi qulluqdan azad edilirdi*** ki, bu da onların sosial vəziyyətinin yaxşılaşmasına xeyli dərəcədə təsir göstərirdi.



Bu səbəbdən də seminariyaların statusu, strukturu və orada təhsilin məzmunu məsələsi ciddi müzakirə olunan məsələlərdən birinə çevrilmişdi.

1917-ci ilin avqust ayının 3-dən 8-nə kimi Moskvada Ümumrusiya müəllimlər seminariyalarının direktorlarının və nümayəndələrinin iştirakı ilə qurultay keçirildi. Qurultayda Dövlət komitəsinin

---

[1] Aleksandrovski Müəllimlər İnstitutu Tiflisdə 1866-cı ildə məktəb kimi açılmış, 1872-ci ildə Müəllimlər İnstitutuna çevrilmişdir. Həmin dövrdə müəllim institutlarının əsas vəzifəsi şəhər və ya qəza ali ibtidai məktəbləri üçün müəllimlər hazırlamaqdan ibarət idi. İnstitutda təhsil müddəti 4 il idi. İnstitutda 1906-cı ildə 105, 1911-ci ildə 114 tələbə təhsil almışdır. İnstitutun fəxri qəyyumu tanınmış Azərbaycan xeyriyyəçisi və neft sənayeçisi *Şəmsi Əsədullayev* olub. *Sergey Viktoroviç Streletski, Aleksandr Martınoviç Zazubov* ayrı-ayrı illərdə institutun direktoru vəzifəsində çalışıblar. "Azərbaycanda xalq maarifi (1920-1927)" kitabında Aleksandrovski Müəllimlər İnstitutunu 15 nəfər azərbaycanlı müəllimin bitirdiyi bildirilir.

[2] **Клунный П.** Окончившие учительские институты стучатся в закрытую дверь университета // Русская школа. 1908. № 3. – с. 116–117.

üzvü N.N.İordanskinin müəllimlər seminariyalarının statusunda və tədris planında dəyişiklikləri nəzərdə tutan qanun layihəsi müzakirə edilərək təsdiq olundu. Qurultay müəllimlər seminariyaları üçün aşağıdakı tədris planını təsdiq etdi.

***Müəllim seminariyalarının 1917-ci ilə aid tədris planı***

| **Tədris fənləri** | **Siniflər** | | | | | **Cəmi** |
|---|---|---|---|---|---|---|
| | **Haz.s I s.** | **Is. II s.** | **II s. IIIs.** | **III s. IV s.** | **IV s V s.** | |
| İlahiyyat | 2 | 2 | 2 | 1 | 1 | 8/6 |
| Pedaqogika | -/2 | -/2 | 2/3 | 3/3 | 3/4 | 8/14 |
| Rus dili | 5 | 4 | 5 | 5 | 4 | 23/18 |
| Riyaziyyat | 3 | | | 2 | 2 | 7/4 |
| Cəbr | 2 | 3 | 3 | 1 | - | 9/7 |
| Həndəsə və triqonometriya | 2 | 2 | 2 | 2 | 1 | 9/7 |
| Tarix | 2 | 3 | 3 | 3 | 4/2* | 15/13 |
| Coğrafiya | 2 | - | 2 | 2 | 3 | 9/7 |
| Kosmoqrafiya | - | - | - | - | 1 | 1 |
| Təbiətşünaslıq və kimya | 6 | 5 | 3 | 4 | 2 | 20/14 |
| Fizika | - | 3 | 2 | 2 | - | 7 |
| Gigiyena | - | - | - | - | 2 | 2 |
| Nəğmə və musiqi | 2 | 3 | 2 | 2 | 2 | 11/9 |
| Qrafik incəsənət | 3 | 3 | 2 | 2 | 1 | 11/8 |
| Əl əməyi | 2 | 2 | 2 | 2 | | 8/6 |
| Fiziki tapşırıqlar | 2 | 2 | 2 | 2 | | 9/7 |
| Praktik dərslər | - | - | - | - | 6 | 6 |
| Seçmə dərslər | - | - | - | - | 3 | 3 |
| Cəmi: | 33<br>35 | 32<br>34 | 32<br>33 | 33<br>33 | 36<br>37 | 166/133<br>172 |
| Kənd təsərrüfatı | - | - | 1 | 1 | 2 | 4 |

**Tədris ilinin ikinci yarısında 2 saat "Qanunşünaslıq" üçün nəzərdə tutulmuşdur.*

Tədris planına daxil olunan fənlər həm ikisinifli məktəbin, həm də ali ibtidai məktəbin məzmununu tam əhatə edirdi. Seminaristlər rus dili, hesab, həndəsə, tarix, təbiətşünaslıq fənlərinin tədrisi metodikasını öyrənir, seminariyanın nəzdindəki məktəbdə sınaq dərsləri deyir, gimnastika (fiziki tərbiyə) fənnində uşaq oyunları ilə tanış olurdular. Digər seminariyalarda olduğu kimi İrəvan Müəllimlər Seminariyasında da tələbələr kənd təsərrüfatı fənlərini (bağçılıq, bostançılıq) öyrənirdilər.

Seminariyaların statusunun yüksəldilməsi tədris planlarının təkmilləşdirilməsinə, ümumtəhsil fənlərinin xüsusi çəkisinin artmasına səbəb oldu. Müəllimlər seminariyalarının nəzdində bir və ya ikiillik hazırlıq siniflərinin, tələbələrin sayına uyğun olaraq paralel siniflərin və yataqxananın açılmasına icazə verildi. Hazırlıq siniflərinə ikisinifli ibtidai məktəbin, birinci sinfə isə yalnız ali ibtidai məktəbin və ya ona bərabər tutulan təhsil müəssisələrinin məzunları qəbul oluna bilərdi.



## Tədris proqramı

İrəvan Müəllimlər Seminariyasında ana dili və ilahiyyat fənlərindən başqa bütün fənlər Xalq Maarif Nazirliyinin tövsiyə etdiyi proqramlar əsasında tədris olunurdu. Tədris ili eyni olan seminariyaların hamısında tədris edilən ayrı-ayrı fənlərin proqramları eyni idi. Yalnız məcburi olmayan fənlərin proqramı seminariyanın müəllimləri tərəfindən hazırlanır və quberniya xalq məktəbləri direksiyasının inspektoru tərəfindən təsdiq edilirdi. İlk vaxtlar İrəvan Müəllimlər Seminariyasının ana dili və ilahiyyat fənlərinin proqramı Axund Məmmədbağır Qazızadə tərəfindən hazırlanmış, Pedaqoji Şurada və quberniya xalq məktəbləri direksiyasında təsdiq olunmuşdu. Bu proqramlar Zaqafqaziya (Qori) Müəllimlər Seminariyasının Azərbaycan şöbəsində istifadə olunan proqramlarla, əsasən eyni idi.

Sonrakı illərdə İrəvan kişi gimnaziyasının ana dili müəllimlərinin (Mirzə Elxanov, Firidun bəy Köçərli, Mirzə Məmmədvəli Qəmərlinski və b.) hazırladıqları ana dili proqramlarından istifadə olunurdu.

Bu proqramların içərisində F.B.Köçərlinin "Azərbaycan dili proqramı" xüsusilə fərqlənirdi. F.B.Köçərli yazırdı: "***Ana dili millətin mənəvi diriliyidir, həyatın mayəsi mənziləsindədir. Ananın südü bədənin mayəsi olduğu kimi, ananın dili də ruhun qidasıdır.*** *Hər kəs öz anasını və vətənini sevdiyi kimi, ana dilini də sevir... Bu (yəni ana dili –F.R), Allahtaalanın gözəl nemətlərindən birisidir, onu əziz və möhtərəm tutmaq hər kəsə borcdur*"[1]. Millətin tərəqqisində ana dilinin rolunu yüksək dəyərləndirən F.B.Köçərli o dövr üçün mükəmməl bir "Azərbaycan dili" proqramı hazırlamışdır.

Həmin proqramın tam mətnini əldə edən akademik Hüseyn Əhmədov bu xüsusda yazırdı: "*Məktəb təhsili tarixində Azərbaycan dilinin tədrisinə dair hazırlanmış proqramlar içərisində F.B.Köçərlinin proqramı özünün elmiliyi və əhatə dairəsinin genişliyi ilə diqqətə layiqdir*"[2].

Proqram aşağıdakı hissələrdən ibarətdir: giriş hissəsi, hazırlıq sinfi, yazılı təmrinlər[3] (A.O.Çernyayevskinin "Vətən dili" dərsliyi əsasında), birinci sinif, ikinci sinif.



İrəvan Müəllimlər Seminariyasının Azərbaycan dili müəllimləri Rəhim Xəlilov, Həmid bəy Şahtaxtlı və Mirzə Cabbar Məmmədzadə də müəyyən təkmilləşdirmə işi aparmaqla həmin proqramdan istifadə etmişlər.

## Tədris ədəbiyyatı

XIX əsrin ikinci yarısından başlayaraq Cənubi Qafqaz məktəblərində gimnaziyada və müxtəlif tipli ibtdai məktəblərdə Azərbaycan dilinin tədrisi bu sahədə tədris ədəbiyyatının hazırlanmasını və nəşrini zəruri etmişdi. Azərbaycan dilinin öyrənilməsinə xidmət edən ilk vəsait Nikolay Dementyevə aiddir. O, Azərbaycan dilinin "Yazı

[1] **Köçərli Firidun bəy.** Əsərləri. Bakı, Elm və təhsil, 2013, s.283.

[2] **Əhmədov H.** Maarif fədailəri.Bakı:ADPU,2013, s.97-103

[3] Təkrar etdirə-etdirə alışdırma, öyrətmə; təkrar edə-edə alışma, öyrənmə. Bu məqsədlə tələbələrə yazılı tapşırıqlar (misal, məsələ, çalışma) verilirdi.

nümunələri"ni (Əlifba) və ilk oxu üçün "Təmsillər və povestlər" kitablarını tərtib etmişdir. Hər iki kitab Qafqaz hakimi tərəfindən bəyənilərək istifadəsi tövsiyə edilmişdir.

K.D.Uşinskinin "Vətən dili" kitabının nəşrindən sonra Qafqazda yaşayan xalqların maarifçiləri də həmin nümunədə ana dili kitabları tərtib etməyə başladı. İrəvan kişi gimnaziyasının ana dili müəllimi Mirzə Elxanov[1] 1880-ci ildə "Azərbaycan dili əlifbası" dərsliyini hazırlamışdır. Həmin dərsliyin əlyazması İrəvan gimnaziyasının inspektoru tərəfindən 1880-ci il noyabrın 28-də 455 saylı məktubla Qafqaz Tədris Dairəsinin popeçitelinə göndərilmişdir. Həmin məktubda deyilir: *"İrəvan gimnaziyasının tatar (Azərbaycan-F.R.) dili müəllimi M.Ə.Elxanov K.D.Uşinskinin "Vətən dili" dərsliyi nümunəsində tərtib etdiyi və tatar əlifbası ilə yazılmış "Tatar dili" dərsliyini mənə təqdim edərək Siz cənablara təqdim etməyi və əgər bu kitab bəyənilərsə QTD tabeliyində olan və tatar dili öyrədilən məktəblərdə ondan istifadə edilməsinə sərəncam verməniz xahiş edirəm".*[2]



Həmin dərslik QTD-nin popeçiteli K.Yanovski tərəfindən 1880-ci ilin dekabrın 10-da rəy üçün Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan bölməsinin inspektoru A.O.Çernyayevskiyə göndərilir. Akademik H.Əhmədovun araşdırmalarına görə[3], A.O.Çernyayevski həmin dərsliyə 12 səhifəlik müsbət rəy yazmışdır. Sonra M.Ə.Elxanovun dərsliyi, A.O.Çernyayevskinin rəyi və onunla bağlı İrəvan gimnaziyasının inspektorunun məktubu Sankt-Peterburqa - Rusiya Xalq Maarif Nazirliyinə göndərilmişdir. Rusiya Xalq Maarif Nazirliyinin Elmi Şurasında müzakirə olunan dərsliyə Sankt-Peterburq Universitetinin Şərq fakültəsinin dosenti V.Simirnov da müsbət rəy vermişdir. 1885-ci ildə M.Ə.Elxanov vəfat etdiyindən dərsliyin nəşri baş tutmamışdır.

---

[1] **Mirzə Ələkbər Elxanov** 1828-ci ildə İrəvan şəhəri yaxınlığındakı Uluxanlı kəndində anadan olmuşdur. İrəvan şəhərindəki baş məscid nəzdindəki ruhani məktəbini bitirmiş, sonra isə rus dilini öyrənmiş, 1856-cı ildə Tiflis gimnaziyasında imtahan verərək Azərbaycan dili müəllimi adını almışdı. XIX əsrin ortalarında Tiflisdə imtahan verərək rəsmi müəllimlik hüququ alan ilk azərbaycanlıdır.1885-ci ilin martın 31-də vəfat etmişdir.

[2] Bax:**Əhmədov H**.Azərbaycan məktəb və pedaqoji fikir tarixi. Bakı: Elm və təhsil, 2014, s130

[3] Yenə orada ,s.131



РОДНАЯ РѢЧЬ.

Часть I.

ТАТАРСКАЯ АЗБУКА

АДЕРБЕЙДЖАНСКАГО НАРѢЧІЯ.

СОСТАВЛЕННАЯ ПО ЗВУКОВОМУ СПОСОБУ,

ервые уроки чтенія, образцы рисованія и прописи

ПО ГЕНЕТИЧЕСКОМУ МЕТОДУ.

Сост. А. О. Черняевскій.

Бывшій Инспекторъ Татарскаго Отдѣленія Закавказск. Учит. Семинаріи.

остановленіемъ Попечительскаго Совѣта Кавказскаго учебнаго округа, утвержденнымъ Г. Главноначальствующимъ, рекомендовано въ качествѣ учебнаго руководства для татарскихъ училищъ Кавказскаго учебнаго округа.

зданіе 7-е. дополненное иллюстраціями при жизни самимъ авторомъ и разработанное законоучителемъ Закавказск. Учит. Семинаріи Фридунъ-бекомъ Кочарлинскимъ.

цѣна 35 коп.

ТИФЛИСЪ 1910 г.

Литогр. Т-ва Левитъ и Месникъ. — Типограф. Гр. тов.



РОДНАЯ РѢЧЬ.

Часть II.

КНИГА ДЛЯ НАЧАЛЬНАГО ЧТЕНІЯ

И ПИСЬМЕННЫХЪ УПРАЖНЕНІЙ

НА

ТАТАРСКО-АДЕРБЕЙДЖАНСКОМЪ НАРѢЧІИ.

Сост. А. О. Черняевскій и С. А. Велибековъ.

Постановленіемъ Попечительскаго Совѣта Кавказскаго учебнаго округа, утвержденнымъ Г. Главноначальствующимъ, рекомендовано въ качествѣ учебнаго руководства для татарскихъ начальныхъ училищъ Кавказскаго учебнаго округа.

ЦѢНА 60 КОП.

ТИФЛИСЪ. 1888.



*A.O.Çernyayevskinin "Vətən dili" dərsliklərinin üz qabığı*

İrəvan Müəllimlər Seminariyasında A.O.Çernyayevskinin "Vətən dili" dərsliyinin nəşrinə kimi M.Ə.Elxanovun dərsliyinin əlyazmasından istifadə olunmuşdur. "Sövtü üsul" ilə nəşr olunan ilk kitab A.O.Çernyayevskinin "Vətən dili" dərsliyidir. A.O.Çernyayevski öz tələbəsi Rəşid bəy Əfəndiyevin gözəl xəttindən istifadə edərək "Vətən dili" (I hissə) kitabını ona yazdırmış və 1882-ci ildə daş basmasında basdırmışdır. Kitabın hazırlanmasında A.O.Çernyayevskinin tələbəsi olmuş Səfərəli bəy Vəlibəyov və Şuşada müəllimlik edən şair Həsənəli Qaradağı yaxından iştirak etmişdir. Aleksey Osipoviç Çernyayevskinin və Səfərəli bəy Vəlibəyovun birlikdə hazırladıqları "Vətən dili" kitabının ikinci hissəsi 1888-ci ildə nəşr olunmuşdur. İrəvan Müəllimlər Seminariyasında və onun nəzdindəki ibtidai məktəbdə uzun müddət bu kitablardan istifadə edilmişdir.

Sonrakı illərdə İrəvan maarifçiləri həm gimnaziya və seminariyada, həm də rus-tatar (Azərbaycan-F.R.) məktəblərində istifadə edilən 3 hissəlik "Ana dili" kitabı yazdılar.

47 səhifədən ibarət olan birinci kitab 1908-ci ildə Tiflisdə "Qeyrət" mətbəəsində Rəfizadə Mirzə Yusif, Mirzə Qəmərlinski, Haşım bəy Nərimanbəyov, Həmid bəy Şahtaxtinski, Rəcəbov, Qazıyev, Məhəmmədov və Cəfər Cəfərbəyovun müəllifliyi ilə nəşr edilmişdir.

72 səhifəlik ikinci kitab da 1907-ci ildə Tiflisdəki "Qeyrət" mətbəəsində Mirzə Qəmərlinski, Haşım bəy Nərimanbəyov, Həmid bəy Şahtaxtinski, Rəcəbov, Qazıyevlər, Məhəmmədov, Şəfibəyov, Sultanov və Mirzə Ələkbər Mirzəzadənin müəllifliyi ilə nəşr edilmişdir.

89 səhifəlik üçüncü kitab da 1907-ci ildə Tiflisdə "Qeyrət" mətbəəsində Mirzə Qəmərlinski, Haşım bəy Nərimanbəyov, Həmid bəy Şahtaxtinski, Rəcəbov, Qazıyevlər, Məhəmmədov, Şəfibəyov, Sultanov və Mirzə Ələkbər Mirzəzadənin müəllifliyi ilə nəşr edilmişdir.




АНА ДИЛИ.

(Родное Слово).

ПЕРВАЯ КНИЖКА.

СОСТАВИЛИ

учителя эриванскихъ училищъ:

Цѣна 20 коп., въ переплетѣ 30 коп.

Продается въ Эриванскомъ Русско-Татарскомъ училищѣ и во всѣхъ книжныхъ магазинахъ на Кавказѣ.



*"Ana dili". 1-ci kitab*

İrəvan müəllimlərinin hazırladığı "Ana dili" kitabının birinci hissəsi 1911-ci ildə Tiflisdə "Kultura" nəşriyyatı tərəfindən təkrar nəşr edilmişdir. 48 səhifədən ibarət olan kitabın müəllifləri Mirzə Qəmərlinski, Nərimanbəyov, Şahtaxtinski, Rəcəbov, Qazıbəyovlar, Şəfibəyov, Mirzə Ələkbər Mirzə Abdulla oğlu Cəfərbəyov, mühərriri Mirzə Şəfi Rəfizadə Təbrizli olmuşdur.

Şəriətlə bağlı proqram Axund Məmmədbağır Qazızadə tərəfindən hazırlanmışdı. Zaqafqaziya Ruhani İdarəsinin sədri Axund Əhməd Hüseynzadə tərəfindən bəyənilən proqram Qori Müəllimlər

Seminariyasının müsəlman şöbəsində istifadə edilən proqramdan ciddi şəkildə fərqlənmirdi.

## Seminariyada təlimin təşkili

İrəvan Müəllimlər Seminariyasında təlimin əsas təşkili forması ***sinif-dərs sistemi*** idi. Dərsin təşkilində daha çox üstünlük kombinəedilmiş (mürəkkəb) dərs tipinə verilirdi. Kombinəedilmiş dərslərdə eyni vaxtda bir neçə təlim məqsədini reallaşdırmaq mümkün idi: tələbələrə verilən tapşırıqların yoxlanılması, aydın olmayan məsələlərin yenidən izahı, tapşırıqların müxtəlif tələbələr tərəfindən təkrarı, yeni mövzunun keçilmiş mövzu ilə əlaqələndirilməsi, yeni mövzunun izahı, tələbələrin yeni mövzu ilə bağlı tapşırıqları icra etməsi, ev tapşırıqlarını həll etmək üçün zəruri bacarıq və vərdişlərin qazanılması, tələbələrin fərdi qaydada qiymətləndirilməsi və s.



Digər müəllimlər seminariyalarında olduğu kimi, burada da ***təlimin təşkilinin köməkçi formalarından*** (ekskursiya, ev tapşırıqları, fakültativ məşğələ, əlavə dərslər) səmərəli istifadə olunurdu. Rüblər üzrə müəyyənləşdirilən ***ev tapşırıqları*** Pedaqoji Şurada təsdiq olunurdu. Ev tapşırıqları təlim prosesində qazanılan bilik və bacarıqların möhkəmlənməsinə və dərinləşməsinə kömək edirdi.

Fərdi və qrup şəklində təşkil edilən ***əlavə dərslər*** yaxşı mənimsənilməyən mövzuların öyrədilməsinə xidmət edirdi. Üzrlü və ya üzrsüz səbəbdən dərsdə iştirak etməyən tələbələrə mənimsəmədiyi mövzunu fərdi qaydada əlavə dərsdə öyrənməsinə imkan yaradılırdı. Əlavə dərslər fərdi məsləhətlərlə sıx bağlı idi. Tələbələr həm sinif mürəbbisindən, həm də növbətçi müəllimdən ***məsləhət*** ala bilərdi.

Əsas fənlərlə paralel təşkil olunan ***fakültativ məşğələlər*** tələbələrdə ixtisas fənləri ilə bağlı biliklərin dərinləşməsinə, bacarıq, vərdiş və yaradıcılıq qabiliyyətlərinin inkişafına kömək edirdi. Yuxarıda da qeyd etdiyimiz kimi, İrəvan Müəllimlər Seminariyasında peşə fənləri ilə yanaşı, Azərbaycan və erməni dilləri də fakültativ şəkildə öyrədilirdi.

Seminaristlərin elmi və pedaqoji mövzuda ***referat*** yazmalarına xüsusi diqqət yetirilirdi. Referat yazan tələbələr sərbəst şəkildə elmi ədəbiyyatı araşdırır, təhlil edir, mövzu ilə bağlı öz fikirlərini şərh edirdi. Həftənin hər 6-cı günü direktorun, sinif mürəbbisinin və fənn müəlliminin iştirakı ilə tələbələrin yazdığı referat işi müzakirə olunurdu. Referat işi tələbələrdə pedaqoji işə maraq yaratmaqla yanaşı, onların əqli imkanlarını genişləndirirdi. *İnşa və referat yazmaq, mövzu ilə bağlı verilən materialı konspektləşdirmək* tədris prosesinin vacib hissəsi hesab olunurdu.

Seminariyada ***ekskursiyalardan*** geniş istifadə olunurdu. Məqsəd ətraf aləmi öyrətmək, İrəvan şəhərinin tarixi, mədəniyyəti, maddi dəyərləri, fauna və florası ilə tələbələri tanış etmək idi. Ekskursiya tələbələrin idraki imkanlarını genişləndirməklə yanaşı, onlarda müəllimlik peşəsinə dərin marağın yaranmasına kömək edirdi. Ekskursiya təlimin təşkilinin səmərəli formalarından biri hesab olunurdu. Ekskursiya təlimin elmi səviyyəsinin, praktik istiqamətinin yüksəldilməsini təmin etməklə yanaşı təlimin həyatla əlaqəsini təmin edirdi.



Tələbələrin ekskursiyası İrəvan quberniyasının ərazisi ilə məhdudlaşmırdı. Cənubi Qafqazın zəngin fauna və florası və tarixi yerləri ilə tələbələri tanış etmək məqsədilə həmin ərazilərə ekskursiyalar təşkil edilirdi. Tələbələr seminariyanın direktoru S.N.Strelskinin rəhbərliyi ilə 17 iyun-11 iyul 1910-cu il tarixlərində Moskva şəhərində ekskursiyada olmuşdular[1].

1913-cü ildə seminariyanın 123 tələbəsi 5 müxtəlif yerdə ekskursiyada olmuşdular[2].

Ümumiyyətlə, təlimin təşkilinin köməkçi formaları tələbələrdə ətraf aləm haqqında tam təsəvvür yaratmaqla yanaşı, onlarda yaradıcı qabiliyyətlərin və mənəvi aləminin inkişafına güclü təsir göstərirdi.

[1] **Стрелецкий С.Н.** Об экскурсии воспитанников Эриванской учительской семинарии в гор. Москву, совершенной 17-го июня - 11 июля 1910 г.// Экскурсии учащихся Кавказского учебного округа в 1909-1911 гг. Вып. 3. Тифлис, 1912. С. 435-444.

[2] Отчет о состоянии учебных заведений Кавказского Учебного Округа за 1913 год.Тифлис. 1914,с.169

## Seminaristlərin pedaqoji təcrübəsinin təşkili

Seminariyada gələcək ibtidai məktəb müəllimlərinin peşə hazırlığında pedaqoji təcrübənin təşkilinə xüsusi əhəmiyyət verilirdi. Seminaristlər təhsil müddətində pedaqoji peşəyə həm nəzəri, həm də praktik cəhətdən hazırlanırdı. Təlim prosesində tələbələr mütərəqqi pedaqoji ideyalarla tanış olur, fənlərin tədrisi metodikasını mənimsəyir, didaktika ilə bağlı mühazirələrdə və nümunə dərslərində iştirak edirdilər.

Məsələn, pedaqogika kursunda şagirdlərin əqli inkişafı məsələləri, təlimdə əyaniliyin rolu, əxlaqi tərbiyə, didaktika, ibtidai təhsilin məzmunu, ibtidai məktəblər üçün əsas normativ sənədlər və s. öyrədilirdi. Musiqi dərslərində skripkada çalmaq öyrədilirdi. Tələbələr təlim prosesində mənimsədikləri pedaqoji bilik, bacarıq və vərdişləri pedaqoji təcrübə müddətində daha da inkişaf etdirərək əsl xalq müəllimi kimi yetişirdilər.

Seminaristlərin pedaqoji təcrübəsi İrəvan Müəllimlər Seminariyasının nəzdindəki ibtidai məktəbdə təşkil olunurdu. 1917-ci ildə seminariyalara orta məktəb statusunun verilməsi ibtidai məktəb müəllimi hazırlığına verilən tələbləri artırdı. Pedaqoji təcrübənin ikisinifli məktəbdə keçirilməsi nəzərdə tutulduğundan seminariyanın nəzdindəki ibtidai məktəb ikisinifli məktəbə çevrildi.



Tədris planında pedaqoji təcrübəyə xüsusi yer ayrılırdı. I sinifdə nəzəri fənlər, II və III siniflərdə praktik fənlər və pedaqoji təcrübə keçirilirdi. Hər bir tələbənin 4 fəndən 5 və ya 6 sınaq dərsi (cəmi 20 dərs ) keçməsi məcburi idi.

1903-cü ildə təsdiq olunan müəllimlər seminariyalarının tədris planına görə, tələbələr II sinifdə həftədə 6 saat, III sinifdə 8 saat məktəbdə pedaqoji təcrübədə olurdular.

II sinif tələbələri praktik məşğələdə öyrəndikləri mövzuları (dərsliklərin təhlili, nümunə dərslərinin icmallarının tərtibi, ilk nümunə dərsi) pedaqoji təcrübədə tətbiq edirdilər.

III sinfin pedaqoji təcrübəsinə aşağıdakılar daxil idi:

a) ibtidai məktəb müəllimini əvəz etməyi bacarmaq;

b) ibtidai məktəbdə müstəqil dərs aparmaq;

c) dərslərin təhlilinə həsr edilmiş konfranslarda iştirak etmək;

ç) ibtidai məktəbin hər üç qrupunda sınaq dərsləri aparmaq.

Tələbələrin təlim prosesində təhlil etməli olduqları ibtidai sinif dərslikləri və vəsaitlər Pedaqoji şura tərəfindən tövsiyə olunurdu. Praktik məşğələlərdə tələbələr təhlil etdikləri dərsliklər və vəsaitlər haqqında tədris ilinin birinci yarısında hesabat verirdilər. Bu hesabatları dinləmək üçün məktəb direktorunun, fənn müəlliminin və ibtidai məktəb müəllimlərinin iştirakı ilə konfranslar təşkil olunurdu. Hər bir tələbənin dərsliklərlə bağlı hesabatı ciddi müzakirə edilirdi. Tələbələrin hesabatları təxminən aşağıdakı plan üzrə hazırlanırdı:

1) dərsliyin məzmunu;
2) materialın yerləşdirilməsindəki ardıcıllıq;
3) dərsliyin üstün cəhətləri;
4) dərsliyin çatışmayan cəhətləri;
5) müəllimin dərslikdən istifadə edə bilməsi və s.

Tələbələr hesabatlarında dərsliyin məziyyətləri haqqında danışmalı, tənqidi qeydlərini, istək və arzularını əsaslandırmalı, direktorun, fənn müəllimlərinin suallarına ətraflı cavab verməli olurdular. Yekunda isə fənn müəllimi deyilənləri ümumiləşdirirdi. Hesabat zamanı əsas diqqət tələbələrin həmin dərsliyi hansı səviyyədə mənimsəməsinə yönəldilirdi.



II sinif tələbələri pedaqoji təcrübə dövründə bir neçə dərsin (yazı, oxu, təlimdə əyanilikdən istifadə və say haqqında) icmalını təqdim etməli idilər. Tələbələrin hazırladıqları icmallar pedaqogika dərslərində müzakirə edilir, ən yaxşıları direktora təqdim olunurdu. Bundan sonra həmin tələbələrə ilk nümunə dərsi deməyə icazə verilirdi. Pedaqoji təcrübə müddətində tələbələrə şagirdlərlə işləmək bacarığı aşılanardı.

II sinifdə pedaqoji təcrübə dövründə qazanılan bacarıqlar III sinifdə həm təlim prosesində, həm də pedaqoji təcrübə dövründə inkişaf etdirilirdi. Tələbələr sonuncu tədris ilinin birinci yarısında ibtidai məktəb müəlliminin köməkçisi kimi fəaliyyət göstərirdilər.

Göründüyü kimi, tələbələr müəyyən hazırlıqdan sonra ibtidai məktəbdə pedaqoji təcrübədə olurdular. Pedaqoji təcrübənin ilk ayında tələbələr müəllimlərin dərslərini müşahidə edir, dərsin təşkilinin prinsip və metodları ilə tanış olur, sonra bir həftə ***müəllimin köməkçisi,*** bir həftə ***təcrübəçi,*** bir həftə isə ***assistent*** funksiyasını yerinə yetirirdilər.

İbtidai məktəb müəllimininin köməkçisi kimi tələbələr aşağıdakı vəzifələri həyata keçirirdi:

- müəllim digər təcrübəçi tələbənin dərsində iştirak edəndə onun dərsini demək;
- mövzu ilə bağlı zəruri ləvazimatları və əyani vəsaitləri hazırlamaq;
- sinif jurnalında müvafiq qeydlər aparmaq;
- tənəffüsdə uşaqların oyunlarına rəhbərlik etmək;
- şagirdlərin yazı işlərini yoxlamaq və səhvlərini düzəltmək;
- müəllimin tədrislə bağlı tapşırıqlarını yerinə yetirmək.

Təcrübəçi vəzifəsinə başlayan tələbə deyəcəyi dərsin planını əvvəlcədən ibtidai məktəbin müəllimi ilə razılaşdırırdı. Assistent kimi tələbənin vəzifəsi tələbə yoldaşının sınaq dərslərində iştirak etmək, dərsin uğurlu və uğursuz cəhətləri ilə bağlı öz fikirlərini bildirmək idi.

Pedaqoji təcrübəni uğurla başa vuran tələbələr buraxılış imtahanları ərəfəsində hər üç sinifdə nümunə dərsi deyir, tədris etdiyi mövzuların icmalını Pedaqoji şuranın üzvlərinə təqdim edirdi. Nümunə dərsləri seminariyanın direktoru və fənn müəlliminin iştirakı ilə pedaqoji təcrübəyə həsr olunmuş konfransda təhlil edilir, protokollaşdırılır və qiymətləndirilirdi.



## Tələbələrin biliyinin yoxlanılması

Seminariyada tələbələrin biliyinin yoxlanılması forması ***imtahan*** hesab olunurdu. Tədris ilinin sonunda birinci və ikinci tədris ili tələbələri növbəti mərhələyə keçmək üçün imtahan verməli idi.

Sinifdən-sinfə (kursdan-kursa) keçid üçün aşağıdakılar tələb olunurdu: 1) tələbənin tədris ilinin hər rübünə dair müvəffəqiyyət cədvəli; 2) ilin sonunda yazılı və şifahi imtahanın nəticələri.

Əsas məqsəd tələbələrin tədris olunan fənləri dərindən mənimsədiyini müəyyənləşdirmək və növbəti sinifdə (kursda) tədris prosesində uğur qazanacağına əmin olmaq idi. Yazılı imtahanlar şifahi imtahanlar başlayana kimi 2 həftə müddətində (ən azı 5 gün qalmış) keçirilirdi. Yazılı imtahanlar tələbələrin digər fənləri oxumasına mane olmamaq şərti ilə təşkil edilirdi.

İmtahanlara hazırlıq məqsədilə fənn müəllimi tərəfindən bir neçə mövzu və tapşırıq Pedaqoji şurada müzakirə olunaraq direktora təqdim olunurdu. Müəyyən vaxt ərzində cavablandırılmalı olan imtahan sualları tələbələrə əvvəlcədən verilmirdi. Yazılı imtahanın nəticələri fənn müəllimi və direktor tərəfindən yoxlanılırdı. Son qiymət dəftərə və imtahan vərəqinə yazılırdı.

Şifahi imtahanlar isə tədris ilinin sonuna iki həftə qalmış keçirilirdi. İmtahan direktorun, fənn müəlliminin və assistentin iştirakı ilə keçirilirdi. Şifahi imtahan zamanı seminaristlər direktor, müəllim və assistent tərəfindən ayrı-ayrılıqda qiymətləndirilirdi. Yazılı imtahanda olduğu kimi, şifahi imtahanda da son qiymət direktor tərəfindən yazılırdı. Yazılı imtahan zamanı 2 əsas fəndən qeyri-müvəffəq qiymət alan tələbə şifahi imtahana buraxılmırdı. Tələbəyə təkrar imtahanda iştirak etmək şansı yalnız yay tətilindən sonra verilirdi.



İmtahanların nəticəsi Pedaqoji şurada müzakirə edildikdən sonra yekun qərar qəbul edilirdi. Tələbələrdən kimlərin yuxarı siniflərə keçirilməsinə və yüksək nailiyyət göstərdiyinə görə mükafatlandırılmasına Pedaqoji şura qərar verirdi. Tələbələrin yuxarı siniflərə keçirilməsində onların ilboyu təlim nailiyyətləri və imtahan nəticələri nəzərə alınırdı. Növbəti sinfə (kursa) keçmək üçün bütün fənlərdən müvəffəq qiymət almaq tələb olunurdu. Yazılı və şifahi imtahanların nəticələri (orta qiymət) vahid balla qiymətləndirilirdi.

İlboyu aldığı qiymətlərin nəticəsi 2,5 olanlar 3 balla, 3,5 olanlar 4 balla, 4,5 olanlar 5 balla qiymətləndirilirdi. Sinifdən-sinfə keçirilmə müəyyən şərtlərə uyğun olaraq aparılırdı. Belə ki, ilahiyyat, rus dili, pedaqogikadan orta bal 3-dən, digər fənlərdən 2,5-dən az olmamalı idi. Tələbələrin birinci və dördüncü rüblərdə hər fəndən ən azı 3 qiyməti olmalı idi. Hüsnxət, rəsmxət, musiqi, nəğmə fənlərindən qeyri-qənaətbəxş qiymət alanlar mükafatdan məhrum

edilsələr də, bu uğursuzluqlar onların yuxarı siniflərə keçirilməsinə mane olmurdu.

İrəvan Müəllimlər Seminariyasında 1882-ci ildən 1916-cı ilə kimi tələbələr hər il yuxarı siniflərə keçmək üçün əksər fənlərdən imtahan verməli olurdular. Yalnız 16 mart 1916-cı ildə Xalq maarif naziri P.N.İqnatevin sirkulyar məktubu əsasında müəllimlər seminariyalarında sinifdən-sinfə keçirilmə imtahanları ləğv edildi. Sinifdən- sinfə keçirilmə tələbənin illik müvəffəqiyyətinə görə aparılmağa başlanıldı. Bununla yanaşı, qeyd edək ki, imtahanlar tamam aradan götürülmədi. İllik qiymətlərinin aşağı olması səbəbindən yuxarı sinfə keçə bilməyənlərin imtahan verməsinə icazə verilirdi. İmtahanlarda uğur qazananlar yuxarı siniflərə keçirilirdi.

Seminaristlərin təlim nailiyyətləri kimi, əxlaqi keyfiyyətlərinin inkişafı da bütün tədris illərində müəllimlərin diqqət mərkəzində olurdu.

Tələbələr mükafatlandırıldığı kimi həm də cəzalandırılırdı. Cəzaların aşağıdakı növlərindən istifadə olunurdu:

- təklikdə direktor tərəfindən töhmət verilməsi;
- sinif qarşısında töhmət verilməsi və cəza jurnalına yazılması;
- davranış qiymətini aşağı salmaqla töhmət verilməsi;
- seminariyadan xaric edilməsi.

Əgər tələbələr kollektiv şəkildə seminariyanın nizam-intizam qaydalarını pozardılarsa, onda cəzanın aşağıdakı növləri tətbiq olunurdu:

- cəza jurnalına yazılmaqla töhmət vermək;
- davranış qiymətini aşağı salmaqla hər bir tələbəyə ayrı-ayrılıqda Pedaqoji şura adından töhmət vermək;
- günahkarların təqaüdünü kəsmək;
- Pedaqoji şura adından töhmət vermək və seminariyadan xaric etmək.

1888-ci ilə aid olan məlumatda bildirilir ki, həmin il seminariyadan 13 nəfər ailə vəziyyətinə, 5 nəfər xəstəliyinə, 1 nəfər isə nizam-intizam qaydalarını pozduğuna görə xaric edilmiş, 26 nəfər hazırlıq, 5 nəfər 1-ci sinfə qəbul edilmişdir[1].

[1] Обзор Эриванской губернии за 1888 Эривань: Тип. Эриван. губ. Правления.1889. с.131

Araşdırma zamanı məlum oldu ki, 1888-ci ilə kimi Pedaqoji şuranın qərarı ilə töhmət alan, təlim uğursuzluğuna və intizamsızlığına görə seminariyadan xaric edilən azərbaycanlı tələbə olmayıb, əksinə, onlar həmişə təlim uğurlarına və davranışlarına görə təriflənib və mükafatlandırılıblar.

Seminariyanın son tədris ili tələbələri ilin sonunda Pedaqoji şuranın üzvlərinin iştirakı ilə ***buraxılış imtahanı*** verirdilər. İmtahana quberniya xalq məktəblərinin və İrəvan kişi gimnaziyasının direktoru da dəvət olunurdu. Direktorun icazəsi ilə buraxılış imtahanlarında seminaristlərin valideynləri, digər təhsil müəssisələrinin direktorları da iştirak edə bilərdi.

İmtahanlar may ayının sonu, iyun ayının birinci yarısında 3-4 həftə müddətində keçirilirdi. Aprel ayında tələbələrə 3 il müddətində keçirilən fənlərin proqramı təqdim olunurdu. İlk imtahan əsas fənnə aid olduğundan ona hazırlaşmaq üçün 2 – 4 gün vaxt verilirdi. May ayının 10-dan sonra sinif mürəbbisi hər bir tələbənin 3 il müddətində yazdığı yazı işlərini xronoloji ardıcıllıqla toplayaraq ayrıca qovluqda Pedaqoji şuraya təqdim edirdi. Təhsil müddətində tələbələr bütün fənlərdən yazı işi yazırdılar. İmtahan başlanana kimi Pedaqoji şuranın üzvləri həmin qovluqdakı yazı işləri ilə tanış olurdular. İmtahanlarda qiymətləndirmə zamanı çətinlik yarananda yazı işləri ilə bağlı nailiyyətlər tələbələrin köməyinə gəlirdi. Yazı işlərinin ilk variantı (qaralama variantı) seminariyada saxlanılır, son variant (ağlama variantı) tələbələrin özlərinə verilirdi. İmtahan zamanı əsas fənlərə 2 saatdan 4 saata kimi, digər fənlərə isə 1 saatdan 2 saata kimi vaxt verilirdi.



Buraxılış imtahanı üçün fənn müəllimi Pedaqoji şuraya 5-10 mövzu təqdim edirdi. Pedaqoji şuranın bəyəndiyi mövzulardan birini direktor seçərək tələbələrə elan edirdi. Direktorun elan etdiyi vaxt tamam olanda sinif mürəbbisi yazı işlərini yığıb müəllimə təqdim edirdi. Yazı işləri 5 balla qiymətləndirilirdi. Son qiymət Pedaqoji şurada müzakirə edilirdi.

Qiymətləndirmə aşağıdakı kimi aparılırdı: ***çox qənaətbəxş, qənaətbəxş, qeyri-qənaətbəxş.*** 3 fəndən qeyri-qənaətbəxş qiymət alan tələbə şifahi imtahanlara buraxılmırdı. Yazı işlərinin son variantı tələbələrə şifahi imtahanlarının keçirilməsinə 5 gün qalmış verilirdi. Buraxılış imtahanlarına kimi ayrı-ayrı fənlərdən tələbələrə məsləhətlər verilir, sorğu-sual edilirdi.

Digər seminariyalarda olduğu kimi, İrəvan Müəllimlər Seminariyasında da tələbələr buraxılış imtahanlarından əvvəl sınaq imtahanı verirdilər.

Buraxılış imtahan vərəqələrinə hər bir komissiya üzvü müvafiq qiymətlər yazırdı. Son xanada Pedaqoji şuranın yekun qərarı yazılırdı. İmtahanın nəticələri komissiya üzvləri tərəfindən ciddi müzakirə olunduqdan sonra məzunlara ***ibtidai məktəb müəllimi*** adı verilirdi. Əvvəl tələbələrin əxlaqi yetkinliyi, sonra əqli yetkinliyi, daha sonra ayrı-ayrı fənlərdən aldığı qiymətlər müzakirə edilirdi. İmtahanı uğurla başa vuran məzunlara Xalq Maarif Nazirliyinin təlimatına uyğun olaraq hazırlanmış ***müəllimlik şəhadətnaməsi*** verilirdi.

Əxlaqi keyfiyyətləri ilə seçilməyən məzunlara sadəcə, müəyyən edilmiş müddətdə seminariyada oxuması ilə bağlı adi arayış verilirdi.



## Seminariyada təşkil olunan sinifdənxaric tədbirlər

İrəvan Müəllimlər Seminariyasında aparılan tərbiyəvi işlər digər seminariyalardan ciddi şəkildə fərqlənmirdi. İrəvan Müəllimlər Seminariyasında təhsil-tərbiyə prosesi Zaqafqaziya Müəllimlər Seminariyasının əsasnaməsi və “Şagirdlər üçün qaydalar” əsasında tənzimlənirdi. Seminariya şagirdlərinin (tələbələrinin) davranışı üçün müəyyənləşdirilən qaydalarda müddəalar 4 bölmədə ümumiləşdirilmişdi: 1) ümumi qaydalar; 2) həyat tərzi haqqında qaydalar; 3) təlim haqqında qaydalar; 4) pedaqogikanın praktik məşğələləri haqqında qaydalar.

Qaydalarda şagirdlərin dini və təlim vəzifələri, direktora, müəllim-tərbiyəçilərə və yoldaşlarına münasibəti, həyat tərzi, ədəb və nəzakət qaydalarına əməl etmələri, məsuliyyətləri geniş şəkildə şərh edilmişdir. Ümumi qaydalardan başqa Pedaqoji şurada təsdiq edilən sinif və pansion üzrə tələbələrin növbətçilik qaydaları da var idi.

Ümumiyyətlə, seminariyanın təhsil-tərbiyə sahəsində özünəməxsus maraqlı tədbirləri, iş metodları və mütərəqqi təcrübəsi var idi.

Seminariyada bir-birindən maraqlı təhsilverici və tərbiyəedici tədbirlər keçirilirdi. Həmin dövrdə seminariya İrəvanda mədəni-maarif mərkəzinə çevrilmişdi. Seminariyada mütəmadi olaraq Azərbaycan xalqının tanınmış maarifçiləri ilə görüşlər keçirilirdi. Ayrı-ayrı vaxtlarda Firidun bəy Köçərli, Cəlil Məmmədquluzadə, Mirzə Ələkbər Sabir[1], Abdulla Şaiq, Mirzə Cabbar Əsgərzadə və b. İrəvan Müəllimlər Seminariyasının tələbələrinin qonağı olmuşdular.

Mirzə Ələkbər Elxanovdan sonra seminariyanın müəllimləri və tələbələri ilə mütəmadi əlaqə saxlayan görkəmli Azərbaycan maarifçisi Firidun bəy Köçərli olmuşdur. Axund Məmmədbağır Qazızadə ilə dost olan F.B.Köçərli gimnaziyada olduğu kimi, seminariyada da Azərbaycan dili və şəriət fənlərinin tədrisinin səviyyəsinin yüksəldilməsinə çalışmışdır. Seminariyada təşkil edilən təntənəli gecələrdə, müxtəlif tədbirlərdə və buraxılış imtahanlarında iştirak etmişdir. 10 il İrəvan şəhərində yaşayan F.B.Köçərli şəhərdə dünyəvi məktəblərin açılmasını, xüsusilə də müəllimlər seminariyasının fəaliyyətini yüksək qiymətləndirərək yazırdı: *"İrəvan müsəlmanları da hərəkətə gəlib, gözlərini qəflət yuxusundan açıb, insanlıq, elm və tərbiyə və təqəddümə[2] hümmət etməkdədirlər. Belə ki, iki-üç sənə var ki, şəhərimizdə bir-iki qaydalı və səliqəli məktəb açılıb, müsəlman balaları da sair mədəni millətlərin ətfalı təki təzə üsul ilə elm və ədəb təhsil edirlər"*[3].



F.B.Köçərli *"qeyrətli və təəssüblü cavanlar"* olan seminaristlərin aralarında *"ziyadə mehribançılıq və ittifaqın"* olmasını vurğulayaraq, dövlət tərəfindən açılan məktəblərdə *"ülum və fünun kəsb edən müsəlman şagirdlərinin"* azlığından gileylənirdi.

---

[1] M.Ə.Sabiri İrəvana Məmmədvəli Qəmərlinski dəvət etmişdir. M.Ə.Sabir İrəvanda Nəriman bəy Nərimanbəyovun, Həmid bəy Şaxtaxtinskinin, Sultanovun və Qazıyevlərin pedaqoji fəaliyyətləri ilə tanış olduqdan sonra M.Qəmərlinskiyə demişdir: "Mirzə, Sizin bu müəllimlər, məktəblər,dərs üsulunuz xüsusən də müsəlman qız məktəbi məni valeh etdi.Yaxın gələcəkdə bizim millətin də ön sıralarda olacağına əmin olmaq olar".

[2] 1) irəli keçmə, irəlidə olma; 2) ötmə, keçmə.

[3] Köçərli F.Seçilmiş əsərləri.Bakı:Azərb.SSR EA nəşriyyatı,1963, s.33

F.B.Köçərlinin haqqında danışdığımız məqaləsi 1890-cı ilin aprelin 20-də "Kəşkül" qəzetində nəşr olunub. Bu məqalədən aydın olur ki, İrəvanda Azərbaycan teatrının təşəkkülü və inkişafında İrəvan Müəllimlər Seminariyasının tələbələrinin mühüm rolu olmuşdur. Məqalədə oxuyuruq:*"Bu aprelin 4-də darülmüəllimində elm və kamal təhsil edən müsəlman cavanları hökumət rüsxəti ilə mərhum Mirzə Fətəli Axundovun "Məstəli şah"*[1] *ünvanında tərtib etdiyi komediyanı oynayıb, cümlənin diqqət və hörmətini cəlb etdilər.Komediya türk dilində oynandı. Təklif olunan icmanın bir o qədər xoşuna gəldi ki, pərdənin axırında afərin sədası göyə çıxıb üç-dörd dəfə pərdənin qalxmağını və oynayanların zühurə gəlməyini əl çalıb tələb edirdilər."*[2]

Seminariyanın tələbələri nəinki Azərbaycan maarifpərvərlərinin əsərlərini tamaşaya qoyurdular, hətta onlar özləri də bir pərdəli vodevil yazırdılar. F.B.Köçərli seminariyanın tələbəsi Rzayevin yazdığı "Könülsüz nigah" adlı vodevilin də tamaşasının yüksək səviyyədə keçdiyini bildirirdi. Onun "İrəvandan məktub" adlı məqaləsində oxuyuruq: *"Məstəli şah"dan sonra "Könülsüz" ünvanında bir pərdədə tərtib olunmuş təfriqə (vodevil) oynandı. Məlum ola ki, "Könülsüz nigahı" yazan darülmüəllimin şagirdlərində Rzayev familiyasında bir şagirddir ki, müsəlmanca oxuyub-yazmağa artıq şövqü var. Müsəlman camaatı bir dərəcədə komediyadan razı qaldılar ki, dübarə təkrarına talib və xahişmənd oldular. Amma vaxtın təng olmağı və bu vaxtlarda darülmüəllimin (kişi seminariyası - F.R) imtahanlarının başlanmağı mane olub, onların xahiş və iltimasına əməl oluna bilmədi: gələn ildə 2-3 dəfə təsis və tərtibinə vədə olundu"*[3].



Firudin bəy Köçərlinin məqalədə adını çəkdiyi Rzayev familiyalı tələbənin adı Əkbərdir. Əkbər Rzayev sonralar Ermənistan LKGİ-də və Ermənistan KP MK-da məsul vəzifələrdə işləyib, "Sovet Ermənistanı" və "Kommunist" (rus dilində) qəzetlərinin redaktoru olub. Müharibə illərində (1941-1945-ci illər) Moskvada "İnostrannaya literatura" (Xarici ədəbiyyat) jurnalının Türk ədəbiyyatı redaksiyasına rəhbərlik edib. Məsul vəzifələrdə işləməyinə

[1] M.F.Axundovun 1850-ci ildə yazdığı "Hekayəti Müsyö Jordan Həkimi-Nəbatat və Dərviş Məstəli Şah Cadükuni Məşhur" əsəri nəzərdə tutulur.

[2] **Köçərli F.** Seçilmiş əsərləri.Bakı:Azərb.SSR EA nəşriyyatı,1963, s.33-34

[3] **Köçərli F.** Seçilmiş əsərləri.Bakı:Azərb.SSR EA nəşriyyatı,1963, s.34


قارادان آرتیق
بویاق اولماز
اوچ پردەده بر مختصر دراما
اثر: میر محمد میر فتح الله یوف ایروانی
بیرنجی طبعی
نشریات برادران اوروج اوف
قیمتی ١٥ قپك
تاریخ ٢٠ رمضان مبارك ١٣٢٩ باكو.
هرحقی ونشری برادران اوروج اوفه عائددر.
„Карадан Артыкъ Боякъ Олмазъ"
Драма в 3-хъ дѣйств.
— СОЧИНЕНІЕ —
М. М. Миръ-фатуллаева Эрив.
Изд. Бр. Оруджевыхъ
Цѣна 15 коп.
مطبعهٔ ایلقتریق برادران اوروج اوف باکو
Эл.-Тип. Бр. Оруджевыхъ Баку.

baxmayaraq İrəvan teatrını yaşatmaq üçün tamaşalarda müxtəlif xarakterli rollar ifa edib. Həyat yoldaşı Firəngiz Rzayeva İrəvanda səhnəyə çıxan ilk ziyalı azərbaycanlı qadınlardan olub.

Müasir erməni sənətşünasları Əkbər Rzayevin oğlu Sabir Rzayevi erməni kinoşünaslığının banisi adlandırırlar. O, 1975-ci ildə "Ermənistan SSR Əməkdar incəsənət xadimi" fəxri adına layiq görülüb. Bir sıra filmlərin ssenari müəllifi olan Sabir Rzayev "Erməni bədii kinematoqrafiyası" (1963), "Hraciya Nersesyan" (1968), "Vardan Əcəmyan" (1978) monoqrafiyalarının müəllifidir.

Seminariyanın və gimnaziyanın azərbaycanlı müəllim və tələbələri Nəriman Nərimanovun, Əbdürrəhim bəy Haqverdiyevin və Cəlil Məmmədquluzadənin əsərlərini də tamaşaya qoyurdular.



Ümumiyyətlə, mühüm elm, maarif və mədəniyyət mərkəzlərindən biri kimi tanınan İrəvan mahalında 1882-ci ildən etibarən fəaliyyətə başlayan Azərbaycan teatrı sonrakı dövrlər ərzində özünün zəngin repertuarında milli ədəbi-bədii fikrin nailiyyətlərinə daim xüsusi yer verərək tamaşaçıların rəğbətini qazanmış və mədəniyyət salnaməmizə yaddaqalan səhifələr yazmışdır. Azərbaycanın görkəmli səhnə ustalarından bir çoxunun yaradıcılıq taleyi peşəkar milli teatrımızın ayrılmaz tərkib hissəsinə çevrilən bu qocaman sənət ocağı ilə sıx bağlıdır.

Azərbaycan Respublikasının Prezidenti İ.Əliyevin "İrəvan Dövlət Azərbaycan Dram Teatrının 140 illiyinin qeyd edilməsi haqqında" 14 iyul 2022-ci il tarixli Sərəncamında keşməkeşli yol keçmiş və dəfələrlə erməni vandalizminə məruz qalmış İrəvan Dövlət Azərbaycan Dram Teatrının salnaməsi əzəli Azərbaycan torpaqlarındakı həmyerlilərimizin tarixi taleyinin bir parçası kimi dəyərləndirilir.

# Tələbələrin ictimai-siyasi fəaliyyəti

XX əsrin əvvəllərində Cənubi Qafqazdakı inqilabi böhran çarizmin müstəmləkə siyasətinin təzahürü idi. Hakim təbəqə ilə mütləqiyyət arasında, xalq kütlələri ilə hakimiyyət arasında sosial maraqlar üzərində mübarizə yüksələn xətlə inkişaf edirdi. Milli maarifçilər ana dilində məktəblərin yaradılmasını, müsəlman tələbələrə də xristian tələbələr kimi eyni hüquqların verilməsini tələb edirdi. 1905 -ci il martın 5-də Bakı şəhər dumasında Daxili İşlər Naziri Bulıginin qəbuluna nümayəndə heyəti göndərilməsi müzakirə edildi. H.Z.Tağıyevin evində keçirilən yığıncaqda islahatlar keçirilməsi haqqında Rusiya hökumətinə ərizə göndərilməsi qərara alındı.

Ərizənin hazırlanmasında Fərrux bəy Vəzirov, Əlimərdan bəy Topçubaşov və Əhməd bəy Ağayev böyük rol oynadılar. Layihədə orta və ali təhsilli müsəlmanların arzu etdikləri sənəti seçməsi, pedaqoji sahədə çalışan müsəlman tələbələrinin dövlət təqaüdündən istifadə edə bilməsi, təlimin ana dilində aparılması məsələləri öz əksini tapmışdı.



XX əsrin əvvəllərindən başlayaraq tələbələr arasında da sosial-demokratik hərəkat geniş yayılmağa başladı. 1903-cü ildə Zaqafqaziya Müəllimlər Seminariyasında olduğu kimi İrəvan Müəllimlər Seminariyasında da sosial-demokrat tələbələrin dərnəkləri yaradıldı[1]. 1905-1907-ci illərdə İrəvanda azərbaycanlıların da geniş təmsil olunduğu 6-ya qədər tələbə sosial-demokrat dərnəyi fəaliyyət göstərirdi. Tələbələr özlərini əsl inqilabçı kimi apararaq seminariyanın direktoruna ərizə ilə müraciət edirdilər. İrəvan Müəllimlər Seminariyasından sonra Zaqafqaziya Müəllimlər Seminariyasına rəhbərlik edən M.A.Miropiyev xüsusi səlahiyyətlərlə ezamiyyətə göndərilmiş Qori və Duşet qəzalarının baş ştabının polkovniki V.A.Alftona yazdığı 27 oktyabr 1905-ci il tarixli raportunda bildirirdi: *"bu il oktyabrın 24-də mənə tapşırılan seminariyanın tələbələri ərizə verərək bildirmişlər ki, onlar 3 günlük tətil elan*

[1] **Саакян Е.С.** Революционное движение учащейся молодежи в Армении и армянской действительности Закавказья (1880-1917 гг.). Автореферат диссертации по истории. 1989, с.42

*etməyə məcburdurlar...Mənə tapşırılan seminariyada tətil yüksək dərəcədə sakit və intizamlı keçir, həqiqətən demək olar ki, bu intizamsızlığın özündə müəyyən nizam-intizam var".* M.A.Miropiyev raportla yanaşı azərbaycanlı tələbələrin otağının pəncərəsinə yapışdırılmış bəyannamənin bir nüsxəsini də polkovnik V.A.Alftona göndərmişdi. Tələbələrin tələbi nə idi? Onlar ölkədə yaranmış inqilabi şəraitdən istifadə etməklə nəyə nail olmaq istəyirdilər?

Həmin tələblər yalnız Zaqafqaziya Müəllimlər Seminariyasının azərbaycanlı tələbələrinin deyil, həm də İrəvan Müəllimlər Seminariyasının tələbələrinin istək və arzularının ifadəsi idi: 1) seminariyanın tədris planının müəllimlər institutunun tədris planı ilə eyniləşdirilməsi; 2) Azərbaycan dili dərsləri üzrə saatların artırılması; 3) milli və vətəndaşlıq tarixinə aid fənlərin tədris planına salınması; 4)senzuradan keçən əsərlərin azad şəkildə bütün dillərdə oxunması; 5) musiqinin vacib dərslər siyahısından çıxarılması; 6) seminariyada polis-kazarma sisteminin aradan qaldırılması, tələbələrin seminariyaya giriş-çıxışının sərbəstləşdirilməsi; 7) məzunlara dövlət vəsaiti hesabına geyimin verilməsi; 8) bütün tip ibtidai məktəblərdə xalq müəllimlərinə eyni hüquqların verilməsi və s.



Öz çarı kimi, M.A.Miropiyev də sabahkı gün üçün ümidsiz halda yaşayır, tələbələrin tələbindən dəhşətə gələrək yazırdı:*"Biz hələlik xilas olmuşuq, lakin sabah nə baş verəcəyi naməlumdur".*

Tələbələrin azadlığını və siyasi fəallığını boğmağa çalışan, türklərin və müsəlmanların qatı düşməni olan M.A.Miropiyevin direktorluqdan çıxarılması ilə bağlı seminaristlər qərar qəbul etmişdilər. Həmin qərar 16 noyabr 1905-ci ildə "Vozrojdenie" qəzetində çap olunmuşdur.

İrəli sürülən bu tələblərin bəziləri Pedaqoji şura tərəfindən rədd edilsə də, azərbaycanlı tələbələrin həyatında izsiz də qalmadı. Sərt və ciddi rejim xeyli yumşaldıldı. İrəvan Müəllimlər Seminariyasının azərbaycanlı tələbələri üçün 20 təqaüd təsis edildi.

## Pedaqoji Şura

Pedaqoji Şuraya İrəvan Müəllimlər Seminariyasının direktoru rəhbərlik edirdi.

Pedaqoji Şurada aşağıdakı məsələlər müzakirə edilirdi.

**I.Tədris işləri üzrə:**

- hər bir tədris fənni üzrə fənn proqramlarının müzakirəsi, saatların müvafiq siniflər üzrə bölgüsü, müəllim və tələbələr üçün zəruri tədris ədəbiyyatının müəyyənləşdirilməsi;
- seminariyanın nəzdindəki ibtidai məktəb üçün didaktik məşğələ planının tərtib edilməsi və müəllimlər arasında bölüşdürülməsi;
- seminariyaya qəbul olunma, sinifdən sinfə keçirilmə və yekun imtahanları üçün sualların hazırlanması;
- tələbələrin seminariyaya qəbulu, sinifdən-sinfə keçirilməsi, mükafatların təyin edilməsi, uğursuzluğa, xəstəliyə və digər üzrlü səbəblərə görə tələbələr sırasından azad edilməsi, tam təhsil kursunu müvəffəqiyyətlə bitirənlərə şəhadətnamələrin verilməsi;
- rus dili və didaktika üzrə əlavə kursların təşkili və onlar üçün tədris proqramlarının hazırlanması; zəruri kitab və tədris ədəbiyyatının alınmasının müəyyənləşdirilməsi;
- illik hesabatların və ictimai tədbirlərdəki çıxışların mətninin müzakirəsi.

**II.Əxlaq tərbiyəsi üzrə:**

- tələbələrə əxlaqi tərbiyənin aşılanması, onlarda sağlam həyat tərzinin formalaşdırılması;
- tələbələrin rəğbətləndirilməsi və cəzalandırılması;
- davranışındakı nöqsanlara görə tələbələrin seminariyadan xaric edilməsi.

**III.Təsərrüfat üzrə:**

- məktəbin binasının, ərazinin və əmlakın yoxlanılması;
- məktəbin binasında və otaqlarında təmir-tikinti işlərinin aparılması üçün smeta xərclərinin müəyyənləşdirilməsi və müqavilələrin bağlanması;
- tələbələrin pansionda yaşaması üçün smeta xərclərinin, təhsil haqqı ödənişlərinin müəyyən edilməsi;
- seminariya üçün ayrılan vəsaitlərin bölüşdürülməsi.

**IV. İdarə edilmə və kargüzarlıq üzrə:**

- Pedaqoji Şura katibinin seçilməsi;

- məktəb avadanlıqlarının dəyişdirilməsi və təkmilləşdirilməsi ilə bağlı müfəttişin və müəllimlərin təkliflərinin müzakirəsi.

Müzakirə edilən bəzi məsələlərlə bağlı Pedaqoji Şura sərbəst qərar qəbul etsə də, bəzi məsələləri  tədris dairəsinin popeçiteli ilə razılaşdırmalı idi. 1890-cı ildə Pedaqoji Şuranın 96 iclası keçirilmişdir. Həmin iclaslarda 15-də ümumi məsələ, 54-də təsərrüfat məsələsi, 27-də sınaq dərsləri müzakirə edilmişdir[1].

1913-cü ildə İrəvan Müəllimlər Seminariyasında il ərzində Pedaqoji Şuranın 174 iclası keçirilmişdir.[2]

*İrəvan Müəllimlər Seminariyasının müəllimlərindən bir qrupu*





[1] Отчеть попечителя Кавказскаго учебнаго округа: состоянии учебныхъ заведений за 1890 год.- Тифлись, 1891, таблица №164

[2] Отчет о состоянии учебных заведений Кавказского Учебного Округа за 1913 год. Тифлис.1914,с.53

## Seminariyanın direktorları

Xalq Maarif Nazirliyinin əsasnaməsinə əsasən, seminariyanın direktoru vəzifəsinə yalnız ali təhsilli pravoslav inanclı müəllimlər təyin edilə bilərdi. İrəvan Müəllimlər Seminariyasının direktoru Zaqafqaziya Müəllimlər Seminariyasının direktoru kimi təhsil dairəsinin popeçiteli tərəfindən seçilir və bu vəzifəyə İmperatorun Qafqazdakı canişini tərəfindən təsdiq edilirdi. Direktor həm İrəvan Müəllimlər Seminariyasına, həm də seminariyanın nəzdindəki nümunəvi məktəbə bilavasitə rəhbərlik edirdi. Hər iki məktəbin və pansionun bütün işçiləri direktora tabe olurdular. İlahiyyat, Azərbaycan dili və erməni dili müəllimlərindən başqa digər müəllimlər, əsasən, ali təhsilli pravoslavlar idilər.

Seminariyanın və onun nəzdindəki məktəbin müəllimləri öz vəzifələrinə Qafqaz Tədris Dairəsinin popeçiteli tərəfindən təsdiq edilirdi.[1]

Direktor hər il seminariyanın Pedaqoji Şurasında illik hesabat verir və həmin hesabatı İrəvan xalq məktəbləri direktoruna və QTD-nin popeçitelinə göndərirdi.



Hesabatda seminariyanın müəllim heyəti, maddi-texniki bazası, maliyyə xərcləri, kitabxana fondu, tədris- tərbiyə prosesinin təşkili, tələbələrin inkişaf dinamikası (siniflər üzrə sayı, qəbul olunanlar, xaric edilənlər, müəllim adı alanlar və s.) haqqında məlumatlar öz əksini tapırdı.

İrəvan Müəllimlər Seminariyasına 1881-1896-cı illərdə ***Yakob Stepanoviç Suşevski***[2]***,*** 1898-1902-ci illərdə ***Mixail Alekseyeviç Miropiyev***, 1904-cü ildə ***İvan Andreyeviç Pasyuteviç***, 1905-1907-ci illərdə ***Aleksey Martinov Zazuboviç,*** 1908-1912-ci illərdə ***Sergey Nikolayeviç Streletski,*** 1913-1918-ci illərdə ***Valentin Vasilyeviç Dobrotin*** rəhbərlik etmişdir.

---

[1] О Закавказской, Кутаисской и Эриванской учительских семинариях. Свод уставов ученых и учебных заведений Министерства Народнаго просвещения. http: //pravo. gov. ru/ proxy/ ips/window_volume_contentsvolume=100015

[2] Çerniqov xalq məktəblərinin direktoru vəzifəsində çalışan Yakob Stepanoviç Suşevski 4 avqust 1881-ci ildə həmin vəzifəyə təyin edilmişdi. O, Kiyev Universitetinin məzunu idi. Pedaqogika və rus dili fənlərini (həftədə 11 saat) tədris edirdi.



## Mixail Alekseyeviç Miropiyev
(1852- 1919)

8 dekabr 1852-ci ildə ruhani ailəsində anadan olub. Kazan İlahiyyat Seminariyasında və Kazan İlahiyyat Akademiyasında (1874-1878) oxuyub. Orenburq təhsil dairəsinin rayon müfəttişi vəzifəsində çalışıb. Daşkənd Müəllimlər Seminariyasının direktoru olub. Seminariyada tarix, coğrafiya və pedaqogika fənlərindən dərs deyib. 30 dekabr 1888-ci ildə ikinci dərəcəli Müqəddəs Stanislav ordeni ilə təltif edilib. Ayrı-ayrı vaxtlarda İrəvan (1898-1902) və Zaqafqaziya Müəllimlər Seminariyalarının direktoru olub. Azərbaycan xalqının maariflənməsinə, dilinə və dininə düşmən münasibəti ilə seçilib. C.Məmmədquluzadə onun Qafqazın müsəlman əhalisinin təhsil almaq imkanlarını məhdudlaşdırmaq ("İrəvan seminariyası və qazinin nitqi"), Azərbaycan dilinin tədris saatlarını azaltmaq, seminaristlərin ana dilində danışmalarını, "namazı" müsəlman dilində" qılmalarını qadağan etməklə milli və dini hislərini boğmaq və onları millətə xidmət yolundan uzaqlaşdırmaq ("Çətin məsələyə cavab") səylərini kəskin tənqid etmişdir. M.A.Miropiyevin təzyiqləri ilə üzləşən S.M.Qənizadə Zaqafqaziya (Qori) Müəllimlər Seminariyasının inspektoru vəzifəsindən uzaqlaşmaq məcburiyyətində qalmışdır. 515 səhifəlik "О положении русских инородцев" (1901), "Необходимость основания русской школы на национальных началах" (1909) və "Сущность системы образования инородцев Н.И.Ильминского" (1915) kitablarının müəllifidir. 2 fevral 1916-cı ildə Ufada Orenburq təhsil dairəsinin müvəkkili Aleksey Nikolayeviç Derevitski ilə birlikdə Şərqi Rus Cəmiyyətinin yaradılmasının təşəbbüskarlarından biri idi. 1912-ci ildə "Вестника Оренбургского учебного округа" məcmuəsinin redaktoru olub.

Kolçak hökumətini dəstəklədiyinə görə 1919-cu il oktyabrın 24-də həbs edilərək Ufada ölüm cəzasına məhkum edilib. 28 yanvar 1993-cü ildə bəraət alıb.

# Valentin Vasilyeviç Dobrotin
# (1874 – 1953)



11 oktyabr 1874-cü ildə Rusiyanın cənubunda Taqanroq körfəzinin sahilindəki Yeysk qəsəbəsində keşiş ailəsində anadan olub. Kilsə-prixod məktəbində və Kiyev İlahiyyat Akademiyasında (1895-1899) oxuyub, ömrünün sonuna kimi rus dili və ədəbiyyatı müəllimi olub. Xalq Təhsili Nazirliyinin müxtəlif strukturlarında çalışıb. 5 oktyabr 1899-cu ildən 5 avqust 1905-ci ilə kimi İrəvan Müəllimlər Seminariyasında müəllim, 16 avqust 1905-ci ildən 1 iyul 1910-cu ilə kimi Tiflis Aleksandrovski İnstitutunda müəllim, 1 iyul 1910-cu ildən 20 sentyabr 1911-ci ilə kimi Pyatiqorsk kişi gimnaziyasında müəllim, 20 sentyabr 1911-ci ildən 1 sentyabr 1918-ci ilə kimi İrəvan Müəllimlər Seminariyasının direktoru olub. Seminariya bağlandıqdan sonra 9 illik Uman Qadın Gimnaziyasının Pedaqoji şurasının sədri seçilib. 1923-cü ilin 15 oktyabrından pedaqoji fəaliyyətini Yeysk şəhərində davam etdirib. 1-ci doqquzillik sovet əmək məktəbində dərs deməyə başlayıb. 1930-cu ilin noyabrından həmin məktəbin yuxarı sinifləri əsasında formalaşdırılan Pedaqoji Texnikumda müəllim işləyib. 1935-ci ildə 1-ci doqquzillik məktəbin və Pedaqoji Texnikumun bazasında 4 saylı 10 illik məktəb yaradılıb. V.V.Dobrotin 1935-1950-ci illərdə həmin məktəbdə rus dili və ədəbiyyatı fənlərini tədris edib. Yunan, alman, latın, qədim slavyan dillərini mükəmməl bilib. Rus dili və ədəbiyyatı fənni ilə bərabər tarix, coğrafiya, astronomiya, məntiq, psixologiya fənlərini də tədris edib. 1923-cü ildən 1950-ci ilə qədər işlədiyi məktəbin məzunlarının ad və soyadlarını qeyd etdiyi dəftər hazırda "Dobrotinin dəftəri" adı ilə muzeydə saxlanılır. II və III dərəcəli müqəddəs Anna ordeni, II və III dərəcəli müqəddəs Stanislav ordeni və Romanovlar sülaləsinin 300 illiyi medalı ilə təltif olunub. 1953-cü ildə Yeysk qəsəbəsində vəfat edib.

## Seminariyanın müəllimləri

Seminariyanın tələbə heyəti kimi müəllim kollektivi də beynəlmiləl idi. Azərbaycan, rus, erməni, gürcü və ukraynalı müəllimlər ibtidai xalq müəllimi hazırlığında fədakarlıqla çalışırdılar. İlahiyyat fənlərini P.Q.Qambarov (pravoslav), keşiş Q.Q.Amanasyanç (erməni-qriqoryan) və Axund Məmmədbağır Qazızadə (şəriət) tədris edirdi. Axund Məmmədbağır Qazızadə seminariyada 1897-ci ilə kimi həm də tatar (Azərbaycan -F.R.) dilini tədris etmişdir. 1883-cü ildə seminariyada A.A.Karamosko, İ.A.Tamamşev, S.A.Nazaryan, A.O.Raymeman, Bazılyeviç və E.K.Bayor müəllim kimi çalışırdı. 1884-cü ildə P.Q.Qambarov keşiş A.Sokolovla əvəz olunmuş, yuxarı siniflər açıldığından yeni müəllimlər - İ.M.Klopov[1] (rus dili və tarix), A.İ.Lyaudanski (riyaziyyat), V.Dıviçki (təbiət elmləri və coğrafiya), N.A.Suvorov (ibtidai məktəbin müdiri), S.N.Kaspadze, A.B.Zeldliç, V.V.Zayçov və b. pedaqoji fəaliyyətə cəlb edilmişdir.



1885-ci ildə seminariyada çalışan müəllimlərin sayı 12-yə, 1889-cu ildə 13-ə çatmışdı.

İrəvan Müəllimlər Seminariyasının direktoru Yakob Stepanoviç Suşevskinin[2] İrəvan qubernatoruna verdiyi məlumatdan aydın olur ki, 1881-1885-ci illərdə seminariyada işləmək üçün 16 nəfər gəlib. Müəllimlərdən 4 nəfəri Rusiyanın mərkəzi quberniyalarından, 12 nəfəri Qafqazın digər bölgələrindən gəlmişdi. Onların 8 nəfərinin ali, 6 nəfərinin orta, 2 nəfərinin isə ibtidai təhsili var idi.[3]

Prof.Ə.Zeynalov "İrəvan məktəbləri" kitabında yazır ki, "Qafqaz kalendarı" məcmuəsinin 1886-cı il nömrəsində Məmməd Bağır Qazızadə İrəvan Müəllimlər Seminariyasında tatar müəllimi, Mirzə Bağır Qazıyev isə 2-ci Raspord (müdir) kimi göstərilir. Güman

---

[1] Bəzi tədqiqatlarda Mixail Klopovun seminariyada hüquq fənnini tədris etdiyi yazılır. Bu fikir yanlışdır. O, rus dili və tarix fənnini tədris edib. Ümumiyyətlə, seminariyanın tədris planında hüquq fənni olmayıb.

[2] **İ.Y.Semenov** "Русские в истории Армении" (2009) kitabında Y.S.Suşevskini P. Suşevski (səh.56) kimi təqdim edir. Bu fikir yanlışdır.

[3] Национальный архив РА. Фонд 94, оп. 1, д.997.

etmək olar ki, bunlar qardaşdırlar"[1]. Bu fikir yanlışdır və ilk mənbəyə əsaslanmır.

Belə ki, "Qafqaz təqvimi"nin 1886-cı ilə aid sayında[2] seminariyanın pedaqoji kollektivi aşağıdakı kimi göstərilmişdir: 1) Y.S.Suşevski (direktor); 2) P.Q.Qambarov (keşiş pravoslav); 3) Q.L.Atanaslans (keşiş erməni-qriqoryan); 4) Axund Məmmədbağır Qazızadə (şəriət və tatar dili müəllimi); 5) A.A.Karamosko (müəllim); 5) A.İ.Lyudanski (müəllim); 6) V.P.Juravlev (müəllim); 7) V.E.Atamanov (erməni dili müəllimi); 8) A.Y.İoakimov (hazırlıq sinfinin müəllimi); 9) D.M.Popov (ibtidai məktəbin müdiri); 10) V.K.Vacka (musiqi); 11) S.S.Sajumyans (həkim).

Burada Mirzə Bağır Qazıyevin 2-ci Raspord (müdir) kimi göstərilməsinə aid heç bir qeyd yoxdur. Ümumiyyətlə, Mirzə Bağır Qazıyevin müdir olması qeyri-mümkündür. Belə ki, həmin dövrdə seminariya direktorları ali təhsilli, pravoslav inanclı insanlardan təyin olunurdu.

Kitabda Axund Məmməd Bəşir Qazızadə İrəvan Müəllimlər Seminariyasında həm müsəlman bölməsinin müdiri, həm də Azərbaycan dili müəllimi kimi təqdim olunur. Bu fikir də yanlışdır və həqiqəti əks etdirmir. Belə ki, Qori Müəllimlər Seminariyasından fərqli olaraq İrəvan Müəllimlər Seminariyasında Azərbaycan şöbəsi fəaliyyət göstərmirdi. İrəvan Müəllimlər Seminariyasında təhsil müddəti əvvəlcə 3, sonra isə 4 il olmuşdur. Qori Müəllimlər Seminariyasının Azərbaycan şöbəsində isə təhsil müddəti 5 il idi. Azərbaycan şöbəsində aşağı və yuxarı hazırlıq sinifləri fəaliyyət göstərirdi. Aşağı hazırlıq sinfi xristian şöbələrinin (erməni, rus, gürcü) heç birində yox idi.



İrəvan Müəllimlər Seminariyasında bütün şagirdlər (Azərbaycanlı, erməni, gürcü, rus və s.) ilahiyyat və ana dili fənnindən başqa digər fənləri bir yerdə oxuyur, eyni müəllimdən dərs alırdılar.

1896-cı ildə seminariyanın müəllim heyəti aşağıdakı tərkibdə fəaliyyət göstərirdi: 1) Y.S.Suşevski (direktor); 2) A.Sokolov (keşiş, pravoslav); 3) Q.Q.Amanasyans (keşiş, erməni-qriqoryan); 4) ***Axund***

---

[1] **Ə.Zeynalov.** İrəvan məktəbləri. Bakı: Mütərcim, 2011,s.23

[2] Кавказский календарь на 1886 год. Тифлис, 1885, с.87

***Məmmədbağır Qazızadə*** (şəriət və tatar dili müəllimi). Müəllimlər: 5) M.Klopov (rus dili və tarix); 6) V.E.Atamanov (erməni dili, hüsnxət, rəsm və rəsmxət); 7) A.İ.Lyudanski (riyaziyyat); 8) V.Dıvıcki (təbiət elmləri və coğrafiya); 9) A.Q.Amanasyan (hazırlıq sinfinin müəllimi); 10) N.A.Suvorov (ibtidai məktəbin müdiri və cildçilik); 11) A.M.Zrılov (həkim); 12) S.N. Kaspadze (nəğmə müəllimi, katib və iqtisadçı); 13) musiqi müəllimi –vakant; 14) V.V.Zayçov (gimnastika), 15) M.Panikyan (dülgər və tornaçı)[1].

1915-ci ildə İrəvan Müəllimlər Seminariyasının pedaqoji kollektivi aşağıdakı kimi formalaşdırılmışdı: 1) Valentin Vasilyeviç Dobrotin (direktor); 2) A.Razdolski -ilahiyyat (provaslav) müəllimi; 3) Vartanes Makakaryans -ilahiyyat (erməni-qriqoryan) müəllimi; 4 ) Axund Qazızadə -şəriət müəllimi; 5) Konstantin İvanoviç Cananov- rus dili və tarix müəllimi; 6) Mixail Vasilyeviç Karaqiçev – təbiət müəllimi; 7) Dmitri Filimonoviç Savluçinski - hazırlıq sinfinin müəllimi; 8) S.N.Kaspadze-musiqi müəllimi; 9) T.N.Kolça-(rəsm və hüsnxət müəllimi; 10) V.S.Markin- əl əməyi müəllimi; 11) N.A.Lobazov-ibtidai məktəbin müəllimi; 12) R.K.Oğacanov -erməni dili müəllimi; 13) Mirzə Cabbar Məmmədov -tatar (Azərbaycan -F.R.) dili müəllimi; 14) B.İ.Ter-Mikaelyans (həkim).



"Qafqaz təqvimi"nin 1917-ci il sayında seminariyanın əməkdaşları haqqında verilən məlumatdan aydın olur ki, həmin dövrdə ibtidai məktəb müəllimi hazırlığı ilə 14 nəfər (1-i həkim) məşğul olurdu: 1) V.V.Dobrotin (direktor); 2) V.Maxaradze (keşiş); 3) V.Makaryan (erməni-qriqoryan); 4) ***Axund Əbülhəsən Qazızadə*** (şəriət); 5) İ.Cananov; 6) K.F.Parxomenko; 7) P.A.Bryançev; 8) D.F.Savluçinski; 9) S.N.Kaspadze; 10) V.S.Markin; 11) N.A.Lobazov; 12) R.K.Ağacanov; 13) ***Mirzə Cabbar Məmmədov***; 14) İ.B.Ter-Mikaelyan (həkim)[2].

[1] Кавказский календарь на 1896 год: Сприл.: Справочная книга по гор. Тифлись, Краткий путеводитель по Кавказу. Издан по распоряжению Наместника его Императорскаго Величиства на Кавказе.Тифлись, 1895, с.274

[2] Кавказский календарь на 1917 год: Сприл.: Справочная книга по гор. Тифлись, Краткий путеводитель по Кавказу. Издан по распоряжению Наместника его Императорскаго Величиства на Кавказе.Тифлись, 1916, с.396

Aşağıdakı cədvəldə İrəvan Müəllimlər Seminariyasında ayrı-ayrı vaxtlarda işləyən direktorlar, şəriət və Azərbaycan dili müəllimləri haqqında məlumat verilmişdir.

| **İllər** | **direktorlar[198]** | **Şəriət müəllimi** | **Azərbaycan dili müəllimi** |
|---|---|---|---|
| 1881 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1882 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1883 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1884 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1885 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1886 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1887 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1888 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1889 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1890 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1891 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1892 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1893 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1894 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1895 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1896 | Y.S.Suşevski | A.M.Qazızadə | A.M.Qazızadə |



[1] "Qafqaz təqvimi"nin 1881 və 1882-ci illər sayında İrəvan Müəllimlər Seminariyasının yalnız direktorunun adı verilmişdir. Digər fənn müəllimlərinin, o cümlədən şəriət və Azərbaycan dili müəllimlərinin adı göstərilmir.

| | | | |
|---|---|---|---|
| 1897 | Vakansiya | A.M.Qazızadə | A.M.Qazızadə |
| 1898 | M.A.Miropiyev | A.M.Qazızadə | RəhimXəlilov |
| 1899 | M.A. Miropiyev | A.M.Qazızadə | RəhimXəlilov |
| 1900 | M.A. Miropiyev | A.M.Qazızadə | Rəhim Xəlilov |
| 1901 | M.A. Miropiyev | A.M.Qazızadə | Rəhim Xəlilov |
| 1902 | M.A. Miropiyev | A.M.Qazızadə | Rəhim Xəlilov[199] |
| 1903 | Vakansiya | A.M.Qazızadə | Rəhim Xəlilov |
| 1904 | İ.A.Pasyuteviç | A.M.Qazızadə | H.B.Şahtaxtinski[200] |
| 1905 | A.M.Zazuboviç | A.M.Qazızadə | H.B Şahtaxtinski |
| 1906 | A.M.Zazuboviç | A.M.Qazızadə | H.B.Şahtaxtinski |
| 1907 | A.M.Zazuboviç | A.M.Qazızadə | H.B.Şahtaxtinski |
| 1908 | S.N.Streleçki | A.M.Qazızadə | H.B.Şahtaxtinski[201] |
| 1909 | S.N.Streleçki | A.M.Qazızadə | H.B Şahtaxtinski |
| 1910 | S.N.Streletski | A.M.Qazızadə | M.C.Məmmədov[202] |
| 1911 | S.N.Streletski | A.M.Qazızadə | M.C.Məmmədov |
| 1912 | Vakansiya | A.Ə.Qazızadə | M.C.Məmmədov |
| 1913 | Vakansiya | Göstərilmir | M.C.Məmmədov |
| 1914 | V.V.Dobrotin | A.Ə.Qazızadə | M.C.Məmmədov |
| 1915 | V.V.Dobrotin | A.Ə.Qazızadə | M.C.Məmmədov |
| 1916 | V.V.Dobrotin | A.Ə.Qazızadə | M.C.Məmmədov |
| 1917 | V.V.Dobrotin | A.Ə.Qazızadə | M.C.Məmmədov |

[1] 1902 və 1903-cü illərdə seminariyada ana dili müəllimi Həmid bəy Şahtaxtinski işləsə də "Qafqaz təqvimi"ndə Rəhim Xəlilovun adı və soyadı verilib.
[2] 1904-cü ilə aid "Qafqaz təqvimi"ndə ana dili müəlliminin adı Rəşid bəy Şahtaxtinski kimi yazılır. Əslində isə həmin dövrdə seminariyada ana dili müəllimi Həmid bəy Şahtaxtinski olmuşdur. Həmin dövrdə seminariyada 76 tələbə oxuyurdu.
[3] H.B.Şahtaxtinski 1907-ci ildə öz ərizəsi ilə işdən ayrılaraq ali təhsil almaq məqsədi ilə Odessa şəhərinə getsə də "Qafqaz kalendar"ında onun adı və soyadı verilmişdir.
[4] 1910-cu ildə seminariyada Həbib bəy Səlimov gimnastika (fiziki tərbiyə) müəllimi işləyib.

# Seminariyanın azərbaycanlı müəllimləri

İrəvan Müəllimlər Seminariyasında dərs deyən ilk azərbaycanlı müəllim dövrünün görkəmli din xadimi, maarifçi pedaqoq ***Axund Məmmədbağır Qazızadə*** olmuşdur. O, seminariya açılan gündən 1897-ci ilə qədər burada şəriət və Azərbaycan dilindən dərs demiş, 1897-ci ildən 1911-ci illədək yalnız şəriət fənnini tədris etmişdir.

Axund Məmmədbağır Qazızadənin vəfatından sonra 1912-1917-ci illərdə seminariyada ilahiyyat fənnini ***Axund Əbülhəsən Qazızadə*** tədris etmişdir.

## Axund Məmmədbağır Hacı Mehdi oğlu Qazızadə (?-1911)





Axund Məmmədbağır Qazızadə İrəvan şəhərinin şeyxülislamı və qazısı Hacı Mehdinin ailəsində anadan olub. İlk təhsilini atasından alan Məmmədbağır sonra mədrəsədə və qəza məktəbində oxuyub. Həm dini, həm də dünyəvi elmləri mənimsəyib. Nəcəfdə ali dini təhsil alıb. Nəticəsi prof.Eynəddin Məmmədovun yazdığına görə, Nəcəfdə 11 il mötəbər elmi-dini mərkəzdə öz biliyini təkmilləşdirib, müxtəlif islam elmlərini öyrənib[1]. Təhsilini başa vurduqdan sonra İrəvana qayıdan Məmmədbağır Zaqafqaziya Ruhani idarəsində imtahan verərək axund rütbəsi almışdır[2]. Axund Məmmədbağır həm dini elmləri, həm də dünyəvi elmləri (xüsusilə riyaziyyat elmini) dərindən bilib. 1873-cü ildə İrəvan quberniya Ruhani Məclisinə[3] üzv seçilib. Həmin dövrdə ruhani məclisinin sədri

[1] **E.Məmmədov.** İrəvandan başlanan yol. Bakı:2018, s.31

[2] Yenə orada, s. 32

[3] Ayrı-ayrı vaxtlarda Fazil İrəvani, Abbasqulu bəy Sultanhüseynbəyov, Axund Məmmədbağır Qazızadə, Molla Xəlil Qazızadə, Molla Abdulla bəy Qazıyev İrəvan quberniya Ruhani Məclisinin sədrləri olub.

Axund Molla Xəlil Qazızadə idi. 28 fevral 1883-cü ildə Zaqafqaziya Şiə Ruhani İdarəsinin əmri ilə Axund Məmmədbağır Qazızadə İrəvan quberniya Ruhani Məclisinin sədri[1] və qazısı təyin edilmişdir[2]

1881-1910-cu illərdə İrəvan Müəllimlər Seminariyasında pedaqoji fəaliyyətlə məşğul olub. 1881-1898-ci illərdə seminariyada həm ilahiyyat, həm də Azərbaycan dili, 1898-1910-cu illərdə yalnız ilahiyyat müəllimi kimi fəaliyyət göstərib.

Məhəmmədbağır Qazızadə səmərəli pedaqoji və ictimai fəaliyyətinə görə 1882-ci ildə gümüş medalla, 1898-ci ildə Müqəddəs Anna" ordeni ilə təltif edilib. 1989-cu ildə İrəvanda rus-tatar məktəbinin açılmasında xüsusi təşəbbüskarlıq göstərib. 1902-ci ildə İrəvanda öz evində rus-tatar (azərbaycanlı) qız məktəbi açmışdır. Məktəbin himayəçisi İrəvan Quberniyasının vitse-qubernatoru knyaz Aleksey Çaqadayevin arvadı Yelena Çaqadayeva, müdiri Antonina Valerianovna Kalinina, rus dili müəllimi Yevgeniya Georgiyevna Pxanadze, ana dili müəllimi Məmmədvəli Qəmərlinski olmuşdular. Məktəbdə şəriət fənnini özü tədris etmişdir.



İrəvanın ictimai-siyasi, dini-mədəni və pedaqoji həyatında mühüm rol oynayan Axund Məmmədbağır Qazızadə 1911-ci ildə Tiflisdə nəşr edilən "Ana dili" (əvvəlinci kitab) ("Kultura" nəşriyyatı) kitabının müəlliflərindən biri olub. 48 səhifədən ibarət olan kitabın müəllifləri Mirzə Qəmərlinski, Nərimanbəyov, Şahtaxtinski, Rəcəbov, Qazıbəyovlar, Şəfibəyov, Mirzə Ələkbər Mirzə Abdulla oğlu Cəfərbəyov, mühərriri Mirzə Şəfi Rəfizadə Təbrizli idi.

Axund Məmmədbağır Qazızadə 1911-ci ildə[3] İrəvanda vəfat etmişdir.

---

[1]1829-cu ildə yaradılmış İrəvan Quberniyası Ruhani Məclisi İrəvandakı Göy məsciddə yerləşirdi. İrəvan Quberniyası Ruhani Məclisi quberniyanın İrəvan, Aleksandropol, Naxçıvan, Üçmüədzin, Yeni Bayazid, Şərur-Dərələyəz, Sürməli, Ordubad qəzalarının müsəlmanlarına xidmət göstərirdi. Quberniya Ruhani Məclisi qəza qazılarını, şəhər və kənd axundlarını təyin etmək, kəbin və nikah işlərini, boşananları, ailə münaqişələrini, quberniya ərazisində olan vəqf torpaqlarını idarə etmək, icarəyə vermək, ruhani adlara yiyələnmək kimi səlahiyyətlərə malik idi.

[2] Ətraflı bax: **E.Məmmədov.** İrəvandan başlanan yol. Bakı:2018; **C.Allahverdiyev.** İctimai-pedaqoji fikrin görkəmli nümayəndəsi. https:// 525.az/news/190589-ictimai-pedaqoji-fikir-tarixinin-gorkemli-numayendesi.

[3] Azərbaycan DTA,f.290,iş.1, s.v.80,v.121



**Axund Əbülhəsən Qazızadə**
(1862-?)

1862-ci ildə İrəvan şəhərində anadan olub. Mükəmməl dini təhsil alıb. İrəvan Quberniya Ruhani Məclisinin üzvü olub. 1909-cu ildə İrəvan Quberniya Ruhani Məclisinin Ordubad qəzası üzrə sədri olub. 1911-ci ildə İrəvan şəhərində "Kultura" nəşriyyatında 4 cildlik "Durisi-şəriə" adlı kitabı nəşr olunub. 1911-ci ildən Axund Əbülhəsən Qazızadə seminariya bağlanana kimi orada şəriət müəllimi kimi fəaliyyət göstərib.

***

Seminariyanın məzunları ***Mirzə Rəhim Xəlilov*** 1899-1903-cü illərdə, ***Həmid bəy Şahtaxtinski*** 1904-1909-cu illərdə***, Mirzə Cabbar Məmmədov*** 1910-1918-ci illərdə seminariyada Azərbaycan dili, ***Həbib bəy Səlimov*** isə 1909/10-cu tədris ilində gimnastika müəllimi işləmişdir. İrəvan Müəllimlər Seminariyasının məzunu Mirzə Rəhim Xəlilov seminariyaya Azərbaycan dili müəllimi vəzifəsinə müəllimi Axund Məmmədbağır Qazızadənin təqdimatı əsasında götürülmüşdür.



**Rəhim Musarza oğlu Xəlilov**
(1866-1909)

1866-cı ildə İrəvanda anadan olub. İrəvan Müəllimlər Seminariyasını bitirib. Pedaqoji fəaliyyətə 1892-ci ildə Uluxanlı kənd məktəbində müəllim kimi başlayıb. 1898-ci ildə Axund Məmmədbağır Qazızadənin təşəbbüsü ilə Qafqaz Tədris Dairəsi popeçitelinin əmri ilə İrəvan Müəllimlər Seminariyasına tatar (Azərbaycan-F.R.) dili müəllimi təyin olunub. 1903-cü ilə kimi seminariyada pedaqoji fəaliyyət göstərib. 1899-cu ildə İrəvanda "İrəvan quberniyası şiə müsəlmanlarının arasında məhərrəmlik təziyədarlığı" adlı kitabı nəşr olunub. "Qafqaz ölkəsi və xalqlarının təsviri üçün material-

lar"da (SMOMPK) xeyli məqaləsi[1] nəşr olunub. İrəvanda maarifçiliyin inkişafında xüsusi xidmətləri olub. 1898-ci ildə mart ayının 29-da İrəvan şəhərində Göy məsciddə yeni tipli məktəbin (rus-Azərbaycan) açılması üçün yaradılan 14 nəfərlik komissiyanın üzvü olub və hər ay üzvülük haqqı ödəyib. 1909-cu ildə erməni fitnəkarlığının qurbanı olub, zəhərlənərək öldürülüb.



**Həmid bəy Xəlil ağa oğlu Şahtaxtinski**
*Zaqafqaziya Xalq təhsil naziri,*
*AXC-nin Maarif və Dini Etiqad naziri,*
*professor*
*(1880-1944)*



1880-ci il martın 12-də Naxçıvan qəzasının Şahtaxtı kəndində anadan olmuşdur. İlk təhsilini mollaxanada almış, III dərəcəli şəhər məktəbində oxumuşdur. 1899-cu il iyunun 5-də İrəvan Müəllimlər Seminariyasının tam kursunu bitirərək 379 nömrəli attestat almışdır. 1899-cu ilin sentyabrın 1-də İrəvan rus-tatar (Azərbaycan-F.R.) məktəbinə müəllim təyin edilmişdir. 1901-ci ildə ona İrəvan Müəllimlər Seminariyasında tatar dili (Azərbaycan dili- F.R.) dərslərini tədris etməyə icazə verilmiş, 9 aprel 1902-ci ildə tutduğu vəzifəyə təsdiq olunmuşdur. 1907-ci il oktyabrın 23-də öz xahişi ilə vəzifəsindən azad edilmişdir. 1907-ci ildə Odessa Universitetinin Hüquq fakültəsinə daxil olub. İkinci kursda oxuyarkən xəstələndiyindən Bakıya qayıdıb, bir il Bakı Alekseyevsk ali hazırlıq məktəbində müəllim işləyib. Sonra yenidən Odessaya qayıdaraq təhsilini davam etdirib, 1912-ci ildə universiteti bitirib. 1913-cü il mayın 30-da II dərəcəli diploma layiq görülüb. 1913-cü ildə Bakı quberniyası xalq məktəbləri direktorunun icazəsi ilə müəllim hazırlamaq üçün şəxsi kurs açıb, Ramanada, Alekseyevsk peşə məktəbində, Gəncə Müəllimlər Seminariyasında riyaziyyat müəllimi işləyib. Qazax və Nuxa qəzaları

[1]Allahverdiyev C. İrəvan Müəllimlər Seminariyası.Bakı:Elm və təhsil, 2022, s.67

üzrə xalq məktəblərinin təlimatçısı olub. 1918-ci ildə Zaqafqaziya Seymi formalaşdıqdan sonra Zaqafqaziya Hökumətinin Xalq təhsili naziri vəzifəsində çalışıb. 1918-ci ilin iyunun 6-da F.X.Xoyskinin Gəncədə formalaşdırdığı ikinci və üçüncü Hökumət kabinetində H.Şahtaxtinski Xalq Maarifi və Dini etiqad nazirinin müavini olub, 1919-cu ilin dekabrın 24-də N.Yusifbəylinin formalaşdırdığı ikinci (sayca 5-ci) Hökumət kabinetində Maarif və Dini Etiqad naziri təyin olunub. BDU-nun təşkilində önəmli rol oynayıb, orada müəllim, prorektor (1919-1925) olub. Ali Pedaqoji İnstitutun yaradılması layihəsinin müəlliflərindən biri olub. Ali Pedaqoji İnstitutda, Bakı Xalq Maarifi şöbəsi nəzdindəki ikiillik Müəllimlər İnstitutunda, Tibb İnstitutunda (1930-1940) işləyib. Pedaqoji İnstitutda pedaqogika və psixologiyadan dərs deyib. Tiflisdəki Zaqafqaziya Universitetinin Tibb fakültəsini bitirib (1928). 1930-cu ildə ADU-nun 10 illik yubileyində ona professor elmi adı verilib. Azərbaycan dilində elmi terminologiyanın tərtibi üzrə komissiyaların sədri olmuş, yeni Azərbaycan əlifbasının və ümumtəhsil məktəbləri üçün dərsliklərin hazırlanmasında iştirak etmişdir. H.Şahtaxtinski repressiyaya məruz qalmış, 1941-ci ildə həbs edilərək sürgün edilmişdir. 1944-cü il fevralın 3-də Arxangelsk vilayətində sürgündə vəfat edib.





**Mirzə Cabbar Abbas oğlu Məhəmmədzadə**
(1882-1938)

20 yanvar 1882-ci ildə İrəvan şəhərində "fars Abbasın"[1] ailəsində anadan olub. 1894-cü ildə İrəvan Müəllimlər Seminariyasının nəzdindəki ibtidai məktəbə daxil olub. 1902-ci ildə İrəvan Müəllimlər Seminariyasını bitirib.

1902-1903-cü illərdə Nehrəm məktəbində, 1903-1904-cü illərdə Qəmərli məktəbində, 1904-1905-ci illərdə İmanşalı məktəbində müəllim işləyib. 1905-ci ildə Qəmərli məktəbinə smotritel (nəzarətçi) təyin olunub. 1906-cı il avqustun 29-da ailə vəziyyətinə görə işdən azad olunub. 1906-cı ilin payızında İrəvana - İbadulla bəy Muğanlinskinin şəxsi məktəbinə dəvət olunub. Burada o, riyaziyyat və rus dili fənlərini tədris edib. 1911-ci ilin məlumatına görə, məktəbdə 8-11 yaşlı 20 oğlan oxuyurdu. Məktəbdə dərslər onun tərtib etdiyi cədvəl əsasında ibtidai məktəb proqramı əsasında keçirilirdi.



1910-1917-ci illərdə qısa fasilə ilə İrəvan Müəllimlər Seminariyasında tatar dili (Azərbaycan dili -F.R.) müəllimi işləyib. Həmin dövrdə o, həm də İrəvan kişi gimnaziyasında dərs deyib. Görkəmli ictimai xadimlər Əsəd Şeyxzadənin, Maqsud Məmmədovun, akademiklər Mustafa bəy Topçubaşovun, Heydər Hüseynovun, Həmid bəy Şahtaxtlının, professorlar Əziz Əliyevin, Əziz Şərifin, Mehdi xan İrəvanskinin müəllimi olub. Əziz Şərif müəllimi ilə bağlı xatirələrində yazırdı: "*Müəllimimiz Cabbar bəy çox mehriban və xoşxasiyyətli adam idi. Ucaboy, qaraşın gənc müəllimimizin olduqca məlahətli təbəssümü var idi. O, güləndə sifətindən sanki nur yağırdı. Mən də onu çox sevər və hörmətini saxlayardım*".

---

[1]Fars dilini gözəl bildiyi üçün **Mirzə Abbas Mirzəzadəyə** (1846-1919) "fars Abbas" deyirmişlər. İrəvan kişi gimnaziyasında və pansionda fars dili müəllimi kimi fəaliyyət göstərib. Görkəmli ədəbiyyatşünas Əziz Şərif ondan fars dilini öyrənib. 1912-ci ildə Bakıda "Güldəstə", 1913-cü ildə "Bədrağatül-Ətfal" və "Самоучитель фарсидского языка для русских» kitabları nəşr olunub.

Birinci Dünya müharibəsi zamanı çar hökuməti seminariyanı Armavirə köçürəndə o da müəllimlərlə birlikdə oraya getməli olmuşdur.

1914-cü il noyabrın 14-də Mirzə Cabbar İrəvandan dostu A.Şaiqə yazırdı:*"İrəvan sərhəd olduğuna cəhət dava vaxtı nə halətə düşəcəyini... düşünsəniz, səbəbi sizə məlum olar. Bundan əlavə idarə və məktəbin hamısına əmr gəlmiş ki, hazır olsunlar, xəbər verildiyi vaxt hamı vağzala gəlib fövrişəhərdən çıxsınlar. Çox səbəblərə görəmən də seminariya müəllimləri ilə bərabər şəhərdən qaçmağa məcburəm. Əks surətdə dövlətə xəyanət etmiş bir vücud silkinə daxil oluram... Bizim yerlərin gələcəyini çox həyəcanlı və qanlı görürəm*". Armavirdə o, ana dili ilə bərabər, həm də şəriət fənnini tədris edib.

Mirzə Cabbar görkəmli Azərbaycan ziyalısı Abdulla Şaiqlə yaxın dost olub. 1918-1920-ci illərdə Naxçıvan ali ibtidai məktəbində coğrafiya və türk (Azərbaycan-F.R.) dilindən dərs deyib. "Самоучитель тюркского языка для русских» "Самоучитель русского языка для тюрок» "Самоучитель русского языка для персов" kitablarının müəllifidir. Fars dilinin tədrisinə dair yazdığı "Bədrəqətül-ətfal" adlı kitabı 1911-ci ildə Bakıda nəşr olunub.



Azərbaycan Dövlət Universitetində (1920-1921), Azərbaycan Politexnik İnstitutunda (1921-1932), Kooperativ İnstitutunda (1932-1938) elmi-pedaqoji fəaliyyətlə məşğul olub. Azərbaycan Dövlət Universitetinin məzunu olub. 1932-ci ildə Kooperativ İnstitutun Türk dilləri kafedrasının müdiri və dosenti vəzifəsinə seçilib. 1935-ci ildə ona dil və ədəbiyyat üzrə elmlər namizədi elmi dərəcəsi və professor elmi adı, 1937-ci ildə elmlər doktoru elmi dərəcəsi verilib. 1937-ci ildə həbs edilərək güllələnib[1]. Bakının Yasamal rayonundakı küçələrdən biri Cabbar Məmmədzadənin adını daşıyır.

---

[1] Bəzi məqalələrdə onun qardaşı Mirzə Qafarın da İrəvan Müəllimlər Seminariyasını bitirdiyi bildirilir. Bu fikir yanlışdır. O, 7 iyun 1908-ci ildə Qori Müəllimlər Seminariyasını bitirib. Şəhadətnaməsini (№ 830) S.M.Qəniyev və F.Köçərli imzalayıblar. 4 iyul 1908-ci ildə Zaqafqaziya müəllimlər seminariyasının direktoru İrəvan xalq məktəbləri direktoruna göndərdiyi rəsmi məktubda (№ 979) yazmışdır: Bu il seminariyanı bitirənlərdən üç nəfəri İrəvan quberniyasında işləmək arzusunda olduğunu bildirmişdir. Onlardan biri Qafar Məmmədovdur. Onun təyinatını İrəvan məktəbinə verirlər. 1910-cu ilin 28 sentyabrında Qafar Məmmədov Şahtaxtındakı məktəbə təyin edilib. 5 sentyabr 1911-ci ildə öz ərizəsi əsasında işdən azad edilib. 1918-ci ildə qardaşı Cabbar Məhəmmədovun ailəsi ilə birlikdə Naxçıvana gəlib. Bir müddət burada yaşayıb və sonralar Təbrizə getmiş və orada yaşamışdır. Sonra Nərimanov adına məktəbdə rus dili müəllimi və Culfada gömrükxanada işləyib. 1934-1948-ci illərdə Tehrandakı səfirlikdə çalışıb.



## Həbib bəy Yusif bəy oğlu Səlimov
*(1881-1920)*
*general-mayor*

1881-ci il fevralın 8-də İrəvanda doğulub. Atası Yusif bəy İrəvan quberniyasının məhkəmə iclasçısı olub. İrəvan Müəllimlər Seminariyasını və İrəvan kişi gimnaziyasını bitirib. Tiflis piyada yunker məktəbini 1-ci dərəcə üzrə bitirib. 1900-cü ilin avqustun 12-də orduya könüllü yazılaraq 156-cı Yelizavetpol (Gəncə) süvari alayında 1 il 2 ay xidmət edib, unter-zabit rütbəsi alıb. 1902-ci ildə Tiflisdə süvari məktəbini bitirəndən sonra Üçüncü Qafqaz Atıcı Batalyonunda xidmətə başlayıb, podporuçik olub. 1905-ci ildə batalyon komandirinin yavəri, 1907-ci ildə elə həmin hərbi hissədə üçüncü rotanın komandiri təyin olunub. Həmin ilin sentyabrında Müqəddəs Vladimir ordeni ilə təltif edilib. Həbib bəy 1908–1910-cu illərdə Beşinci Qafqaz Atıcı Batalyonunun tərkibində Naxçıvanın Culfa sərhədlərində xidmət edib, məxfi tapşırıqla Tehrana göndərilib. Qısa bir müddətdə İrəvan Müəllimlər Seminariyasında gimnastika (fiziki tərbiyə) müəllimi işləyib. 1912-ci ildə kapitan rütbəsi alıb. Daha sonra Peterburqda Baş Qərargahın Nikolayev Hərbi Akademiyasını bitirib. Azərbaycan Xalq Cümhuriyyəti ordusunda Dəftərxana rəisi vəzifəsində çalışıb. Nuru Paşa tərəfindən Əlahiddə Azərbaycan Korpusunun Qərargah rəisi təyin edilib və Azərbaycan qoşunlarının Gəncədən Bakıya qədərki yürüşündə Cənub qrupunun komandanı olub. Bu yürüşdə daşnak-bolşeviklərə qarşı uğurlu əməliyyatlarına görə ona polkovnik hərbi rütbəsi verilib.

Azərbaycan korpusunun Baş Qərargah rəisi və Baş Ərkan-i Hərbin rəhbəri vəzifəsində çalışıb. Qısa müddətə Lənkəranın valisi olub. Bakının azad edilməsindəki xidmətlərinə görə general-mayor rütbəsi ilə təltif edilib. Aprel işğalından sonra Həbib bəy Səlimov Naxçıvanın hərbi komissarı olur, lakin bolşeviklərlə işləməyi rədd etdiyi üçün, 1920-ci ilin 1 sentyabrında həbs edilib və həmin ilin dekabr ayının 30-da güllələnib.

## Məmmədvəli Qəmərlinski İrəvan Müəllimlər Seminariyasının ana dili müəllimi olubmu?



İrəvan Müəllimlər Seminariyası ilə bağlı son illərdə nəşr olunan əksər yazılarda ***Məmmədvəli Qəmərlinski*** seminariyanın ana dili müəllimlərindən biri olduğu bildirilir. Mötəbər mənbələrdən biri olan "Qafqaz təqvimi"nin heç bir sayında belə bir qeydə rast gəlmədik. Amma onu qeyd edək ki, Məmmədvəli Qəmərli (Qəmərlinski) İrəvanda maarifin və maarifçiliyin inkişafında mühüm xidmətlər göstərib.

O, 1871-ci ildə İrəvan şəhərində çar ordusunun generalı Əli Qəmərlinskinin ailəsində anadan olub. Mollaxanada dini təhsil alıb, ərəb və fars dillərini öyrənib. İrəvan kişi gimnaziyasını bitirib. İrəvanda bir





*Məmmədvəli Qəmərlinski şagirdləri ilə (1904)*

və ikisinifli məktəblərdə ana dilindən dərs deyib. 1900-cü il martın 13 -də İrəvan Quberniya məclisində imtahan verərək ana dili müəllimi adını alıb. 1901–1911-ci illərdə İrəvan rus-tatar (Azərbaycan) məktəbində müəllim işləyib. "Atalar sözü", "İrəvan Quberniyası haqqında xatirələr" kitablarının, eləcə də birinci, ikinci və üçüncü siniflər üçün "Ana dili" dərsliklərinin müəlliflərindən biri olub. İrəvanda ilk müsəlman qızlar məktəbinin açılmasının təşəbbüskarlarından olub. Həmin məktəbdə şəriət müəllimi olub. 1906-cı ildə Bakıda keçirilən Azərbaycan müəllimlərinin I qurultayının iştirakçısı olub. 1916-cı ildə ailəsi ilə birlikdə Gəncə şəhərinə köçüb. Burada müəllim və məktəb direktoru işləyib. İşlədiyi məktəbdə ermənilər tərəfindən vəhşicəsinə qətlə yetirilib. Oğlu Əli Qəmərlinski Qori Müəllimlər seminariyasını və Marksizm-Leninizm Universitetini bitirib. Qəmərli kəndində müəllim işləyib. Gəncədə orta, orta ixtisas və ali məktəblərdə dərs deyib. "Azərbaycan SSR-in Əməkdar müəllimi" fəxri adına layiq görülüb.



## Seminariyanın azərbaycanlı məzunları

XIX əsrin II yarısında Azərbaycanda qəza, ibtidai kənd və şəhər məktəblərinin ildən-ilə sayının artması, realni məktəblərdə və gimnaziyalarda Azərbaycan dili və şəriət fənlərinin tədrisi milli müəllim kadrları hazırlığına ciddi tələbat yaratmışdı. Milli müəllim kadrları hazırlığına 1879-cu ildə Qori Müəllimlər Seminariyasının Azərbaycan şöbəsində başlanılmışdı.

İlk vaxtlar İrəvan Müəllimlər Seminariyasını ildə 5 nəfər azərbaycanlı tələbənin bitirməsi planlaşdırılırdı. Azərbaycanlılar yaşayan qəzalarda isə ildə 3-4 məktəb açılırdı. Məhdud sayda müəllim kadrları hazırlamaqla bu tələbatı ödəmək mümkün deyildi. 2 il sonra İrəvanda açılan müəllimlər seminariyası qismən bu boşluğu doldurmalı idi. Təəssüf ki, seminariyada xəzinə hesabına oxuyan rus tələbələri azərbaycanlılardan bir neçə dəfə çox idi. Azərbaycan dilini, xalqın adət-ənənəsini və milli xüsusiyyətlərini bilmədiyinə görə kənd məktəblərində uğur qazana bilməyən rus seminaristləri məcburi işləmə müddətini başa vurmadan Rusiyanın mərkəzi

quberniyalarına köçməli olurdular. Ona görə də İrəvan quberniyasında müəllim çatışmırdı.

İrəvan məktəblərində müəllim çatışmazlığının səbəbini Cəlil Məmmədquluzadə seminariyada müəllim hazırlığının ləng getməsi ilə əlaqələndirərək yazırdı: *"..müəllim tapılmır, ondan ötrü ki, seminariyadan üç ildə hıqqana-hıqqana bir müsəlman müəllimi çıxır"*.[1]

Aleksey Miropiyevin seminariyaya rəhbərlik etdiyi 1898-1902-ci illərdə seminariyaya azərbaycanlı tələbələrin seçilməsində, xəzinə hesabına oxudulmasında, pansionda yerləşdirilməsində və müəllimlik şəhadətnaməsinin verilməsində ciddi problemlər olmuşdur.

A.Miropiyev Orenburq təhsil dairəsində, Daşkənd, İrəvan və Qori müəllimlər seminariyalarında işləyərkən anti-türk, anti-müsəlman fəaliyyəti, inzibatçılığı və kobudluğu ilə tanınmışdı. Onda çar məmurlarına xas olan davranış normaları, mərkəzə hədsiz sədaqət, azad fikrə qarşı dözümsüzlük var idi. Onun həyasız tələbləri seminaristlərdə mövcud rejimə, çar üsuli-idarəsinə qarşı nifrət hissi yaradırdı. Qori Müəllimlər Seminariyasının məzunu İsfəndiyar Vəkilov xatirələrində yazır:"Mən yalnız həqiqəti dediyimə görə Miropiyev dedi: ***sən Yer üzündə həqiqət tapa bilməyəcəksən. Göyə qalxmağa və orada həqiqət axtarmağa isə qüdrətimiz çatmır".***



C.Məmmədquluzadə onunla bağlı yazırdı*:"Allah Miropiyev direktorun vücudunu bibəla eləsin ki, neçə il bundan irəli İrəvan seminariyasında direktor idi. Bir müsəlman uşağı gəlib ərizə verərdi ki, mən istəyirəm seminariyaya girəm, cənab Miropiyev əyilib diqqətlə baxardı cavanın üzünə və ərizəsini qaytarıb verərdi və deyərdi:***bala, səni götürə bilmərəm; ondan ötrü ki, qaşın qaradır.** *Haman cənab Miropiyevdir ki, indi Qori seminariyasında da* ***müsəlmanlara şəriət dərsini rus dilində oxudur****."*[2]

Seminariyanın şəriət müəllimi Axund Məmmədbağır Qazızadə bu məsələ ilə bağlı dəfələrlə İrəvan xalq məktəbləri direktorluğuna, Qafqaz canişininə və Qafqaz Təlim Dairəsinin popeçitelinə müraciət etmişdir. Hətta onun bu fədakarlığı mollanəsrəddinçilərin də diqqətindən yayınmamışdır. "Molla Nəsrəddin" jurnalı Axund Məmmədbağır Qazızadənin seminariya ilə bağlı Qafqaz canişininə etdiyi

---

[1] ***C.Məmmədquluzadə.*** *Əsərləri. Bakı.Azərnəşr,1984, s.117*

[2] *Yenə orada,s.117*

şikayəti İrəvan müxbiri "Anaş qurbağa" adından özünəməxsus şəkildə satirik dillə aşağıdakı kimi qələmə almışdır: *"Ey qraf ağa, sən allah bir insaf elə, axır bu seminariya ki, İrəvanda var, axır buyur görək bunu kimdən ötrü hökumət açıb? Əgər buyursanız ki, İrəvan camaatından ötrü açıb, elədə bəs di buyur gedək seminariyaya və dəftəri tökək qabağımıza, baxaq görək ildə burdan müsəlmanlardan neçə uşaq müəllimliyə çıxır. Di, buyur zəhmət çək, gedək baxaq. Mən özüm bu seminariyada 48 ildir şəriət dərsi deyirəm və nə zəhmətlər çəkmişəm. Mən gündə seminariyada **iyirmi-otuz kafir və murdar uçtellər ilə əl-ələ vermişəm**! Vallah, belə bilsəydim ki, axırı belə olacaq, heç vaxt bu zəhmətlərə qatılaşmazdım. İndi gör işin axırı nə yerə çatıb. Bir yerdəki müsəlman istəyir məktəb açsın- müəllim yox...*

*Ay qraf ağa, axı belə olmaz, bizim camaat yazıqdır, niyə seminariyanı doldurublar rus uşaqları ilə?"*[1]

Satirik dillə qələmə alınan bu felyetonda çar Rusiyasının milli ucqarlarda müəllim kadrları hazırlığı sahəsində həyata keçirtdiyi ikili siyasət bütün incəliklərinə kimi təsvir edilmişdir.

Statistik rəqəmlərə diqqət yetirsək seminariyanın məzunlarının sayının o qədər də çox olmadığını görərik.



İrəvan Müəllimlər Seminariyasını 1884-cü ildə 5, 1885-ci ildə 9, 1886-cı ildə 14, 1887-ci ildə 6, 1888-ci ildə 10, 1889-cu ildə 13, 1890-cı ildə 12 nəfər olub. Bu illər ərzində 69 nəfər ibtidai məktəb müəllimi adını alıb[2]

Məzunların 39 nəfəri İrəvan-Yelizavetpol, 2 nəfəri Bakı və Dağıstan, 1 nəfəri Kutaisi, 1 nəfəri Stavropol məktəblərinə göndərilib. 1891-ci ildə seminariyanın 12, 1892-ci ildə 4, 1893-cü ildə 5, 1894-cü ildə 9, 1895-ci ildə 14 nəfər məzunu olub[3] .

1881-1895-ci illərdə seminariyanın 12 buraxılışı olub ki, burada da 123 nəfərə ibtidai məktəb müəllimi adı verilib. Onlardan 25 nəfəri azərbaycanlı, 67 nəfəri erməni, 8 nəfəri rus, 2 nəfəri dağlı, 10 nəfəri digər millətlərin nümayəndələri olub.

1895-1915-ci illərdə İrəvan Müəllimlər Seminariyasında 38 nəfər, 1916-cı ildə 19 nəfər, 1917-ci ildə 22 nəfər, 1918-ci ildə 23 nəfər azərbaycanlı oxuyub.[4]

---

[1] **C.Məmmədquluzadə.** Əsərləri. Bakı Azərnəşr, 1984, s.116

[2] Ermənistan Respublikası DTA f.3.siy.3.iş 151,v.2,5

[3] Ermənistan Respublikası DTA f.3.siy.1.iş 209,v.2

[4] Ermənistan Respublikası DTA f.197.iş 5,v.9




"Qafqaz təqvimi"nin 1913-cü il sayında verilən məlumata görə, seminariyada təhsil alan 128 tələbədən 46-sı rus (36%), 37-si erməni (28,9%), 30-u azərbaycanlı (23,4%), 6-sı gürcü (4,7%), 9-u digər millətin (7%) nümayəndələri olub.

Seminariyanın sonuncu direktoru V.Dobrotinin 1918-ci ildə yazdığı hesabata görə, 1915/16-cı tədris ilində seminariyada 19 nəfər, 1916/17-ci tədris ilində 22 nəfər, 1917/18-ci tədris ilində isə 23 nəfər azərbaycanlı təhsil almışdır.

Bəzi mənbələrdə İrəvan Müəllimlər Seminariyasını üç il ərzində (1915, 1916, 1917-ci illərdən) 316 nəfərin bitirməsi, onlardan da 64 nəfərinin azərbaycanlı, 2 nəfərinin türk olduğu bildirilir. Bu fikir yanlışdır. V.Dobrotinin hesabatında həmin sayda azərbaycanlı tələbənin 1915-1917-ci illərdə seminariyada oxuduğu bildirilir.

Qafqaz Tədris Dairəsinin popeçitelinin 1913-cü ilə aid hesabatında İrəvan Müəllimlər Seminariyasını 1913-cü ilə kimi 358 nəfərin (24 nəfər həmin ilin məzunu idi) bitirməsi haqqında məlumat verilir. Belə bir mənbənin mötəbərliyinə şübhə etmək mümkün deyil.

Hər il Qafqaz Tədris Dairəsininin popeçiteli Rusiya Xalq Maarif Nazirliyinə göndərdiyi birillik hesabatını nəşr etdirirdi. *Vasili Nikolayeviç Semyonov* (1848-1852) tərəfindən əsası qoyulan bu ənənə *Aleksandr Pavloviç Nikolay* (1852-1860), *Yanuari Mixayloviç Neverov* (1864-1878), *Kirill Petroviç Yanovski* (1878-1901), *Mixail Romualdoviç Zavadskiy* (1901—1906) və *Nikolay Fyodroviç Rudolf* tərəfindən inkişaf etdirilmişdir. N.F.Rudolf 1913-cü ilə aid hesabatında, yuxarıda da qeyd etdiyim kimi, İrəvan Müəllimlər Seminariyasını cəmi 358 nəfərin bitirməsini bildirir ki, onlardan da 56-sı tatar (azərbaycanlı -F.R), 104-ü rus, 105-i erməni, 15-i gürcü, 2-si dağlı, 76-sı digər millətin nümayəndələri olmuşdur. Sonrakı 4 ildə də seminariyanı ən yaxşı halda 20-25 nəfər bitirə bilərdi. Belə

ki, 1916-cı ildə seminariyanın hazırlıq sinfinə 3, 1917-ci ildə isə 1 nəfər azərbaycanlı qəbul olunmuşdur.

Seminariyanın 20-ci buraxılışı 1903-cü ildə, 30-cu buraxılışı 1913-cü ildə, 32-ci buraxılışı isə 1915-ci ildə olmuşdur.

XIX əsrin sonu, XX əsrin əvvəllərində İrəvan quberniyasında işləyən müəllimlərin və məktəb müdirlərinin xeyli hissəsi müxtəlif illərdə həmin seminariyada ekstern yolu ilə imtahan verərək müəllimlik hüququ qazanmışdılar. Bu nəcib işin təşəbbüskarı və təşkilatçısı qocaman maarif xadimi Axund Məmmədbağır Qazızadə olmuşdur.

Digər seminariyalarda olduğu kimi, İrəvan Müəllimlər Seminariyasında da tələbələr həm dövlət vəsaiti, həm də öz hesablarına oxuyurdu. Məsələn, 1907-ci ilin məlumatına görə, seminariyada təhsil alan 70 şagirddən 50-si dövlət vəsaiti, 20-si isə öz hesabına oxuyurdu. Ödənişli əsaslarla qəbul olunanlar birinci tədris ilində 210 manat, sonrakı illərdə 180 manat təhsil haqqı ödəyirdilər. Dövlət vəsaiti hesabına oxuyanlar təyinat üzrə 6 il işləməli olurdular. Təyinatdan imtina edənlər dövlət xəzinəsinə 520 rubl. ödəməyə borclu idilər.



Əhməd bəy Qazıyev, Əli Əşrəf Qaziyev, Həsən bəy Axund Molla Xəlil bəy oğlu Qaziyev, Fərəməz Mahmudbəyov, Yusif bəy Qazıyev (Qazızadə), Məmməd bəy Əli bəy oğlu Mahmudbəyov, Xəlil Məmmədəliyev, Həsən Nəsirbəyov, Saleh Məşədi Teymur oğlu Güllücinski, Ağa bəy Rəhim bəy oğlu Firudinbəyov, Abbas Allahverdi oğlu Qədimov, Əli Sultanov, Fərrux Ağakişibəyov, Əli Cəlilzadə, Mirzə Bağır Əliyev, Şıxəli bəy Firudinbəyov, Cəfərbəy Cəfərbəyov, İbrahim Şahtaxtlı, Rəşid bəy İsmayılov, Həbib bəy Səlimov, Cabbar Məhəmmədzadə (Mirzə Cabbar Məmmədov), Vahid Musabəyov, Hüseynəli bəy Rüstəmbəyov, Tağı bəy Səfiyev, Şəmdin Mahmudbəyov, Həmid bəy Şahtaxtinski, İbadulla bəy Muğanlinski və başqaları ayrı-ayrı vaxtlarda seminariyanın məzunları olmuşdur[1]. Türkiyənin görkəmli rəssamlarından olan İbrahim Səfi də həmin seminariyanın məzunu olmuşdur.

[1] İrəvan Müəllimlər Seminariyasının Ermənistan Dövlət Arxivində saxlanılan sənədləri ilə tanış ola bilmədiyimizdən məzunların tam siyahısını əldə edə bilmədik.

**Rəşid bəy Əsədbəy oğlu İsmayılov**
(1877-1942)



1877-ci ildə İrəvanda nüfuzlu bəy ailəsində anadan olub. Ailəsi sonradan Nuxa şəhərinə (Şəkiyə) köçüb. İrəvan Müəllimlər Seminariyasını 1905-ci ildə bitirib. Uzun müddət Tehranda və Tiflisdə yaşayıb. 1906-1916-cı illərdə Tehranda rus progimnaziyasının direktoru və Rus bankının mühasibinin köməkçisi vəzifələrində çalışıb. "Şərqi-Rus" qəzetinin fəal müxbirlərindən olub. "Şərqi-Rus" qəzeti bağlandıqdan sonra "Novaya obazreniya" və "Tifliskiy listok" qəzetlərində çalışıb. "Novaya obazreniya" qəzetinin "Müsəlman həyatı", "Yaxın Şərq" şöbələrinə rəhbərlik edib. "Sankt-Peterburqskiye vedomosti" qəzetində də məqalələri dərc olunub. 1908-1912-ci illərdə İranda Rusiya Maliyyə Nazirliyinin nümayəndəsinin katibi olub. 1917-1926-cı illərdə Bakıda ictimai-siyasi, pedaqoji və jurnalistik fəaliyyəti ilə məşğul olub. Azərbaycan Xalq Cümhuriyyətinin Nazirlər Şurasında məsul vəzifədə çalışıb, dəftərxana rəisi vəzifəsində işləyib. "Təzə zaman" ("Novaya vremya") qəzetini nəşr etmək istəsə də, buna nail ola bilməyib. Cümhuriyyətin süqutundan sonra Bakıdakı 18 nömrəli məktəbdə tarix müəllimi işləyib. 1920-ci ildə Azərbaycanın bolşeviklər tərəfindən işğalından sonra inqilabi tribunalın nümayəndəsi təyin edilib. 1922-ci ildə yad element kimi partiya sıralarından uzaqlaşdırılıb. 1928-1930-cu illərdə Tiflisdəki Kənd Təsərrüfatı bankında inspektor işləyib. 1934-cü ildə "zərərli şəxs" kimi həbs edilib, lakin 6 aylıq məhkumluq həyatından sonra azad edilib. 1935-1937-ci illərdə Xəzər Dəniz Gəmiçiliyində müxtəlif vəzifələrdə işləyib. 1937-ci ildə isə Bakı şəhərində Voroşilov rayonunda 1 saylı məktəbdə rus dili müəllimi işləyib. 1938-ci ildə repressiyaya məruz qalaraq 15 il müddətində azadlıqdan məhrum edilib. 1942-ci ildə Arxangelsk vilayətinin Solovetski islah əmək düşərgəsində vəfat edib. "Avropa rəsmi-adəti" (Tiflis, 1903), "Müxtəsər Qafqaz tarixi və Zaqafqaziyada zühur edən məşhur türk ədib və şairlərin

müxtəsər tərcümeyi-halları" (Tiflis, 1904), "Qafqazın qısa tarixi və Azərbaycan tatarlarının ədəbiyyatı" (Tiflis, 1916), "Azərbaycan tarixi" (Bakı, 1923) kitablarının və onlarla elmi-publisistik məqalənin müəllifidir.



**Fərrux bəy Əlikişi oğlu Ağakişibəyov**
(1879-1956)



1879-cu ildə Şuşa qəzasının Pərioğlular (indiki Ağdam rayonunun Pərioğlular kəndi) kəndində anadan olub. Əslən İrandan gələn Şahsevərlərdəndir. Ağdam ikisinifli məktəbində oxuyub. 1899-cu ildə İrəvan Müəllimlər Seminariyasını bitirib. Zəngəzur qəzasının Lənbəran, Qarıqışlaq, Minkənd kənd məktəblərində, Gəncə şəhər məktəbində pedaqoji fəaliyyətlə məşğul olub. 1909-1914-cü illərdə Odessada Novorossiya Universitetinin Tibb fakültəsində təhsil alıb. Odessa qəzasında və Odessa-Poltava cəbhəsində həkim işləyib. 1915-ci ildə Odessa cərrahlıq hospitalına ordinator qəbul olunub. 1918-ci ildə Azərbaycana qayıdaraq Şuşa xəstəxanasında cərrah işləyib. 1920-ci ildə Şuşa səhiyyə şöbəsinin müdiri təyin olunub. Onun təşəbbüsü ilə Ağdamda xəstəxana və 1936-cı ildə tibb məktəbi yaradılıb. 1941-1945-ci illərdə Ağdam hərbi komissarlığında tibb komissiyasının sədri olub. 1925-ci ildə sahə həkimlərinin Moskvada keçirilən I Ümumittifaq qurultayının iştirakçısı olub. O, həmin qurultayda çıxış edərək demişdir: *"Mən bu günü həyatımda ən xoşbəxt günlərimdən biri hesab edirəm. Mən ona görə xoşbəxtəm ki, zəhmətkeş kəndlinin sağlamlığını qoruyuram, onları müalicə edirəm. Biz – azərbaycanlı həkimlər təkcə bununla kifayətlənmirik, elə etməliyik ki,*

*proletar ideyalarımız respublikamızın sərhədlərindən uzaqlarda da yayılsın"*.

Səhiyyə sahəsindəki səmərəli fəaliyyətinə görə 1942-ci ildə ona Əməkdar həkim fəxri adı verilib. 1956-cı ildə Gəncə şəhərində vəfat edib.

**Haşım bəy Mirabdulla oğlu Vəzirov**
(1867– 1916)



1867-ci ildə Şuşa şəhərində anadan olub və ilk təhsilini də orada alıb. Onun ulu babası Mir İmamverdi Qarabağ xanının vəziri olub, övladları xanlıqda bəyzadələr kimi məşhurlaşıb, "vəzir" ifadəsini özlərinə soyad seçiblər. Haşım bəy əvvəlcə Molla Həmid və Molla Əlidən dərs alıb, sonra şəhər məktəbini bitirib. İrəvan Müəllimlər Seminariyasını bitirdikdən sonra əvvəlcə Böyük Vedi kəndində, sonra İrəvan şəhərində, Cavanşir qəzasının Alpout, Şəki qəzasının Kiçik Köynük, Cavanşir qəzasının Bərdə kəndlərində müəllimlik etmişdir. Şuşada rus-tatar (Azərbaycan-F.R.) məktəbinə rəhbərlik edib. Məktəbdə işləməklə bərabər İrəvan şəhər bələdiyyə idarəsinə qlasnı seçilib. Şuşa realni məktəbinin hazırlıq sinfində ana dilindən dərs deyib. "Tazə həyat" (1907–1908), "İttifaq" (1908–1909), "Səda" (1909–1911), "Kavkazets" (1911, rus dilində), "Sədayi-vətən" (1911), "Sədayi-həqq" (1912), "Sədayi-Qafqaz" (1915–1916) qəzetlərində və "Məzəli" (1914–1915) jurnalında xeyli publisistik yazıları nəşr olunub. "İrşad" qəzetinin müvəqqəti redaktoru olub (qəzetin 15 sayı onun redaktorluğu ilə çıxıb). "Tazə həyat" (1907), "İttifaq" (1908-1909), "Səda" qəzetlərini nəşr etdirib. "Səda" qəzeti bağlandıqdan sonra "Sədayi-vətən", "Sədayi-həqq", "Sədayi-Qafqaz" qəzetlərini nəşr etdirib. "Məzəli" jurnalının mühərriri olub. "Döymə qapımı,

döyərlər qapını", "Evlənmək su içmək deyil", "Xan-xan" adlı komediyaların, "Uprava xalanın qızı Tramvay xanımın toyu" adlı birpərdəli məzhəkənin müəllifidir.

1916-cı ildə vəfat edib.



**Tağı bəy Baxşəli bəy oğlu Səfiyev**
(1878– 1937)

1878-ci ildə indiki Şərur rayonu Cəlilkənd kəndində (Baş Noraşen) anadan olub. İlk təhsilini Baş Noraşendəki ikisinifli zemstvo məktəbində Cəlil Məmmədquluzadədən alıb. C.Məmmədquluzadənin təklifi ilə 1889-1893-cü illərdə İrəvan Müəllimlər Seminariyasında təhsil alıb. Seminariyanı bitirdikdən sonra 2 il öz kəndlərindəki ibtidai məktəbdə dərs deyib, 1895/96-cı tədris ilindən pedaqoji fəaliyyətini C.Məmmədquluzadənin müdir olduğu ikisinifli Nehrəm məktəbində ikinci müəllim kimi davam etdirib. "Molla Nəsrəddin" jurnalının fəal yazarlarından olub. Sovet hakimiyyəti illərində Naxçıvan məktəblərində pedaqoji fəaliyyətini davam etdirib, Qars müqaviləsinin (1921) imzalanmasında Naxçıvanın təmsilçisi olub. 1923-cü ildə Naxçıvan Xalq Maarif Komissarlığında inspektor vəzifəsində çalışıb. "Rusca-türkcə lüğət"in (1929) müəllifidir. "Maarif zərbəçisi" döş nişanına layiq görülüb.

1937-ci ildə Baş Noraşen rayonunun Cəlilkənd kəndində vəfat etmişdir.

**Vahid Mehdi bəy oğlu Musabəyov**
(1864-1943)
Əmək qəhrəmanı



1864-cü il avqust ayının 1-də Qutqaşendə kəndli ailəsində anadan olub. 1885-1889-cu illərdə İrəvan Müəllimlər Seminariyasında təhsil alıb. Seminariyanı bitirdikdən sonra doğma kəndlərindəki birsinifli məktəbə müəllim təyin edilib. Nuxa qəzasında 3 şöbədən ibarət olan Qutqaşen məktəbi 12 sentyabr 1882-ci ildə açılmışdı. Məktəbdə hesab, coğrafiya, tarix, təbiətşünaslıq və rəsm fənləri tədris edilirdi. Həmin məktəbin ilk müəllimi və müdiri Rəşid bəy Əfəndiyev olmuşdur.

1925-ci ildə Nuxa dairəsindən Ümumrusiya müəllimlər qurultayına nümayəndə seçilib. 1931-ci il yanvarın 25-də keçirilən Azərbaycan müəllimlərinin V qurultayının nümayəndəsi olub. Qurultayda kənd müəllimləri üçün əlavə güzəştləri əks etdirən qətnamə qəbul edilib, ümumi icbari təhsilin həyata keçirilməsi, savadsızlığın ləğvi məsələləri müzakirə edilib.

Ömrünü ölkədə maarifçiliyin inkişafına və savadsızlığın aradan qaldırılmasına həsr edən Vahid Musabəyovun Qutqaşen rayon pedaqoji ictimaiyyəti tərəfindən pedaqoji fəaliyyətinin 35 illiyi qeyd edilib. Pedaqoji fəaliyyətindəki uğurlarına görə bir neçə dəfə qiymətli hədiyyə və fəxri fərmanlarla təltif olunub. Azərbaycan SSR Ali Soveti Rəyasət Heyətinin 15 oktyabr 1932-ci il tarixli fərmanı ilə "Əmək qəhrəmanı" fəxri adına layiq görülüb. Azərbaycan SSR Xalq Maarif Nazirliyinin 11 sentyabr 1938-ci il tarixli qərarı ilə ona orta məktəb müəllimi rütbəsi verilib.

13 may 1943-cü ildə 79 yaşında dünyasını dəyişmişdir.



**İbrahim Qafar oğlu Səfiyev**
**(İbrahim Səfi)**
(1898 -1983)

1898-ci ildə Naxçıvan qəzasının Şərur bölgəsində anadan olub. Üç yaşında atasını itirib. İlk təhsilini Baş Noraşen (indiki Cəlilkənd) kənd məktəbində aldıqdan sonra təhsilini İrəvan Müəllimlər Seminariyasında davam etdirib. 12 yaşında olarkən ilk rəsmini – "Araz balıqçıları"nı çəkib. 1915-1917-ci illərdə Moskva Rəssamlıq Akademiyasında oxuyub. Rusiyadakı 1917-ci il inqilabından sonra təhsilini yarımçıq qoyaraq Naxçıvana qayıdıb. Birinci Dünya müharibəsində Zaqafqaziyadakı ordunun tərkibində Türkiyəyə gedib və ömrünün sonuna kimi burada yaşayıb. Atatürkün portretini çəkən ilk rəssamlardan biridir. 1920-ci ildə Türkiyədə keçirilən Avropa rəssamları müsabiqəsinin mükafatını alıb. 1923-cü ildə İstanbulda Sanayi Nefise Mektebini (Gözəl Sənətlər Akademiyası) bitirib. Türkiyənin məşhur rəssamı Namik İsmayılın emalatxanasında «Misafir Talebe» olaraq çalışıb.



1924-cü ildən etibarən beynəlxalq sərgilərdə iştirak edib. 11 il Avropa ölkələrində yaşayıb. Türkiyə ilə yanaşı, Fransa, Avstriya, ABŞ, İsveçrə və s. ölkələrdə fərdi sərgiləri olub. Azərbaycan rəsm sənətinin görkəmli nümayəndəsi İbrahim Səfiyevin adı əbədiləşdirilmiş, Türkiyə Respublikasının İstanbul şəhərindəki İstiqlal prospektində onun yaşadığı binanın üzərinə xatirə lövhəsi vurulmuşdur.

4 yanvar 1983-cü ildə Oda Kule iş Mərkəzinin art salonunda yüzüncü fərdi sərgisinin açılış gününün axşamı qəflətən vəfat edib.

Naxçıvan Muxtar Respublikası Ali Məclisinin Sədri Vasif Talıbov 17 oktyabr 2018-ci ildə "Görkəmli rəssam İbrahim Səfiyevin 120 illik yubileyinin keçirilməsi haqqında" sərəncam imzalayıb.

## Cəfər bəy Cəfərbəyov
(?-?)

1897-ci ildə İrəvan kişi gimnaziyası nəzdindəki hazırlıq sinfini bitirib. 1897-1901-ci illərdə İrəvan Müəllimlər Seminariyasında oxuyub. Seminariyanı bitirdikdən sonra Məhəmmədqulu bəy Kəngərlinskinin məktəbində müəllim-tərbiyəçi, Yengicədə və Aleksandropolda ibtidai məktəb müəllimi işləyib.

QTD-nin popeçiteli tərəfindən ona üçüncü dərəcəli xüsusi təhsil müəssisəsi açmaq icazəsi verilib. Qafqaz popeçitelinin İrəvan quberniyası xalq məktəbləri direktoruna göndərdiyi 20 noyabr 1907-ci il tarixli məktubunda Cəfər bəy Cəfərbəyovun üçüncü dərəcəli xüsusi təhsil müəssisəsi açmasına icazə verildiyi bildirilir. Bu o demək idi ki, o tatar (Azərbaycan-F.R.) dili və şəriətdən başqa qalan fənlərin rus dilində tədris edildiyi ibtidai məktəb aça bilərdi. Ona verilən icazədən istifadə edən Cəfər bəy Cəfərbəyov İrəvanda pansionat açmışdır. Burada gimnaziyada təhsil almaq istəyənlər oxuyurdular.



## Mirzə Cəlil oğlu Mirzəyev (Şürbi)
(1874-1915)



12 fevral 1874-cü ildə Naxçıvan şəhərində anadan olub. 1888-1892-ci illərdə İrəvan Müəllimlər Seminariyasında təhsil alıb. Şərur-Dərələyəz qəzasındakı Aralıq ibtidai məktəbində pedaqoji fəaliyyətə başlayıb. 1894-cü ildə Cəlil Məmmədquluzadənin müdiri olduğu Nehrəm məktəbində işləyib. Daha sonra pedaqoji fəaliyyətini Naxçıvan şəhər ibtidai məktəbində davam etdirib. 1903-1908-ci illərdə Ordubad qəzasının Vənənd kənd ibtidai mək-

təbinin, 1909-1913-cü illərdə Naxçıvan şəhər rus-tatar məktəbinin müdiri olub. "Kollec registratoru" rütbəsinə layiq görülüb. 27 avqust 1914-cü ildə Şahbuza müəllim göndərilsə də, 3 ay sonra vəzifəsindən azad olunub.

Cəlil Məmmədquluzadənin təşviqi ilə teatr hərəkatına qoşulub, Naxçıvan teatrında qadın rolları oynayıb, ədəbi-maarif tədbirlərinin təşkilində fəal iştirak edib. "Şürbi" təxəllüsü ilə şeirlər yazıb. Maarifçi şeirlərində fanatizmi, gerilik və cəhaləti tənqid edib, böyüyən nəsli yeniliyə, elmə və maarifə çağırıb. "Molla Nəsrəddin" jurnalının Naxçıvan üzrə təmsilçisi kimi jurnalın abunə və satış məsələləri ilə məşğul olub, jurnala xəbər və məqalələr göndərib. "Şərqi-Rus" qəzetində yazıları nəşr olunub. Cəlil Məmmədquluzadə "Ölülər" komediyasında Şübridən İskəndər obrazının prototiplərindən biri kimi faydalanıb. 1915-ci ildə İranın Rəşt şəhərində vəfat edib.





**Həsən Axund Molla Xəlil oğlu Qaziyev**
(1879-1950)

1879-cu ildə İrəvan şəhərində anadan olub. İbtidai təhsilini başa vurduqdan sonra 1892-1896-cı illərdə İrəvan Müəllimlər Seminariyasında oxuyub. Seminariyanı bitirdikdən sonra pedaqoji fəaliyyətə Uluxanlı məktəbində rus dili müəllimi kimi başlayıb. İrəvan quberniya müsəlmanlarının dini icmasının üzvü olub. 1918-ci ilə qədər İrəvan şəhərindəki müxtəlif məktəblərdə rus dili müəllimi işləyib. 1918-ci ildə erməni daşnaklarının törətdikləri qətliamlar zamanı Naxçıvana köçüb və ömrünün sonuna kimi burada pedaqoji texnikumda və müxtəlif ümumtəhsil məktəblərində rus dili müəllimi işləyib. Əməkdar müəllim fəxri adına layiq görülüb.

1950-ci ildə Naxçıvanda vəfat edib.

**Əli Əzim oğlu İbrahimov**
(1894- ?)



1894-cü ildə Ağdamda anadan olub. İbtidai təhsilini Ağdamda aldıqdan sonra müəllim olmaq arzusu ilə İrəvan Müəllimlər Seminariyasına daxil olub. 1910-1914-cü illərdə seminariyada təhsil alıb. Seminariyanı bitirdikdən sonra 1914-1916-cı illərdə Böyük Vedi kəndində müəllim işləyib. İnqilabi hərəkata qoşulub və onun fəal üzvlərindən olub. 1916-cı ildə Ağdama köçmüş, ömrünün sonuna kimi burada rus dili müəllimi işləmişdir.



**Mehdi Kərbəlayı Məhəmmədəli oğlu Kazımov**
(1890-1954)



1890-cı ildə İrəvan şəhərində anadan olub. İbtidai təhsilini İrəvanda alıb. 4 iyun 1910-cu ildə İrəvan Müəllimlər Seminariyasını bitirib. Ona verilən şəhadətnamədən aydın olur ki, oxuduğu 11 fənnin ikisindən 5, ikisindən 4, yeddisindən 3 qiymət alıb. Bu fənlərdən başqa o, nəğmə, gimnastika, əl əməyi dərslərini keçsə də, şəhadətnamədə bu haqda qeydlər yoxdur. Şəhadətnaməni imzalayanlar arasında Axund Qazızadə, tatar dili müəllimi Cabbar Məhəmmədzadənin adları vardır. Ona ibtidai məktəb müəllimi adı verilib, təyinat üzrə 6 il işləməsi, əks təqdirdə xəzinəyə 520 rubl ödəməli olacağı bildirilib.

1 sentyabr 1910-cu ildən 1 sentyabr 1916-cı ilədək İrəvan xalq məktəbləri direktorluğunun nəzdindəki ibtidai məktəblərdə müəl-



ДѢЛО 1 ~~36~~ 29

Господину Директору Тифлисскаго учительскаго института.

7/VII Д.М.

Учит. сем. 9/2

Смотрителя Аралыхъ-Башкендскаго 2-хъ класснаго училища, Мехти Кязумова.

Прошеніе.

Считая себя недостаточно подготовленнымъ къ современной педагогической дѣятельности въ народномъ училищѣ, прошу Васъ допустить меня къ пріемнымъ экзаменамъ для поступленія во ввѣренный Вамъ учительскій институтъ.

При семъ докладываю, что я окончилъ полный курсъ ученія въ Эриванской учительской семинаріи и седьмой годъ состою смотрителемъ 2-хъ классныхъ училищъ, документы мои хранятся въ дѣлахъ Эриванской дирекціи народныхъ училищъ и, вслѣдствіе моей просьбы, ею непосредственно будутъ представлены въ институтъ.

Прошу благоволить меня извѣстіемъ о началѣ и продолжительности пріемныхъ экзаменовъ.

Адресъ: Эривань, русско-татарское мужское училище Мехти Кязумову.

4-го іюля 1917 г.
гор. Эривань.

Смотритель Аралыхъ-Башкендскаго училища М. Кязумовъ

lim işləyib. Vənənd məktəbinin və Aralıq Başkənd məktəbinin müdiri vəzifəsində çalışıb. İrəvanda Azərbaycan teatrının inkişafında onun mühüm xidmətləri olub, teatrın səhnəsində bir sıra rollar ifa edib.

4 iyul 1917-ci ildə Tiflis Aleksandrovski Müəllimlər İnstitutunun direktoruna aşağıdakı məzmunda ərizə yazıb:"*Xalq məktəbində çağdaş pedaqoji fəaliyyətə özümü yetərincə saymadığıma görə məni Sizin Müəllimlər İnstitutuna daxil olmaqdan ötrü qəbul imtahanlarına buraxmağınızı xahiş edirəm. Bunu əlavə olaraq bildirirəm ki, İrəvan darülmüəlliminin tam təlim kursunu bitirmişəm və yeddinci ildir 2 sinifli məktəbin naziriyəm. Sənədlərim İrəvan xalq məktəbləri müdiriyyətinin işlərində saxlanılır və xahiş etdiyim zaman onları instituta təqdim edəcəklər. Qəbul imtahanlarının başlanğıcı və davamiyyəti haqqında mənə məlumat lütf etməyinizi rica edirəm*"[1].

Həmin dövrdə o, İrəvan kişi rus-tatar (Azərbaycan) məktəbinin müdiri idi. M.Kazımov 10 iyul 1917-ci ildə Tiflis Aleksandrovsk İnstitutuna qəbul olunub.

1918-ci ildə erməni daşnaklarının zülmündən qaçaraq Gəncəyə gəlib. Burada C.Cuvarlının təşkil etdiyi üçaylıq pedaqoji kursda biliyini təkmilləşdirib. Gədəbəydə oğlan məktəbinin direktoru (1920), Dəllərdə maarif şöbəsinin müdiri (1921) olub.

Ermənistanda sovet hakimiyyəti qurulduqdan sonra İrəvana qayıdıb. Burada azərbaycanlı ziyalıların təşəbbüsü ilə yaradılan

[1] **Mərdanov M.,Tahirzadə Ə.** 1920-ci ilədək ali məktəblərdə oxumuş azərbaycanlılar (Ensiklopedik soraq kitabı), IV cild. Bakı: Təhsil, 2020, s.104



*Mehdi Kazımov qızları ilə (1947)*



ilk təhsil ocaqlarında dərs deyib. O, 1922-ci ildə Ermənistan Xalq Maarif Komissarlığının nəzdində təşkil edilən "azlıqda qalan millətlər" şöbəsinin müdiri vəzifəsində çalışıb. İrəvanda Yeni Türk Əlifbası Komitəsinin sədr əvəzi və büro üzvü olub. 1924-cü ildə İrəvan Müəllimlər Seminariyasının xələfi olan İrəvan Türk Pedaqoji Texnikumunun açılmasının təşəbbüskarı və ilk direktoru olub. 1924-1933-cü illərdə Pedaqoji Texnikuma rəhbərlik edib. 1932-33-cü illərdə Ermənistan Proletar Yazıçılar Cəmiyyətinin azərbaycanlı bölməsinin məsul katibi vəzifəsində çalışıb.

1948-ci ilin noyabr ayında İrəvan Pedaqoji Məktəbinin Azərbaycanın Xanlar rayonuna köçürülməsi ilə əlaqədar Mehdi Kazımov da ailəsi ilə birlikdə həmin rayona köçməli olub. O, 1949-50-ci illərdə Xanlar Pedaqoji Məktəbində rus dili fənnini tədris edib. 1951-53-cü illərdə ADPİ-də (indiki ADPU) rus dili müəllimi vəzifəsində çalışıb. 1954-cü ildə Bakı şəhərində vəfat edib.

**Hüseynəli bəy Həsən bəy oğlu Rüstəmbəyov**
(1878 - 1920)

1878-ci ildə Şuşa şəhərində Həsən bəyin ailəsində anadan olub. İbtidai təhsilini molla yanında alıb, Şuşa realni məktəbində oxuyub. İrəvan Müəllimlər Seminariyasını bitirib. 1895-ci il sentyabrın 19-da Şuşada III dərəcəli xüsusi məktəb açıb. Həmin məktəb cəmi bir il fəaliyyət göstərib. Təhsil alan şagirdlər, əsasən kasıb və orta təbəqənin övladları olub. Şamaxı qəzasının Lahıc məktəbində və Şuşada ayrı-ayrı məktəblərdə pedaqoji fəaliyyətlə məşğul olub[1]. 2 dekabr 1920-ci ildə Şuşa şəhərində vəfat edib.

**İbrahim ağa Hacı Vəli ağa oğlu Şahtaxtinski**
(1881-1927)



1881-ci ildə Şahtaxtı kəndində anadan olub. Şahtaxtı kəndində, Naxçıvanda, Dərələyəzdə geniş torpaq sahələrinin, çoxsaylı mülklərin sahibi olub.

Atasından qalan var-dövlətini xalqının maariflənməsinə, təhsil almasına və xeyriyyəçiliyə sərf edib. İrəvan Müəllimlər Seminariyasının məzunu olan İbrahim ağa böyük maarifçi kimi tanınıb. Naxçıvanın ilk məktəblərindən olan Şahtaxtı kənd ikisinifli məktəbi onun himayəsində və şəxsi mülkündə fəaliyyət göstərib. 1913-1914-cü illərdə Bakıda jandarm idarəsində işləyib. 1918-1920-ci illərdə İrəvanda erməni vandallarının zülmündən qaçqın düşmüş soydaşlarımıza köməklik göstərib. Naxçıvanda İnqilab Komitəsinin sədri və İctimai təminat nazirinin müavini olub. 1926-cı ildən sonra İbrahim Şahtaxtinski sistemli təzyiqlərə məruz qalıb, mülkləri müsadirə olunub və özü isə həbs edilərək Tiflisdəki Metex qalasına göndərilib. Həbsdən buraxılsa da, həyatının ağır günlərini yaşamalı olub.

1927-ci ildə iş tapmaq məqsədi ilə Bakıya gələn İbrahim ağa burada qəflətən vəfat edib.

[1] Ətraflı bax: **Ənvər Çingizoğlu.** Qarabağda maarif, Bakı: Zərdabi LTD, 2013, 288 səh.

**Mirzə Bağır Yusif bəy oğlu Əliyev**
(1882 -1938)



1882-ci ildə Naxçıvan şəhərində anadan olub. Atasının Nehrəm kəndində və Naxçıvan şəhərində mülkləri olub. İlk təhsilini Naxçıvan şəhər qəza məktəbində alıb. İrəvan Müəllimlər Seminariyasının məzunu olub. Qəza məktəbində və seminariyada rus dilini, molla yanında ərəb, fars dillərini mükəmməl öyrənib. 11 sentyabr 1908-ci ildə İrəvan quberniyası xalq məktəbləri müdirinin əmri ilə Culfanın Yaycı kənd məktəbinə nəzarətçi (müdir) vəzifəsinə təyin edilib. Maarifin yayılmasında mühüm xidmətləri olan Mirzə Bağır Əliyev Yaycı məktəbində müdir olmaqla yanaşı, həm də rus dili və hesab fənlərini tədris edib. 1909-cu ilin oktyabrında quberniya mərkəzindən Yaycı kənd məktəbini yoxlamağa gələn inspektor Razumovski yoxlamadan sonra tərtib etdiyi aktda yazmışdı: "19 sentyabr 1909-cu ildə Yaycı məktəbini ziyarət etdim və məktəbin müəllimi Mirzə Bağır Əliyevin rus dili və hesab dərslərində iştirak etdim. Dərslər qənaətbəxşdir və tədris işində cənab Əliyevin səy və istəyi görünür".

1912-ci ilin aprel ayından 1916-cı ilin aprel ayına kimi Nehrəm məktəbində nəzarətçi (müdir) işləyib. Onun təşəbbüsü ilə məktəb təmir olunub, məktəb kitabxanasına Naxçıvandan və İrəvandan xeyli kitab gətirilib. Naxçıvanın erməni təcavüzündən və xarici müdaxiləçilərdən azad olunmasında fəal iştirak edib. Naxçıvan Müsəlman Milli Komitəsinin (sonralar Milli Şurası), Naxçıvan Araz-Türk Cümhuriyyətinin katibi işləyib. "Qanlı günlərimiz" kitabının müəllifidir. 10 oktyabr 1920-ci ildə İnqilab Komitəsinin qərarı ilə Daxili İşlər Şöbəsinin ümumi məlumat-təlimat şöbəsinin rəisi olub. Sovet hakimiyyəti illərində Mirzə Bağır Əliyev müəllim və hüquqşünas-vəkil kimi də fəaliyyət göstərib. "Səyyar" təxəllüsü ilə şeirlər yazıb. Qızı Xalq artisti Zəroş Həmzəyeva atası haqqında yazdığı "Atam haqqında bir neçə söz"dən məlum olur ki, o, 1937-ci ildə Naxçıvanın Siyasi İdarəsi tərəfindən həbs edilib. 1938-ci il sentyabrın 1-də qəflətən ürək tutmasından Naxçıvan şəhərində vəfat edib.



**Həsən Səfər oğlu Səfərli**
**(1888-1965)**

23 noyabr 1888-ci ildə Naxçıvan şəhərində anadan olub. İbtidai təhsilini Naxçıvanda alıb. 1913-1917-ci illərdə İrəvan Müəllimlər Seminariyasında təhsil alıb. Tiflis Aleksandr Müəllimlər İnstitutunda oxuyub. Seminariyada dram dərnəyinin fəal üzvlərindən olub. İrəvanın teatr truppasında epizodik rollarda çıxış edib. Səhnəyə ilk dəfə 1909-cu ildə Hüseyn Ərəblinskinin tamaşaya qoyduğu "Nadir şah" pyesindəki rolu ilə qədəm qoyub. Pedaqoji fəaliyyətə Naxçıvanda başlayıb. Müəllimlik fəaliyyəti ilə yanaşı, həvəskarların teatr truppasının fəal üzvlərindən biri olub. 1931-ci ilə qədər Naxçıvan Dövlət Dram Teatrında aktyor, rejissor, baş rejissor kimi çalışıb. Naxçıvanda ibtidai və orta məktəblərdə, Pedaqoji Texnikumda, Pambıqçılıq Texnikumunda, ikiillik Müəllimlər İnstitutunda dərs deyib. 18 may 1960-cı ildə Naxçıvan Muxtar Sovet Sosialist Respublikasının Əməkdar müəllimi fəxri adına layiq görülüb.

2 iyun 1960-cı ildə Naxçıvan şəhərində vəfat edib.



**Ələkbər Molla Hüseyn oğlu Qədimov**[1]
(1893-?)

23 yanvar 1893-cü ildə İrəvan quberniyasının Eçmiədzin qəzasının Qarxun kəndində Molla Hüseynin ailəsində anadan olub. 26 may 1910-cu ildə Uluxanlı normal 2 sinifli məktəbini bitirib. Məktəbi bitirməsi haqqında sənəddə məktəbin müdiri Şəmdin bəy

[1] Ətraflı bax: **M.Mərdanov, Ə.Tahirzadə.** 1920-ci ilədək ali məktəblərdə oxumuş azərbaycanlılar.Ensiklopedik soraq kitabı. IV c. Bakı: Təhsil, 2021, s.14


شهادتنامه

Свидѣтельство.

Дано сіе изъ Закавказскаго Шіитскаго Духовнаго Правленія въ томъ, что житель сел. Кархунъ Эчміадзинскаго уѣзда Эриванской губ. Алекберъ Молла-Гусейнъ-оглы родился отъ законной жены отца своего Молла-Гусейна Молла-Джамилъ-оглы, -Лейланы Гаджи-Алиасгаръ-кизи, двадцать третьяго января тысяча восемьсотъ девяносто третьяго (1893) года

въ чемъ Духовное Правленіе подписью и приложеніемъ казенной печати удостовѣряетъ. —

Января 31 дня 1909г. г. Тифлисъ.

№ 240

Гербовымъ сборомъ оплачено.

بادشاهلق مهر ایله تصدیق ایتدی.

ایلده تفلیس شهرنده .

نمره ۲۴۰

بوشهادتنامه‌دن اوتری گیربووی مارقه‌اداره‌یه یتشوبدر.

Врид. Предсѣдатель Правленія и Закавказскій Шейхъ-уль-Исламъ

Члены Правленія

Секретарь Правленія

Перевелъ: Помощникъ-Секретаря Г. Гасанзаде

Mahmudbəyovun və şəriət müəllimi Molla Əhməd Hacırəsulzadənin adı və imzaları var. 1910-1914-cü illərdə İrəvan Müəllimlər Seminariyasında təhsil alıb.

5 iyun 1914-cü ildə ona verilən 569 saylı şəhadətnamədə göstərilir ki, oxuduğu müddət ərzində 6 fəndən 5, 5 fəndən 4, yalnız rus və kilsə-slavyan dili fənnindən 3 qiymət alıb. Ona ibtidai məktəb müəllimi rütbəsi verilib, bu vəzifədə təyinatla 6 il işləməyə borcludur, əks təqdirdə xəzinəyə 670 rubl qaytarmalıdır. Ələkbər Qədimov seminariyanı bitirdikdən sonra 3 il Uluxanlı məktəbinin müdiri olub. Təyinat müddəti bitmədən İrəvan quberniya xalq məktəblərinin direktoruna 3 iyul 1917-ci ildə ərizə ilə müraciət edərək onun məcburi müəllimlik fəaliyyətinin qalan 3 ilindən azad edilməsini və Tiflis Aleksandrovsk Müəllimlər İnstitutunda oxumasına icazə verilməsini xahiş edib. Həmin vaxtı o İrəvan Puşkin adına ali ibtidai məktəbinin müəllimi[1] idi və sentyabr ayında təşkil ediləcək qısa müddətli pedaqoji kursların rəhbərlərindən biri təyin edilmişdi.

Aleksandrovski Müəllimlər İnstitutunun direktorunun ona ünvanlandığı məktubda instituta qəbul olunması və dərslərin noyabr ayının 22-də başlanması haqqında məlumat verilir.

[1] 1899-cu ildə A.S.Puşkinin anadan olmasının 100 illiyi münasibəti ilə Rusiya Xalq Maarif Nazirliyinin qərarı ilə İrəvan ali ibtidai məktəbinə A.S.Puşkinin adı verilmişdir.


ЦГИА ГССР
Фонд № 436
Опись № I
Дело № 2051

Фонд № 436
Тифлисский учительский институт
(название фонда)
(название структурной части)

ДЕЛО №2051
ТОМ №

(заголовок единицы хранения)

Начато „ „ г.
Окончено „ „ г.
на 2 листах

## Aslan bəy Məhəmmədəli bəy oğlu Nabatəlibəyov

(?-?)

İbtidai təhsilini İrəvan şəhərində alıb. 1904-1908-ci illərdə İrəvan Müəllimlər Seminariyasında oxuyub. Mövcud qaydalara uyğun olaraq 6 il İrəvan quberniyasının müxtəlif ibtidai məktəblərində işləyib. 1910-1911-ci illərdə Çobankərə kənd birsinifli məktəbində baxıcı (müdir) vəzifəsində çalışıb. Üç il İrəvan kişi gimnaziyasında sinif rəhbərinin köməkçisi vəzifəsində işləyib. M.Mərdanov və Ə.Tahirzadənin müəyyənləşdirdiklərinə görə[1], 22 noyabr 1917-ci ildə Tiflis Müəllimlər İnstitunun birinci kursuna qəbul olunmaq üçün ərizə ilə direktora müraciət edib. Ərizəsinin üstündə "qəbul edilsin" sözləri yazılıb. Həmin dövrdə o, İrəvan quberniya Şiə Ruhani Məclisinin dəftərxana müdiri işləyib. 1918-ci ildə digər soydaşlarımız kimi erməni vəhşiliyi nəticəsində Azərbaycana pənah gətirib. 12 may 1919-cu ildə Sosial müdafiə (ümuri-xeyriyyə) nazirinə müfəttiş vəzifəsinə götürülməsi ilə bağlı ərizə ilə müraciət edib. 3 iyul 1919-cu ildə arzusunda olduğu işlə müvəqqəti olsa da təmin edilib. 16 avqust 1919-cu ildə kargüzar vəzifəsinə təyin edilib. 17 sentyabr 1919-cu ildə Sosial müdafiə (ümuri-xeyriyyə) nazirliyinin dəftərxanasında statist vəzifəsinə keçirilib. 8 dekabr 1919-cu ildə Ümumi Xeyriyyə Nəzarəti Gəncə Dairəsinin müfəttişi təyin edilib.


Господину Директору Тифлисскаго Учительскаго Института

Асланъ-бека Набаталибекова

ПРОШЕНIЕ

Прошу Васъ зачислить меня слушателемъ I-го курса ввѣреннаго Вамъ института.

При этомъ заявляю, что окончилъ полный курсъ Эриванской Учительской Семинарiи, 6 лѣтъ состоялъ народнымъ учителемъ, третiй годъ состою помощникомъ классныхъ наставниковъ Эриванской мужской гимназiи, документы хранятся въ канцелярiи названной гимназiи и таковые представлю по первому востребованiю.

Адресъ мой: Эриванская мужская гимназiя

Асланъ-бекъ Набаталибековъ

22-го ноября 1917 года



[1] Ətraflı bax: M.Mərdanov, Ə.Tahirzadə. 1920-ci ilədək ali məktəblərdə oxumuş azərbaycanlılar. Ensiklopedik soraq kitabı. VI c. Bakı: Təhsil, 2021, s.14

**Məmməd bəy Lütfəli bəy oğlu Qazıyev**
(1867-1909)

1867-ci ildə İrəvan şəhərində anadan olub. 1882-1886-cı illərdə İrəvan Müəllimlər Seminariyasında təhsil alıb. Uluxanlı məktəbinə 2-ci müəllim təyin edilib. 6 iyun 1888-ci ildə baş Noraşen ikisinifli məktəbinə müdir təyin olunub. Cəlil Məmmədquluzadə ilə birlikdə həmin məktəbdə pedaqoji fəaliyyətlə məşğul olub. Onların birgə səyi ilə Baş Noraşen məktəbində müəllim və şagirdlərin iştirakı ilə tamaşa hazırlanaraq göstərilib, əldə edilən 40 manat yoxsul şagirdlərə xərclənib. Bu nəcib işinə görə Qafqaz Tədris Dairəsinin popeçiteli tərəfindən Məmməd Qazıyevə yazılı təşəkkür verilib.

1 sentyabr 1896-cı ildə Uluxanlı kənd məktəbinə müdir təyin edilib və ona *kollej katibi* rütbəsi verilib. Maarif sahəsindəki xidmətlərinə görə üçüncü dərəcəli "Müqəddəs Anna" ordeni ilə təltif edilib.



**Saleh Məşədi Teymur oğlu Güllücinski**
(1899-1938)



17 sentyabr 1899-cu ildə İrəvan şəhərinin yaxınlığındakı Güllücə kəndində anadan olub. Puşkin adına şəhər məktəbini bitirdikdən sonra 1911-1915-ci illərdə İrəvan Müəllimlər Seminariyasında oxuyub. 5 mart 1916-cı ildən 6 iyun 1918-ci ilə kimi İrəvan dairə məhkəməsində işləyib. 1918-ci ilin fevralın 2-dən tərcüməçi kimi fəaliyyət göstərməyə başlayıb. Ermənistanda bolşeviklər hakimiyyətə gəldikdən sonra Fövqəladə Komissiyada müstəntiq kimi çalışıb. Vedi rayonunda İnqilab Komitəsinin sədri olub. 1924-1926-cı illərdə Tiflisdəki Zaqafqaziya Kommunist Universitetində təhsil alıb. Sonrakı fəaliyyəti Azərbaycanla bağlı olub. Azərbaycan K(b)P MK-nın nəzdindəki partiya məktəbinin direktoru olub. 1937-ci ildə həbs olunub, 3 yanvar 1938-ci ildə güllələnib.



**Şəmdin bəy Mahmudbəyov**
(?-1918)

İrəvan Müəllimlər Seminariyasını bitirdikdən sonra pedaqoji fəaliyyətə Böyük Vedi kəndində başlayıb.1905-ci ildə Nehrəm kənd məktəbinə nəzarətçi-müəllim təyin olunub. 1906-1917-ci illərdə Uluxanlı kənd məktəbində nəzarətçi-müəllim və məktəbin müdiri vəzifəsində çalışıb. Həmin məktəb sovet hakimiyyəti illərində də Şəmdin bəyin məktəbi kimi tanınıb.

Şəmdin bəy seminariyanın digər məzunu Fərəməz bəy Mahmudbəyovla birlikdə Abbasqulu bəy Şadlinskinin yaratdığı "Qırmızı tabor"un fəal üzvlərindən biri olub. "Qırmızı tabor" Abbasqulu bəy Şadlinskinin başçılığı ilə 1918-ci ilin yayında Vedibasar bölgəsində yaradılmışdı. "Qırmızı tabor" dəstələri erməni-daşnak quldur dəstələrinin Azərbaycan xalqına qarşı törətdikləri qanlı cinayətlərin, soyqırımların qarşısını almaqda mühüm rol oynamışdır.



Şəmdin bəy Mahmudbəyov 1918-ci ildə Vedibasarın müdafiəsi zamanı ermənilər tərəfindən öldürülüb.



**Əhməd Haşımov**

İrəvan Müəllimlər Seminariyasının məzunu Əhməd Haşımov Çobankərə kənd məktəbində müəllim işləyib. 1920-ci ildən sonrakı fəaliyyəti Naxçıvanla bağlı olub. 1922-ci ildə Naxçıvan xalq maarif komissarı vəzifəsini icra edib. Bir müddət "Şərq qapısı" qəzetinin redaktoru olub. Naxçıvana yeni nəşriyyat avadanlığının gətirilməsi onun adı ilə bağlıdır.



**Heydər Sadıq oğlu Vəzirov**
(1893-1937)

1893-cü ildə Naxçıvanın Nehrəm kəndində anadan olub. İlk təhsilini Naxçıvanda üsuli-cədid məktəbində alıb. 1913-cü ildə İrəvan Müəllimlər Seminariyasını bitirib. Təhsilini davam etdirmək məqsədilə imtahan verərək İrəvan kişi gimnaziyanın səkkizinci sinfinə daxil olub. Həmin dövrdə seminariyanı bitirənlərin universitetlərə sənəd vermək hüququ yox idi. Mütləq gimnaziyanı və ya orta təhsil verən digər təhsil müəssisələrindən birini bitirmək lazım gəlirdi.

Birinci Dünya müharibəsi Heydər Vəzirova təhsilini davam etdirməyə imkan vermədi. Onu hərbi mükəlləfiyyətə cəlb etdilər. Zabitlər hazırlayan məktəbi bitirdikdən sonra onu unter-zabit kimi döyüşən orduya göndərdilər. 1915-ci ilin iyun ayında kiçik zabit rütbəsində Qalitsiya uğrunda gedən döyüşlərdə almanlar tərəfindən əsir alındı.



1918-ci ilin mart ayında Brestdə bağlanmış sülh müqaviləsində hərbi əsirləri dəyişmək haqqında razılığa gəlindi. Əsirlərin sentyabr ayında yola salınan ilk dəstəsinin içərisində H. Vəzirov da olmuşdur. O, sonralar həmin günləri xatırlayaraq yazırdı: *"Birinci xəstə və yaralı hərbi əsirləri yola saldılar. Onların arasında 30 nəfər həmyerlim və mən də var idim. Çətin və üzücü yola səyahətindən sonra noyabr ayında gəlib Batumiyə çatdıq".*

1918-ci ilin noyabrında Azərbaycan Xalq Cümhuriyyətinin Milli Ordusunun kiçik komandirlər hazırlayan məktəbində müəllim kimi fəaliyyətə başlayıb. 1920-ci ildə aprel çevrilişindən sonra məktəbin kollektivi ilə birlikdə Sovet hakimiyyəti tərəfinə keçmiş, Azərbaycan Birləşmiş Hərbi Məktəbinin zabitləri ilə birlikdə Ermənistanda, həmçinin Azərbaycan qəzalarında daşnaklara və banditizmə, Gürcüstanda menşeviklərə qarşı hərbi əməliyyatda iştirak etmişdir.

1921-ci ildən hərbi məktəbin rəisi və hərbi komissarı olan H. Vəzirov 1922-ci ildən Azərbaycandakı hərbi məktəblərin rəisi və

komandiri təyin edilib. Az sonra Azərbaycan SSR xalq hərbi komissarı və Azdiviziyanın hərbi komissarı təyin edilib.

1924-1926-cı illərdə həmin vəzifədə çalışıb, Kürdəmir, Qarabağ və Göyçayda baş qaldırmış quldur dəstələrinin ləğv edilməsində yüksək əsgəri rəşadət göstərib.

Milli hərbi kadrların hazırlanmasında böyük xidmətlərinə görə 1923-cü ildə Azərbaycan SSR-in "Qırmızı Bayraq ordeni" ilə təltif edilib. 1925–1927-ci illərdə Göyçay Qəza İcraiyyə Komitəsinin sədri işləyib. 1929- 1930-cu illərdə Azərbaycan SSR Xalq torpaq komissarının müavini vəzifəsində çalışıb. 1931-ci ildə Zaqafqaziya Xalq torpaq komissarı vəzifəsinə irəli çəkilib. 1932-1933-cü illərdə Zaqafqaziya Dövlət Plan Komitəsinin sədrinin müavini işləyib. 1933-cü ilin fevral ayının 7-dən 1937-ci ilin yayınadək Azərbaycan SSR Xalq torpaq komissarı vəzifəsində çalışıb. Lənkəranın subtropik zonaya çevrilməsində, kənd təsərrüfatının maşın və mexanizmlərlə təmin edilməsində, yeni suvarma kanallarının çəkilməsində mühüm xidmətləri olub. SSRİ Ali Sovetinin deputatı seçilib.



Azərb.K(b)P-nin XII və XIII qurultaylarında MK üzvü, Azərbaycan MİK (8-ci çağırış), ZSFSR MİK( 7-ci çağırış) və SSRİ MİK - in (7-ci çağırış) üzvü seçilib. 1937-ci ildə repressiyaya məruz qalıb, ailəsi ilə birlikdə məhv edilib.



**Əli Əşrəf Qazıyev**

İrəvan Müəllimlər Seminariyasının 1886-cı il məzunu Əli Əşrəf Qazıyev 15 avqust 1886-cı ildən 1iyun 1889-cu ilədək Kərxun (Eçmiədzin) məktəbində, 1889-1890-cı illərdə Noraşen məktəbində müəllim işləyib.



## Qasım bəy Abbasqulu bəy oğlu Camalbəyov
(1881 -1938)

1881-ci ildə Naxçıvan şəhərində anadan olub. İlk təhsilini Naxçıvan mədrəsəsində və M. T.Sidqinin "Tərbiyə" məktəbində alıb.1898- 1901-ci illərdə şəhər məktəbində, 1901-1904-cü illərdə İrəvan Müəllimlər Seminariyasında oxuyub. 1904-cü ilin sentyabrından 1912-ci ilin dekabrına qədər İrəvan quberniyasının müxtəlif kəndlərində müəllim işləyib. 1903–1904-cü illərdə gizli siyasi fəaliyyətə başlayıb. 1912-ci ildən Persiyanın Culfada yerləşən bankında tərcüməçi işləyib. Bir ildən sonra müvəqqəti olaraq həmin bankın Koçan (Persiya) şəhərindəki agentliyinə işə göndərilib. Lakin bir neçə aydan sonra Bankın Petroqrad idarəsindən gələn göstərişə əsasən işdən azad edilib. Bakıya gələrkən həbs edilərək Krasnovodska göndərilib. Oradan Bakıya qaçmağa nail olub. Cəfər Axundov adında bir şəxsin yardımı ilə Bibiheybətdəki "Rapid" mexanika zavodunda yerləşib. Bir müddət Bakıda qeyri-leqal yaşayıb. Onun Qafqazdan Rusiyaya qeyri-müəyyən müddətdə sürgün edilməsi haqda hökmdən xəbər tutduqdan sonra dəniz yolu ilə Həştərxana gedərək silahdaşı İbrahim Əbilovun yanında müvəqqəti sığınacaq əldə edib.

Azərbaycan Xalq Cümhuriyyətinin qurulmasından sonra Tiflisdə fəaliyyət göstərən Milli Şuranın üzvlərindən biri, sonralar isə parlamentin deputatı olub. Milli hökumətin Gəncədəki fəaliyyəti zamanı da Milli Şuranın üzvü kimi fəaliyyət göstərib. 1918-ci il iyun ayının 17-də qəbul olunmuş "Azərbaycan milli şurasının ikinci müvəqqəti hökumətin heyəti haqqında qərarı"nda Milli Şuranın üzvləri ilə bir sırada onun da adı çəkilir.

1918-ci il dekabrın 7-də açılan Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin sosialist fraksiyasında (sosialistlər 12 deputatla təmsil olunurdular) təmsil olunan Qasım bəy Camalbəyov parlamentin işində fəal iştirak etmiş, müəssislər məclisinin çağırılması üzrə mərkəzi komissiyanın üzvü olmuşdur. Azərbaycanda Sovet

hakimiyyətinin qurulmasından sonra isə fars dilini mükəmməl bilməsi və əvvəllər bir müddət İranın müxtəlif şəhərlərində çalışması ilə əlaqədar olaraq Təbriz şəhərində Naxçıvanın ilk konsulu kimi fəaliyyət göstərib.

9 yanvar 1938-ci ildə Bakıda qətlə yetirilib.

**Sadıq Xəlilov**
(1864-1905)

20 dekabr 1864-cü ildə Naxçıvan şəhərində anadan olub. İbtidai təhsilini Naxçıvanda alıb. 1886-cı ildə İrəvan Müəllimlər Seminariyasını bitirib. 1886-1888 və 1892-1901-ci illərdə Yengicə kənd məktəbində, 1888-1892-ci illərdə Nehrəm kənd məktəbində müəllim işləyib. 1901-ci ildə Naxçıvan üçsinifli şəhər məktəbinə Azərbaycan dili və şəriət müəllimi təyin olunub. 1905-ci ildə ermənilər tərəfindən öldürülüb.



**Əkbər Mehdi oğlu Əkbərov**
(?-?)

21 sentyabr 1898-ci ildə Haşım bəyin müdir olduğu rus-tatar (Azərbaycan -F.R.) məktəbinə qəbul olunub. 1903-cü il iyunun 3-də təhsilini başa vurub.10 fəndən imtahan verib, 9 fəndən əla, yalnız rus dilindən 4 alıb. Şəhadətnaməni H.Nərimanbəyov, Ə.Qazıyev, H.Şahtaxtinski, M.V.Qəmərlinski imzalayıb. 1907-ci ildə İrəvan Müəllimlər Seminariyasını bitirib. 1907-1911-ci illərdə Təbrizdə müəllim işləyib. 16 dekabr 1911-ci ildə vaxtı ilə təhsil aldığı İrəvan rus-tatar (Azərbaycan- F.R.) məktəbinə müəllim təyin olunub.

## İbadulla bəy Muğanlinski
(1879-1948)

İrəvan Müəllimlər Seminariyasının 1902-ci il (XVIII buraxılış) məzunudur. O, seminariyanı Y.Babayev, A.Sultanov, C.Məmmədov, Ş.Mahmudbəyov və H.Şahtaxtinski ilə birlikdə bitirib. 1906-cı ildə İrəvanda açdığı məktəbdə (pansionda) rus dili müəllimi işləyib. Onun açdığı pansionda 19 şagird yaşayıb və təhsil alıb. 1915-ci ildə Bakıya köçmək məcburiyyətində qalıb. 27 dekabr 1919-cu ildə Bakı 1-ci edadi (realni) məktəbində rus dili müəllimi işləyib. 1921-ci ilin axırlarında İrana gedib və 1948-ci ildə orada vəfat edib.









*Təbrizdə Azərbaycan sovet məktəbi. Ön cərgədə sağdan ikinci İbadulla Muğanlinski, üçüncü Müzəffər Hacıyev*

## Əhməd bəy Qazıyev

İrəvan Müəllimlər Seminariyasının 10 iyun 1891-ci il məzunu Əhməd bəy Qazıyevin pedaqoji fəaliyyəti İrəvan ibtidai məktəbləri ilə bağlı olub. Moskvaya təhsil almaq üçün getsə də, imkansızlıqdan geri dönməli olub. Əvvəl Noraşenin (Şərur) Yengicə, 1896-cı ildən isə Yaycı kənd məktəbində müəllim işləyib.

## Mirzə Həsən Nəsirbəyov

Mirzə Həsən Nəsirbəyov Cəlil Məmmədquluzadə ilə bir ibtidai məktəbdə oxuyub. İrəvan Müəllimlər Seminariyasını bitirib. 1914-cü ildə Bakıya köçüb və İçəri şəhərdə yaşayıb. Bakı məktəblərində müəllim işləyib. Oğlu Məmməd Nəsirbəyov 1940-cı ildə Ü.Hacıbəyli adına Bakı Konservatoriyasının bəstəkarlıq fakültəsini bitirib.



## Ağabəy Rəhimbəy oğlu Firidunbəyov

(1885-?)

1885-ci ildə anadan olub. 1901-1905-ci illərdə İrəvan Müəllimlər Seminariyasında oxuyub. 1905-1915-ci illərdə müxtəlif ibtidai məktəblərdə müəllim işləyib. 1915-ci ildə İrəvan quberniya idarəsində fəaliyyət göstərməyə başlayıb. 1917-ci ildə quberniya idarəsində katib vəzifəsinə təyin edilib. Onun əmrini quberniya idarəsində komitə sədri Simonson, üzvlər O.Cəlalov, S.Tarverdiyev və İ.Maxaradze imzalayıblar.

1919-cu il noyabrın 15-də Bakı Dövlət Universitetinə qəbul edilən 297 azərbaycanlı tələbədən biri olub.

**Fərəməz Əskər bəy oğlu Mahmudbəyov**



İrəvan qəzasının Qəmərli kəndində anadan olub. 1906-1912-ci illərdə Vedi ikisinifli məktəbində oxuyub. İrəvan Müəllimlər Seminariyasını 22 mart 1917-ci ildə bitirib. Abbasqulu Şadlinskinin yaratdığı “Qırmızı terror” təşkilatının üzvü kimi ermənilərə qarşı vuruşub.

*İrəvan Müəllimlər Seminariyasının müəllimlərindən bir qrupu*
















**Məmməd Axundov**

İrəvan Müəllimlər Seminariyasını bitirib. Qəmərli kənd məktəbində və seminariyanın nəzdindəki ibtidai məktəbdə şəriət müəllimi (1890-1892) işləyib. İrəvan Şəhər Dumasının və İrəvan Ruhani Məclisinin üzvü olub. 1912-ci ildə Mirzə Cabbar Məmmədzadə ilə birlikdə "Məktəbi-xeyriyyə" cəmiyyətini açmağa nail olub.

***

İrəvan Müəllimlər Seminariyasının məzunu **Xəlil Məmməd oğlu Səfərov** Uluxanlı məktəbini bitirib, seminariyada Mirzə Cabbar Məmmədzadədən dərs alıb.

***

İrəvan Müəllimlər Seminariyasının məzunu **Məmməd bəy Əlibəy oğlu Mahmudbəyov** 1914-cü ildə Vanand məktəbində, 1916-cı ildə Nehrəm məktəbində müəllim işləyib.



***

İrəvan Müəllimlər Seminariyasının 1917-ci il məzunu **Xəlil Məmmədəliyev** Arız kənd məktəbini bitirib.

***

İrəvan Müəllimlər Seminariyasının məzunu **Məmmədbəy Əlibəyov** İrəvan quberniya idarəsində katib vəzifəsində işləyib, 1917-ci ilin dekabrından həbsxana rəisi təyin edilib.

***

İrəvan Müəllimlər Seminariyasının məzunu **Əsgər Məmmədovun** 1911-ci ildə İrəvanda açılması nəzərdə tutulan realni məktəbə ana dili və şəriət müəllimi təyin olunması nəzərdə tutulub. Təəssüf ki, bu müraciət reallaşmayıb.

***

# İrəvan Müəllimlər Seminariyasının tələbələri rus mətbuatında

İrəvan Müəllimlər Seminariyasının müəllim və tələbələrinin o dövrün mətbuatındakı çıxışları da maraq doğurur. Seminariyanın III tədris ili tələbəsi[1] ***Mir Haşım bəy Vəzirovun*** "Qafqaz əraziləri və xalqlarının təsvirinə dair materiallar toplusu"ndakı "Tatar məktəbləri haqqında"[2] məqaləsi həmin dövrdə nəinki İrəvan quberniyasında, eləcə də Cənubi Qafqazda azərbaycanlıların dini və dünyəvi təhsilə cəlb edilməsini öyrənmək baxımdan əhəmiyyətlidir.

M.H.Vəzirov məqalədə Azərbaycan dilində "məktəb" (yazı yazılan yer) və "mədrəsə" (dərs deyilən yer) sözlərinin ərəb mənşəli olduğunu bildirərək yazır ki, İrəvan quberniyasında tatar (Azərbaycan- F.R.) məktəbləri, əsasən, məscidlərin nəzdində yerləşir, orada mollalar dərs deyirlər. Məktəbdə uşaqlara bir müəllim dərs keçir. Bir otaqda minimum 60 şagird 10-12 saat bardaş qurub dizləri üstə mollanı dinləməli olurlar. Məktəblər künclərdəki "manqallar" hesabına qızdırılırdı. Otaqda heç bir ventilyasiya yox idi. Belə antigigiyenik şəraitdə oxuyan uşaqlar sağlamlıqlarını itirirdilər. Müəllim "mirzə", "molla" və ya "axund" adlandırılırdı. Onların böyük hörməti və nüfuzu vardı. Onlar tərbiyə etdikləri uşaqların ruhani atası hesab olunurdu. Uşağını məktəbə qoyan müsəlman mollaya: *"əti sənin, sümüyü mənim"* –deməklə onu döyməyə icazə verirdi. Molla uşağın ayağına, qoluna, başına - hara gəldi vurur, ona falaqqa cəzası verirdi.

Məktəblərdə müəllimlərə aylıq məvacib təyin edilmirdi. Onlar uşaqlardan yalnız əlamətdar günlərdə, xüsusilə də qurban bayramında hədiyyə alırdılar. Şagirdlərin hər biri müəllimə (mollaya) qurban payı gətirirdilər.

Məktəbdə dərs aşağıdakı ardıcıllıqla təşkil olunurdu. Molla səhər tezdən günortaya kimi hər bir uşaqla fərdi məşğul olurdu.



---

[1] *Məqalədə Mir Haşım bəy Vəzirov 3-cü sinif şagirdi kimi göstərilmişdir. O dövrdə seminariyada oxuyanlar şagird adlandırılırdı. Tədris ili və ya kurs sözünün əvəzinə sinif sözündən istifadə edilirdi.*

[2] ***Мир-Гашим-бек Везиров.*** *О татарских школах. Сборник материалов для описания местностей и племён Кавказа. Выпуск 9. Частъ 2-й, Отд. 2-й,1890, с.1-6*

Günorta uşaqlar 1 saat müddətində evə buraxılırdı. Sonra uşaqlar 2 saat hüsnxət qaydasında yazı yazır, ondan sonra mollanın təyin etdiyi böyük yaşlı uşaqlarla məşq edirdilər. Çoxlu səhv buraxan uşaqlar cəzalandırılırdı.

Məktəbdə uşaqlara ərəb əlifbası öyrədilir, bundan sonra Quran dərsləri keçilirdi. Quran oxumaq 3-4 il çəkirdi. Qurandan sonra uşaqlar fars dilində "Gülüstan"ı sətir-sətir oxuyur, sonra Azərbaycan dilinə tərcümələr edirdi. Bundan başqa, uşaqlara Füzulinin "Leyli və Məcnun"u, Hafizin və b. şairlərin əsərləri öyrədilirdi. Məktəblərdə imla dərsləri yox idi, bunlar şifahi şəkildə keçilirdi.

Seminariyanın müəllimləri İrəvanın tarixi, mədəniyyət abidələri və folkloru ilə bağlı məlumatları tələbələri vasitəsi ilə toplayaraq mətbuatda dərc etdirirdilər.

Seminariyanın tələbələri *Evstafiy Zedqenidzenin* "Müqəddəs Simon haqqında əfsanə"[1] və *Georgi Qudjedjianinin* "Tale"[2] adlı yazıları da "Qafqaz əraziləri və xalqlarının təsvirinə dair materiallar toplusu"nda nəşr olunmuşdur.



Seminariyanın müəllimi K.Şulqin 1884-cü ildə "Qafqaz əraziləri və xalqlarının təsvirinə dair materiallar toplusu"nda nəşr etdirdiyi "İrəvanın tutulması"[3] məqaləsini III sinif tələbələri vasitəsi ilə həmin hadisənin iştirakçılarından və şahidlərindən toplamışdı.

---

[1]Предание о св. Симон // Сборник материалов для описания местностей и племен Кавказа. Выпуск 7. 1889г. с.90-92

[2] Судба // Сборник материалов для описания местностей и племен Кавказа. Выпуск 7. 1889г. с.93-95

[3] Взятие г. Эривани. (По рассказам старожилов) - Учит. Эриванской учит, семинарии К. Шульгина // Сборник материалов для описания местностей и племен Кавказа. Выпуск 4. 1884г.с.34-39

## İrəvan Müəllimlər Seminariyasının ali təhsil almış məzunları

İrəvan Müəllimlər Seminariyasının statusu aşağı olduğundan məzunları ali məktəblərə sənəd verə bilmirdirlər. Bu səbəbdən də təhsilini davam etdirmək istəyən məzunlar gimnaziyanın son sinfini oxuyub orta təhsil haqqında sənəd almaq məcburiyyətində qalırdılar.

Seminariyanın məzunlarından ***Həmid bəy Xəlil ağa oğlu Şahtaxtinski*** Odessa Universitetinin Hüquq fakültəsində, ***Fərrux bəy Əlikişi oğlu Ağakişibəyov*** Odessada Novorossiya Universitetinin Tibb fakültəsində, ***Həbib bəy Yusif bəy oğlu Səlimov*** Peterburqda Baş Qərargahın Nikolayev Hərbi Akademiyasında, ***Ələkbər Molla Hüseyn oğlu Qədimov*** Tiflis Aleksadrovski Müəllimlər İnstitutunda, ***Mehdi Kərbəlayı Məhəmmədəli oğlu Kazımov*** Tiflis Aleksandrovski Müəllimlər İnstitutunda, ***Səfərbəyov Həsən Səfər oğlu*** Tiflis Aleksandrovski Müəllimlər İnstitutunda, ***İbrahim Qafar oğlu Səfiyev (İbrahim Səfi)*** Moskva Rəssamlıq Akademiyasında və İstanbulda Sanayi Nefise Mektebində (Gözəl Sənətlər Akademiyası), ***Ağabəy Rəhimbəy oğlu Firidunbəyov*** və ***Mirzə Cabbar Abbas oğlu Məhəmmədzadə*** Bakı Dövlət Universitetində təhsil alıblar.



## Ana dilinin tədrisi və təbliğində İrəvan Müəllimlər Seminariyasının məzunlarının rolu

Azərbaycanın çar Rusiyasının işğalından sonra burada rusdilli məktəblərin intişar tapması ana dili təlimi ideyasını aktuallaşdırdı. XIX əsrin 60-cı illərində Rusiyada başlayan ictimai-pedaqoji hərəkat, görkəmli rus maarifçisi K.D.Uşinskinin ana dili təlimi ideyası milli ucqarlarda, o cümlədən Azərbaycanda təlimin ana dilində aparılması ideyasının gerçəkliyə çevrilməsində mühüm rol

oynadı. M.F.Axundov, H.B.Zərdabi, M.M.Şahtaxtlı təlimin ana dilində aparılmasının qızğın tərəfdarları kimi çıxış etdilər. Qori Müəllimlər Seminariyasının (F.Köçərli, M.Mahmudbəyov, S.Vəlibəyov, Ü.Hacıbəyov, R.Əfəndiyev, C.Məmmədquluzadə, N.Nərimanov, F.Ağazadə və b.) və İrəvan Müəllimlər Seminariyasının (Həmid Şahtaxtinski, Mirzə Cabbar Məhəmmədzadə, Rəhim Xəlilov və b.) məzunları təlimin ana dilində aparılması ideyasının həyata keçirilməsinə ciddi töhfə verdilər.

XIX əsrin axırlarında ana dili təlimi ideyası gerçək həqiqətə çevrildi. Mirzə İsmayıl Qasir (1806-1900) Talış mahalında, S.Ə.Şirvani (1835-1888) Şamaxıda, M.T.Sidqi (1854-1903) Ordubadda və Naxçıvanda, M.M.Nəvvab (1833-1918) Şuşada, Məşədi Molla İsmayıl Hacı Kazımov (1846-1888), Mirzə Həsən Rüşdiyyə (1850-1943) İrəvanda ana dilli məktəblər açdılar.

S.M.Qənizadə və H.Mahmudbəyov 1887-ci ildə Bakıda rus-tatar (Azərbaycan-F.R.) məktəbləri açdılar. Həmin dövrdə azərbaycanlıların təhsil aldığı qəza məktəblərində, progimnaziya və gimnaziyalarda ana dili tədris olunurdu. Seminariyalarda ibtidai məktəblər üçün azərbaycanlı müəllimlər hazırlansa da, ana dili müəllimi hazırlanmırdı. Həmin dövrdə Azərbaycan dili müəllimlərinin hazırlanmasında sistemsizlik hökm sürürdü. XIX əsrin axırlarında Tiflisdə və İrəvanda eksternat yolu ilə imtahan verərək Azərbaycan dili müəllimi adı almaq mümkün idi.



XX əsrin əvvəllərində bu sahədə müəyyən irəliləyiş baş verdi. Azərbaycan dili müəllimlərinin hazırlanması o dövrdə fəaliyyət göstərən mədəni-maarif cəmiyyətlərinin ("Nəşri-maarif", "Nicat", "Səadət" və s.) açdıqları kurslarda, Bakı, İrəvan quberniyaları və Dağıstan vilayətinin xalq məktəbləri müdiriyyətinin kurslarında, Yelizavetpol (Gəncə) mədrəsəsində, habelə Tağıyevin qız məktəbində, həmçinin 1915-ci ildə açılmış qadın pedaqoji kurslarında həyata keçirilirdi.

XIX əsrin sonu, XX əsrin əvvəllərində Azərbaycanda məktəb, ədəbiyyat, mədəniyyət və incəsənətin inkişafında xidmətləri olan milli ziyalıların bütöv bir nəsli pedaqoji təhsillərini Zaqafqaziya və İrəvan müəllimlər seminariyasında almışdılar. Azərbaycanda pedaqogika elminin təşəkkülü və inkişafı, mütərəqqi pedaqoji ide-

yaların yayılması məhz həmin ziyalıların adı və yorulmaz fəaliyyəti ilə bağlıdır.

İrəvan Müəllimlər Seminariyasının direktoru Mixail Alekseyeviç Miropiyev İrəvan Müəllimlər Seminariyasını Zaqafqaziya (Qori) Müəllimlər Seminariyasının *"kiçik bacısı"* adlandırmışdır. İrəvan Müəllimlər Seminariyası Zaqafqaziya Müəllimlər Seminariyasından 5 il sonra yaradılsa da, İrəvan bölgəsində xalqın maariflənməsində, milli ziyalı nəslinin və peşəkar müəllimlərin yetişməsində, maarifçilik mühitinin yaradılmasında müstəsna rol oynadı.

İrəvan quberniyasındakı təhsil müəssisələrində (qəza məktəbləri, ibtidai məktəblər, progimnaziya, gimnaziya, rus-tatar (Azərbaycan-F.R.) Azərbaycan dilinin tədrisi və təbliğində müəllimlər seminariyalarının məzunları mühüm rol oynamışdır.

XIX əsrin ikinci yarısı və XX əsrin əvvəllərində İrəvan quberniyasının ayrı-ayrı təhsil müəssisələrində Azərbaycan dili dərsi deyən müəllimlərin əksəriyyəti ya İrəvan Müəllimlər Seminariyasının məzunları, ya da orada eksternat yolu ilə müəllim adı alanlar olub.



## Məkrli erməni siyasəti: İrəvan Seminariyasının və onun xələfi İrəvan Türk Pedaqoji Texnikumunun acı taleyi

İrəvan Müəllimlər Seminariyası ibtidai məktəb müəllimi hazırlığını həyata keçirən təhsil ocağı olmaqla yanaşı, həm də elm və mədəniyyət mərkəzi rolunu oynayırdı. İrəvana gələn görkəmli Azərbaycan maarifçiləri və məktəbdarları, ədəbiyyat və sənət adamları mütləq seminariyadakı azərbaycanlı müəllim və tələbələrlə görüşərdi. Seminariyada demokratik fikirli müəllimlər fəaliyyət göstərirdi.

1915-ci ildə İrəvan Müəllimlər Seminariyası Armavirə köçürüldü və 1918-ci ilə kimi orada fəaliyyət göstərdi. Həmin dövrdə seminariyaya V.V.Dobrotin rəhbərlik edirdi. Seminariyada 3 ila-

hiyyat müəllimi, 9 fənn müəllimi və 1 həkim çalışırdı. Azərbaycan dili fənnini Mirzə Cabbar Məmmədov, şəriət fənnini isə Axund Əbülhəsən Qazızadə tədris edirdi.

1918-ci ildə ermənilərin azərbaycanlılara qarşı törətdikləri etnik təmizləmə səbəbindən seminariya fəaliyyətini dayandırdı, müəllimlərin və tələbələrin bir qismi amansızcasına qətlə yetirildi, sağ qalanlar isə doğma yurdlarını tərk edərək Türkiyə, İran və Azərbaycana pənah apardılar. Erməni daşnaklarının törətdiyi kütləvi qırğınlar zamanı İrəvan şəhərinin azərbaycanlılar yaşayan məhəllələri alt-üst edilərək xarabalığa çevrildi, 14.000 nəfərdən çox azərbaycanlı qətlə yetirildi. Çar Rusiyasının bilavasitə dəstəyi ilə qədim Azərbaycan torpağında yaradılan İrəvan quberniyasının əsasında RSFSR-in köməyi ilə 1918-ci ilin mayında ilk erməni dövləti (Ararat) yaradıldı, rus dilində təhsil verən bütün məktəblər milliləşdirilmə adı ilə erməniləşdirildi.

Azərbaycan təhsil və pedaqoji fikir tarixinin mühüm və şərəfli bir səhifəsini təşkil edən İrəvan Müəllimlər Seminariyasının fəaliyyətinə isə son qoyuldu. 37 il yanan maarif məşəli söndürüldü. Bu torpağın qədim sakinləri - azərbaycanlılar öz vətənlərində azsaylı xalqlardan birinə çevrildi, İrəvan ədəbi-mədəni və pedaqoji mühiti tənəzzülə uğradı.



***

XX əsrin 20-ci illərində İrəvanda tədricən milli məktəblərimiz bərpa olunmağa başladı. Ermənistanda sovet hakimiyyəti qurulduqdan sonra yurd-yuvasından didərgin düşən azərbaycanlıların bir qismi geri döndü.

Tədrisin Azərbaycan dilində aparıldığı məktəblərin şəbəkəsinin genişlənməsi milli müəllim kadrlarına olan tələbatı daha da artırdı.

Azərbaycanlı əhali arasında mədəni-maarif işlərini gücləndirmək məqsədilə 1922-ci ildə Ermənistan Xalq Maarif Komissarlığı nəzdində "Azlıqda qalan millətlər bürosu" təşkil edildi. Həmin büroya İrəvan Müəllimlər Seminariyasının məzunu Mehdi Kazımov müdir təyin olundu. "Azadlıqda qalan millətlər bürosu" 1923-cü ilin iyun ayında "Azlıqda qalan millətlər şurası"na çevrildi. Bu şöbə tədris proqramlarının, dərsliklərin əldə olunması, çap edilməsi, müəllim kadrlarının hazırlanması, gecə kurslarının

və təlim-tərbiyə məsələlərinin təşkili, zəhmətkeş balalarının hamılıqla təhsilə cəlb edilməsi kimi mühüm işlərlə məşğul olurdu. Onların təşəbbüsü ilə İrəvanda qısa müddətli pedaqoji kurslar təşkil edildi. Məqsəd az müddətdə xeyli ibtidai məktəb müəllimi hazırlamaq idi. Dos.C.Allahverdiyevin araşdırmalarına görə, 1922/23-cü tədris ilində Qərbi Azərbaycanda (indiki Ermənistan) fəaliyyət göstərən 36 Azərbaycan məktəbində 1521 şagird təhsil alırdı[1]. Müəllim çatışmazlığı problemini aradan qaldırmaq üçün Azərbaycan Xalq Maarif Komissarlığının razılığı ilə İrəvandan Bakıya 1923-cü ildə 16, 1925-ci ildə 38, 1926-cı ildə isə 11, 1929-cu ildə 8 nəfər pedaqoji təhsil almaq məqsədilə müxtəlif ali təhsil müəssisələrinə göndərilmişdi. Həmin gənclər Azərbaycan Ali Pedaqoji İnstitutunu bitirdikdən sonra İrəvana qayıdaraq məktəbyaşlı uşaqların təhsilə cəlb edilməsində və savadsızlığın ləğvində mühüm işlər gördülər. Azərbaycanlı uşaqların təhsilə cəlb edilməsi sahəsində qazanılan uğurlar məktəblərin şəbəkəsinin genişlənməsinə səbəb oldu. Hökumətin həyata keçirdiyi tədbirlər (qısamüddətli kursların təşkili, Bakıya tələbələrin göndərilməsi və s.) nəticəsində hazırlanan kadrlar tələbatı ödəmirdi. Azərbaycanlı maarifçilər İrəvan Müəllimlər Seminariyasının ənənələrinin davamı kimi yeni bir təhsil ocağının – Pedaqoji seminariyanın (pedaqoji texnikum) yaradılmasının vacibliyini əsaslandırsalar da, ermənilər Erməni Pedaqoji Texnikumunun nəzdində Azərbaycan şöbəsinin açılmasını daha məqsədəuyğun hesab edirdilər. "Azsaylı xalqlar şöbəsi"nin müdiri Bala Əfəndiyevin, "Azlıqda qalan millətlər şurası"nın müdiri Mehdi Kazımovun, "Zəngi" qəzetinin məsul redaktoru Mustafa Hüseynovun və digər milli ziyalıların tələbi ilə 1924-cü ilin oktyabr ayının 15-də İrəvan Müəllimlər Seminariyasının xələfi olan İrəvan Türk Pedaqoji Texnikumu açıldı. Dos.C.Allahverdiyev *"erməni şovinizminin əhatəsində azərbaycanlı məktəbləri üçün müəllimlər hazırlayan belə bir təhsil ocağının açılmasını ağır və çətin mübarizənin"*[2] yekunu kimi dəyərləndirmişdir.

1925-ci ildə İrəvan Türk Pedaqoji Texnikumuna xalqımızın böyük oğlu, ictimai-siyasi xadim Nəriman Nərimanovun adı ve-



[1] **Allahverdiyev C.** İrəvan Müəllimlər Seminariyası.Bakı: Elm və təhsil, 2022, s.112

[2] **Allahverdiyev C.** İrəvan Müəllimlər Seminariyası.Bakı: Elm və təhsil, 2022, s.117



*İrəvan Azərbaycan Pedaqoji Məktəbinin ilk buraxılışı (1929)*



rildi. Texnikumun əsas kursuna ilk sənəd qəbulu 15-27 oktyabr 1925-ci ildə aparılmışdır. Tələbə qəbulu Ermənistan Xalq Maarif Komissarlığının təsdiq etdiyi qaydalar əsasında həyata keçirilirdi. Təhsil müddəti isə 4 il idi. 1930-cu ilin iyul ayında texnikuma tələbə qəbulu qaydalarında müəyyən dəyişikliklər edilmişdi. Yeni qəbul qaydalarına görə, texnikuma 5-ci sinfi bitirmiş 15-20 yaşı olanlar sənəd verə bilərdi.

1935-ci ildə pedaqoji texnikumun nəzdində qiyabi şöbə yaradıldı. Həmin il İrəvan Türk Pedaqoji Texnikumu İrəvan Azərbaycanlı Pedaqoji Məktəbi adlandırıldı. 1936-38-ci illər pedaqoji məktəbin həyatında ağır illər kimi qaldı. Mehdi Kazımov, Əşrəf Bayramov, Abbas Azəri, Məhərrəm Əhmədov, tələbələrdən Rza Əli bəy oğlu, Mikayıl Əliyev, Məmməd Tağı Qədiməliyev, Rəşid Baxşəliyev, Əli Xəlilov, Mirağa Seyidov, Xalid Əfəndiyev, Məhəmməd Rzayev, Süleyman Süleymanov, Qədimalı Vəliyev, Məhərrəm Xəlilov, Beytulla Rzayev, Tahar Abbasov, İdris Hüseynov, Əkbər Məşəmməd Bağır Ağa oğlu, Ağayar Həsənov və başqaları repressiyaya məruz qaldılar.

1948-ci ilin noyabrında İrəvan Müəllimlər Seminariyasının ənənələrini yaşatmaqla bölgədə əbədi-mədəni və təhsil mühitinin




*İrəvan Azərbaycan Pedaqoji Məktəbinin 1939-cu il buraxılışı*



formalaşdırılmasında və inkişafında mühüm rol oynayan pedaqoji məktəb də deportasiyaya[1] məruz qaldı, müəllim və tələbə kollektivi ilə birlikdə Azərbaycan Respublikasınn Xanlar (indiki Göygöl) rayonuna köçürüldü. Bununla da, ermənilər İrəvanda maarifçiliyin inkişafında, müəllim kadrları hazırlığında müstəsna xidmətləri olan İrəvan Müəllimlər Seminariyasının xələfi İrəvan Azərbaycanlı Pedaqoji Məktəbini bağlamaqla azərbaycanlılara məxsus maarif məşəlini söndürməyə nail oldular. Xanlar (Göygöl) rayonuna köçürülən Pedaqoji məktəb 1971-ci ilə kimi fəaliyyətini davam etdirdi.

Beləliklə də, azərbaycanlıların indiki Ermənistan ərazisindən – Qərbi Azərbaycandan kütləvi deportasiyasına zəmin hazırlandı və 1988-ci ilin qarlı-şaxtalı noyabr-dekabr aylarında həyata keçirildi.

---

[1] 1937-ci ildə açılan İrəvan Pedaqoji İnstitutunun Azərbaycan şöbəsi də SSRİ Nazirlər Sovetinin Azərbaycan xalqına qarşı tarixi cinayət aktı olan 1947-ci il 23 dekabr və 1948-ci il 10 mart tarixli qərarlarından sonra köçürülməsi vacib olan obyektlərdən biri kimi siyahıya salınmışdı. Şöbənin tələbələri (Zərifə Budaqova, Bağır Bağırov, Zəhra Əliyeva və b.) öz təhsillərini Azərbaycan Dövlət Pedaqoji İnstitutunda davam etdirməli oldular.

# İrəvan maarifçilik mühitinin Azərbaycan təhsilinə verdiyi ali təhsillilər

Millət yaratdığı şərəfli tarixi ilə özünü ifadə edir. İndi yadlara, yağılara qalan qədim İrəvan şəhərində 140 il bundan əvvəl fəaliyyətə başlayan müəllimlər seminariyası təhsil və pedaqoji fikir tariximizin, maarifçilik tariximizin, milli mədəniyyət tariximizin və kimliyimizin parlaq səhifələrindən birini təşkil edir.

***"M.V.Lomonosov adına Moskva Universitetinin məzunları Rusiyada elm, mədəniyyət və incəsənətin inkişafında hansı xidmətləri göstərmişlərsə, Qori Müəllimlər Seminariyasının məzunları da Azərbaycan üçün həmin xidmətləri göstərmişlər".*** Azərbaycan təhsil və pedaqoji fikir tarixinin görkəmli tədqiqatçısı, akademik Hüseyn Əhmədovun bu fikirlərini eyni ilə Qərbi Azərbaycanda maarifin və maarifçiliyin inkişafında müstəsna xidmətlər göstərmiş İrəvan Müəllimlər Seminariyasının məzunlarına da aid etmək olar.



Azərbaycan Respublikasının Prezidenti cənab İ.Əliyevin İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin keçirilməsi ilə bağlı imzaladığı sərəncamda da vurğulandığı kimi, İrəvan Müəllimlər Seminariyası çar hakimiyyətinin bölgədəki maraqları naminə yaradılmasına baxmayaraq, 40 ilə yaxın müddətdə hazırladığı müasir dünyagörüşünə və düşüncə tərzinə malik yüksəkixtisaslı milli müəllim kadrları ilə azərbaycanlıların üstünlük təşkil etdiyi İrəvan mahalında ədəbi-ictimai, elmi-mədəni həyatın ənənəvi dolğunluğunun və canlılığının qorunub saxlanılmasında təqdirəlayiq xidmətlər göstərmiş, pedaqoji fikir salnaməmizə yaddaqalan səhifələr yazmışdır. Seminariyanın məzunları azərbaycanlıların yaşadığı bölgələrdə dünyəvi məktəblərin açılmasında, məktəbyaşlı uşaqların təhsilə cəlb edilməsində fəal iştirak etmiş, İrəvanda, Naxçıvanda və Azərbaycanın digər bölgələrində maarifin yayılmasında böyük fədakarlıq göstəriblər.

Müəllimlər Seminariyası İrəvanda maarifin və maarifçiliyin, azərbaycançılıq ideologiyasının, milli mətbuatın, ədəbiyyatın, teatrın, ana dilli məktəblərin inkişafına, yeni tipli ziyalı nəslinin formalaşmasına mühüm töhfələr verib.

Çar Rusiyasının ruslaşdırma, xristianlaşdırma və rusiyalaşdırma siyasətini həyata keçirə biləcək müəllim kadrları hazırlamalı olan se-

minariya məzmunu və mündəricəsi ilə işıqlı bir təhsil ocağı idi. İmperiyanın paytaxtından xüsusi tapşırıqla göndərilmiş məmurlardan fərqli olaraq, İrəvan Müəllimlər Seminariyasında və gimnaziyada çalışan müəllimlər müstəqil düşünən rus maarifçisi kimi azərbaycanlı ziyalıların yetişməsində səmərəli xidmət göstərmiş, azərbaycanlıların ibtidai, orta və hətta ali təhsil almasını təşviq etmişlər.

Məhz bunun nəticəsidir ki, XIX əsrin sonu, XX əsrin əvvəllərində İrəvanda Türkiyə, İraq və İranın ali mədrəsələrində, Rusiyanın və Avropanın universitetlərində təhsil almış ziyalı nəsli formalaşmışdır[1].

İrəvandakı arxivlərdən istifadə edə bilmədiyimizdən onların hamısının adlarını müəyyənləşdirmək mümkün olmadı. Haqlarında qısa məlumat əldə etdiyimiz ali təhsillilərlə bağlı məlumat verməyi məqsədəuyğun hesab etdik.

1.**Abbasov Ələkbər Kərbəlayı Tağı oğlu** (1892-?) – (Zaqafqaziya Müəllimlər Seminariyasının Azərbaycan şöbəsini bitirib) – Tiflis Aleksadrovski Müəllimlər İnstitutunda oxuyub.

**2.Ağabababəyov Əsəd bəy Hüseyn bəy oğlu** (1891 - ?) (İrəvan kişi gimnaziyasının 1911-ci il məzunu) - 1911-1916-cı illərdə Moskva İmperator Universitetinin Hüquq fakültəsində oxuyub.



**3.Ağabababəyov-Muğanlinski Abbasəli bəy Ağababa bəy oğlu (1869-1961)** –Moskva İmperator Universiteti Hüquq fakültəsini 1894-cü ildə bitirib.

**4.Ağabababəyov-Muğanlinski Adil bəy Abbasəli bəy oğlu (1898-1933)** (İrəvan kişi gimnaziyasının 1917-ci il məzunu) – Kiyev və Berlin Universitetlərinin tibb fakültəsində oxuyub, Fransa Tibb İnstitutunu bitirib.

**5.Ağaoğlu (Ağayev) Məhəmməd bəy Həsən bəy oğlu (1895-1949)** (orta təhsilini Moskvada alıb) - 1914-1916-cı illərdə Moskva Lazarev Şərq Dilləri İnstitutunda, 1923-1924-cü illərdə Berlində Yena Universitetində, 1924-1927-ci ildə Vyana Universitetində oxuyub.

**6.Ağakişibəyov Fərrux bəy Əlikişi bəy oğlu (1879-1956) (**Ağdam ikisinifli məktəbində oxuyub,1899-cu ildə İrəvan Müəllimlər

---

[1] M.Mərdanovun və Ə.Tahirzadənin "1920-ci ilədək ali məktəblərdə oxumuş azərbaycanlılar. Ensiklopedik soraq kitabı"nda İrəvan Müəllimlər Seminariyasını və İrəvan kişi gimnaziyasını bitirib ali təhsil alan 50-dən çox azərbaycanlı haqqında oçerk verilmişdir.

Seminariyasını bitirib)- Novorossiya Universitetinin Tibb fakültəsini bitirib.

**6.Ağayev Rza Məşədi Muxtar oğlu (1897-?) (**İrəvan kişi gimnaziyasını 1916-cı ildə qızıl medalla bitirib) **-** Moskva Kommersiya İnstitutunda oxuyub.

**7.Allahverdibəyov Abbas bəy Hacı Baxşəli bəy oğlu (1895-?)**- (İrəvan kişi gimnaziyasını 1915-ci ildə bitirib) – Kiyev Müqəddəs Vladimir Universitetinin Hüquq fakültəsində oxuyub.

**8.Allahverdibəyov Həmid bəy Hacı Baxşəli bəy oğlu (1896-1960)** (İrəvan kişi gimnaziyasını 1915-ci ildə bitirib) – Kiyev Müqəddəs Vladimir Universitetinin Tibb fakültəsində oxuyub.

**9.Bağırbəyov (Mirzəbağırbəyov)Ağa bəy Hacı İsmayıl bəy oğlu (1887-1937)** (İrəvan kişi gimnaziyasını 1908-ci ildə bitirib) - Kiyev Müqəddəs Vladimir Universitetinin Hüquq fakültəsində oxuyub.

**10.Bağırbəyov (Mirzəbağırbəyov) Əbülfət bəy Hacı İsmayıl bəy oğlu (1894-?**) (İrəvan kişi gimnaziyasını 1914-cü ildə bitirib)- Kiyev Müqəddəs Vladimir Universitetinin və Xarkov Universitetinin hüquq fakültələrində oxuyub.



**11.Erivanski Mehdi xan (1898- 1960) -** 1918-ci ildə İrəvan gimnaziyasını, 1925-ci ildə isə Moskva Dövlət Universitetinin Şərqşünaslıq fakültəsini bitirib. 1938-ci ildə namizədlik, 1948-ci ildə doktorluq dissertasiyası müdafiə edib. 1959-cu il may ayının 14-də ona professor elmi adı verilib.

**12.Əfəndiyev Məhəmmədəmin Hüseyn Əfəndi oğlu (1897-?)** (İrəvan kişi gimnaziyasını 1916-cı ildə bitirib) - Moskva Universitetinin Fizika-riyaziyyat fakültəsində, Almaniyanın Darmştadt şəhərindəki Ali Texniki İnstitutunda oxuyub.

**13.Əliyev Əli Kərbəlayı Məhəmmədağa oğlu (1883-?)-** (İrəvan kişi gimnaziyasında, Moskvada İmperator liseyinin 5-8-ci siniflərində oxuyub)-Moskva Universitetinin və Sankt -Peterburq Universitetinin Hüquq fakültələrində oxuyub.

**14.Əliyev Əziz Məmmədkərim oğlu (1897-1962)** (İrəvan kişi gimnaziyasını 1917-ci ildə bitirib**)**- Sankt-Peterburq Hərbi Tibb Akademiyasında və Bakı Dövlət Universitetinin Tibb fakültəsində oxuyub.

**15.Əliyev Hüseyn Kərbəlayı Məhəmmədağa oğlu (1885-?)** (Tiflis I kişi gimnaziyasını bitirib) –Sankt-Peterburq Universitetinin Hüquq fakültəsində oxuyub.

**16.Fərəcov Abbas ağa.** İrəvan gimnaziyasını bitirdikdən sonra Almaniyanın Leypsiq Universitetində ali təhsil alıb. İrəvana qayıtdıqdan sonra xeyriyyə işləri ilə məşğul olub. Rus, erməni, alman, fars və ərəb dillərini mükəmməl bilib. El arasında böyük nüfuza malik olan Abbas ağa Qırxbulaqdan İrəvana su çəkdirən üç nəfərdən biri olub.

**17.Hacıbəyli İslam bəy Abbasqulu bəy oğlu (1887-?)-** Sankt-Peterburq Universitetinin Hüquq fakültəsində oxuyub.

**18.Hacılarov İbrahim (xəlil) ağa Hacı İsmayıl ağa oğlu** (1893-1939)- Qori Müəllimlər Seminariyasında (1909-1913-cü illər) və Tiflis Aleksandrovski Müəllimlər İnstitutunda (1914-1918) təhsil alıb.

**19.Hacıyev Xosfolad bəy İsmayıl bəy oğlu (1900-?)** (İrəvan gimnaziyasını 1917-ci ildə bitirib) - Sankt-Peterburq Dağ İnstitutunda və Almaniyada ali texniki təhsil alıb.

**20.Hüseynbəyov Fərrux bəy Məhərrəm bəy oğlu (1876-1913)** (İrəvan kişi gimnaziyasını bitirib) - Xarkov Universitetinin Tibb fakültəsində (1899-1906) oxuyub.

**21.Kazımov Mehdi Kərbəlayı Məhəmmədəli oğlu** (1889-1954) (İrəvan Müəllimlər Seminariyasını bitirib)-Tiflis Aleksandrovski Müəllimlər İnstitutunu bitirib.



**22.Kəlbəlixanov Əliqulu xan Xəlifəqulu xan oğlu (1899-?)** (1908-1917-ci illərdə İrəvan kişi gimnaziyasında oxuyub)-Novorossiya Universitetinin Fizika-riyaziyyat fakültəsinin təbiət bölümündə oxuyub.

**23.Kəngərli Məhəmmədqulu bəy Şəfi bəy oğlu (1864-1905)** (Tiflisdə kadet korpusunda oxuyub) -1884-cü ildə Sankt-Peterburq Mixail Ali Topçuluq Məktəbini bitirib.

**24.Qasımbəyov Xəlil bəy Firidun bəy oğlu (1870-?**) (İrəvan kişi gimnaziyasının 1900-cü il məzunu) -Xarkov III Aleksandr Texnologiya İnstitutunda oxuyub.

**25.Qazıyev Adil bəy Hüseyn bəy oğlu (1889-1930)** (1899-1909-cu illərdə İrəvan kişi gimnaziyasında oxuyub) **–** Qazan Universitetinin hüquq fakültəsini bitirib.

**26.Qazıyev Əkbər bəy Hüseyn bəy oğlu (1894-1954)** (1904-1914-cü illərdə İrəvan kişi gimnaziyasında oxuyub) – Kiyev Müqəddəs Vladimir Universitetində və Moskva Universitetinin Hüquq fakültəsində oxuyub.

**27.Qazıyev Məhəmməd (tağı) bəy Məhəmməd bəy oğlu (1883-?)** (İrəvan kişi gimnaziyasının 1905-ci il məzunu) **-** Qazan Universitetinin və Novorossiya Universitetinin Tibb fakültələrində oxuyub.

**28.Qazıyev Yusif bəy İsmayılbəy oğlu (1885-1930**) (İrəvan kişi gimnaziyasının 1905-ci il məzunu) **–** Moskva Universitetinin və Xarkov Universitetinin Hüquq fakültələrində oxuyub.

**29.Qədimbəyova Cahangir bəy Ələkbər bəy oğlu (1891-1928)** (İrəvan kişi gimnaziyasının 1913-cü il məzunu)- Kiyev Politexnik İnstitutunun kənd təsərrüfatı fakültəsində oxuyub.

**30.Qədimbəyov Əliəsgər bəy Mirzə Qədim İrəvani oğlu (1876-1918)** (Tiflis gimnaziyasının 1883-cü il məzunu) **–** Novorossiya Universitetinin Hüquq fakültəsində oxuyub.

**31.Qədimbəyov Əziz bəy Mirzə Qədim İrəvani oğlu (1879 - ?)** (İrəvan və Tiflis gimnaziyalarında oxuyub)- Novorossiya Universitetinin və Qazan Universitetinin Tibb fakültələrində oxuyub.

**32.Qədimov Adıgözəl Allahverdi oğlu (1896-?)** (İrəvan kişi gimnaziyasının 1907-ci il məzunu)- Kiyev Müqəddəs Vladimir Universitetinin Tibb fakültəsində oxuyub.



**33.Qədimov Ələkbər Molla Hüseyn oğlu (1893-?)-** (1910-cu ildə Uluxanlı məktəbini,1914-cü ildə İrəvan Müəllimlər Seminariyasını bitirib) - Tiflis Aleksandr Müəllimlər İnstitutunda oxuyub.

**34.Qədimov Məhəmmədismayıl Allahverdi oğlu (1895-1942) -** Kiyev Müqəddəs Vladimir İnstitutunun (3 il) və ADU-nun Tibb fakültələrində oxuyub.

**35.Makinski Abbas (əli) bəy Bəhram bəy oğlu (1888-1938)** (İrəvan realni məktəbində və Tiflis 1-ci kişi gimnaziyasında oxuyub) – 1914-cü ildə Kiyev Müqəddəs Vladimir Universitetinin Hüquq fakültəsini bitirib.

**36.Makinski Əli bəy İbrahim bəy oğlu (1886-?)- (**1907-ci ildə İrəvan gimnaziyasını bitirib)- Kiyev Müqəddəs Vladimir Universitetinin Tibb fakültəsində oxuyub.

**37.Makinski Teymur bəy Məhəmmədqulu bəy oğlu (1874-1924)** – 1897-ci ildə Varşava İmperator Universitetinin Hüquq fakültəsini bitirib.

**38.Makinski Zülfüqar bəy Məhəmmədqulu bəy oğlu (1885-?)** (1895-1904-cü illərdə İrəvan gimnaziyasında oxuyub) – 1911-ci ildə Sankt-Peterburq Universitetinin Hüquq fakültəsini bitirib.

**39.Məhəmmədbağır oğlu Xəlil (1897-?)** (1907-1916-cı illərdə İrəvan gimnaziyasında oxuyub)- Kiyev Müqəddəs Vladimir Universitetində oxuyub.

**40.Məhəmmədbəyov Mahmud bəy Hacı Əli bəy oğlu-(1886-1931)-** (1906-cı ildə İrəvan gimnaziyasını qızıl medalla bitirib)- 1914-cü ildə Sankt –Peterburq Politexnik İnstitutunu bitirib.

**41.Məhəmmədbəyov Müğbil xan Rüstəm xan oğlu (1887-?)-** (1906-cı ildə İrəvan gimnaziyasını bitirib)- Kiyev Müqəddəs Vladimir Universitetinin və Xarkov Universitetinin Hüquq fakültələrində oxuyub.

**42. Məhəmmədzadə Mirzə Cabbar Abbas oğlu (1882-1938)-** İrəvan Müəllimlər Seminariyasında və Bakı Dövlət Universitetində oxuyub.

**43. Məhərrəmov Məhəmməd Hacı Bayram oğlu (1895-1982)** (1904-1914-cü illərdə İrəvan gimnaziyasında oxuyub) –Sankt-Peterburq Universitetinin və Moskva Universitetinin Tibb fakültələrində, Sorbon Universitetinin maliyyə-iqtisad fakültəsində (1924-1927) oxuyub. 1919-cu ilin yanvarında Azərbaycan nümayəndə heyətinin müşaviri kimi Paris Sülh Konfransına göndərilib.



**44.Məmmədov Maqsud Məmməd oğlu (1897-1937)-** İrəvan gimnaziyasında, Moskvada Sverdlov adına Universitetdə və Bakı Dövlət Universitetində (1919-1920) oxuyub.

**45.Mirbabayev Mirhəsən Hacı Mirabbas oğlu (1896-1951)** (İrəvan kişi gimnaziyasını bitirib) - Moskva Universitetinin Tibb fakültəsini bitirib.

**46.Mirbabayev (Mir)Yusif Hacı Mirabbas oğlu (1889-1951)** (1902-1911-ci illərdə İrəvan kişi gimnaziyasında oxuyub)- Moskva İmperator Universitetinin Hüquq fakültəsinin 1917-ci il məzunu. Nizami adına Ədəbiyyat və Dil İnstitutunun direktor müavini, 1946-1949-cu illərdə Azərbaycan EA-nın Dil İnstitutunun direktoru vəzifəsində çalışıb, 1948-ci ildə dördcildlik "Rusca- azərbaycanca lüğət"ə görə akad. H.Hüseynov və Ə.Orucovla Stalin mükafatına layiq görülüb.

**47.Mirbağırov Mirhüseyn Mircəfər oğlu (1896-1970**) (rus-tatar məktəbində, İrəvan kişi gimnaziyasında (1906-1914) təhsil alıb) - Moskva Kommersiya İnstitutunda və Lazarev Şərq Dilləri İnstitutunda (sərbəst dinləyici kimi) oxuyub.

**48.Mirbağırov Mirməhəmməd Mirəhməd oğlu (1889-?)-** (1901-1910-cu illərdə İrəvan kişi gimnaziyasında oxuyub) -Sankt-Peterburq İmperator Universitetinin Hüquq fakültəsində oxuyub.

**49.Mirbağırova Ruqiyyə Mirbağır qızı** (?-?)- Sürix Tibb Universitetini bitirib.

**50.Mirbağırova Kubra Mirbağır qızı** (?-?) Sürix Universiteti ümumi humanitar fənlər fakültəsini bitirib.

**51.Miryəhyayev Mirəhməd Mirmüseyib oğlu (1899-?)** -(1907-1917-ci illərdə İrəvan kişi gimnaziyasında oxuyub)–Novorossiya Universitetinin Fizika-riyaziyyat fakültəsinin təbiət şöbəsində, Osmanlı Hərbi Tibb Akademiyasında təhsil alıb.

**52.Muğanlinski Cahanbaxış bəy Əlinağı bəy oğlu (1878/80-1942)** -Varşava Universitetinin Tibb fakültəsini bitirib.

**53.Mürsəlbəyov Yusif bəy Məhəmmədşəfi bəy oğlu (1872-?)-** (1892-ci ildə İrəvan kişi gimnaziyasını bitirib)- Moskva Universitetinin Fizika-riyaziyyat fakültəsinin riyaziyyat şöbəsində, Sankt-Peterburq Praktik Texnologiya İnstitutunun Kimya şöbəsində oxuyub.



**54. Nabatəlibəyov Aslan bəy Məhəmmədəli bəy oğlu** (?-?) -(İrəvan Müəllimlər Seminariyasını 1908-ci ildə bitirib) –Tiflis Aleksandr Müəllimlər İnstitutunda oxuyub.

**55.Nərimanbəyli Nəriman bəy Haşım bəy oğlu (1889-1938)-** (1908-ci ildə İrəvan gimnaziyasını bitirib)-Moskva və Xarkov universitetlərinin Hüquq fakültəsində oxuyub.

**56.Rəcəbli Əhməd Məşədi Cabbar oğlu (1898-1963) -** (1907-1916-cı illərdə İrəvan kişi gimnaziyasında oxuyub)- Moskva Universitetinin Tibb fakültəsində, Petrovsk-Razumovsk Akademiyasında oxuyub.1923-cü ildə İtaliyanın Peruca şəhərində Ali Kral Eksperimental Aqrar İnstitutunu bitirib.

**57.Rəcəbov Məcid Hacı Məhəmməd oğlu (1892-?**) -1902-1911-ci illərdə İrəvan kişi gimnaziyasında, 1911-1915-ci illərdə Kiyev Müqəddəs Vladimir Universitetinin Tibb fakültəsində oxuyub.

**58.Rzayev (Məhəmməd)bağır Kərbalayı (Əli) əsgər oğlu (1891-1927)-** 1903-1912-ci illərdə İrəvan kişi gimnaziyasında, 1912-1916-cı illərdə Moskva İmperator Universitetinin Hüquq fakültəsində oxuyub.

**59.Rzayev Tağı Kərbəlayı (Əli) əsgər oğlu (1895-1959**)- 1906-1916-cı illərdə İrəvan kişi gimnaziyasında, Moskva Universitetinin

Hüquq fakültəsində və Almaniyanın Darmştadt şəhərindəki Elektrotexnika İnstitutunda təhsil alıb.

**60.Sadıqov Əkbər ağa Hacı Xəlil oğlu (1893-1928)** (1907-1912-ci illərdə İrəvan kişi gimnaziyasında oxuyub)- Sankt-Peterburq Universitetinin Hüquq fakültəsində oxuyub. İtaliyanın Laperuze şəhərindəki Kənd Təsərrüfatı İnstitutunu bitirib.

**61.Saqıncaklı Cəlilxan Saleh xan oğlu (Tiflis gimnaziyasını bitirib)** – 1871- 1878-ci illərdə Sankt -Peterburq Universitetinin Tibb fakültəsində oxuyub.

**62.Salehov Yusif Hacı Rza oğlu (1891-?)** (1902-1911-ci illərdə İrəvan kişi gimnaziyasında oxuyub)- 1916-cı ildə Kiyev Müqəddəs Vladimir Universitetinin Tibb fakültəsini bitirib.

**63.Səfərbəyov Həsən Səfər oğlu (1888-1965) -** İrəvan Müəllimlər Seminariyasında və Tiflis Aleksandr Müəllimlər İnstitutunda oxuyub.

**64.Səfiyev Cəlil bəy Ağa bəy oğlu (1880-?) -**(1889-1898-ci ildə İrəvan kişi gimnaziyasında oxuyub)- 1904-cü ildə Moskva İmperator Universitetinin Hüquq fakültəsini bitirib.

**65.Səfiyev Həsən bəy Ağa bəy oğlu (1884-?)-**Kutaisi gimnaziyasında və Sankt-Peterburq İmperator Universitetinin Hüquq fakültəsində oxuyub.



**66.Səfiyev Hüseynqulu bəy Cabbar bəy oğlu (1879-?)-** 1889-1898-ci illərdə İrəvan kişi gimnaziyasında, 1898-1904-cü illərdə Moskva Universitetinin Tibb fakültəsində oxuyub.

**67.Səfiyev İbrahim Qafar oğlu (1898-1983)**-Moskva Rəssamlıq Akademiyasında və İstanbulda Sanayi Nefise Mektebində (Gözəl Sənətlər Akademiyası oxuyub.

**68.Səlimov Həbib bəy Hacı Yusif bəy oğlu (1881-1920)** (İrəvan Müəllimlər Seminariyasında və İrəvan kişi gimnaziyasında oxuyub)- 1918-ci ildə Sankt-Peterburq Hərbi Akademiyasını bitirib.

**69.Sultanhüseynbəyov İsmayıl bəy (1892-?)**- İrəvan şəhərində özəl kişi progimnaziyasında oxuyub. 1917-ci ildə Kiyev Müqəddəs Vladimir Universitetinin Tibb fakültəsini bitirib.

**70.Sultanov Allahyar bəy İsgəndər bəy oğlu (1892-1938)**-Moskva Universitetinin Hüquq fakültəsində oxuyub.

**71.Sultanov Əliqulu bəy Əli bəy oğlu (1891-?) -**1901-1911-ci illərdə İrəvan kişi gimnaziyasında, Kiyev Müqəddəs Vladimir Universitetinin Riyaziyyat fakültəsinin fizika-riyaziyyat bölməsində və Hüquq fakültəsində oxuyub.

**72.Sultanov Əsgər bəy Cabbar bəy oğlu (1897-1938)** –Tiflis 1-ci kişi gimnaziyasında və Stavropol 1-ci kişi gimnaziyasında oxuyub. 1915-1917-ci illərdə Qazan Universitetində oxuyub. Azərbaycan Dövlət Universitetinin Tibb fakültəsini bitirib.

**73.Süleymanbəyov Məhəmməd(əli) bəy İbrahim bəy oğlu** (1890-1920)- İrəvan kişi gimnaziyasının məzunu, ali təhsilli hüquqşünas.

**74.Şahtaxtinski Baxşəli ağa Məhəmmədtağı sultan oğlu** (1859-1918)-İrəvan kişi gimnaziyasında və Peterburq Universitetinin hüquq fakültəsində oxuyub.

**75.Şahtaxtinski Əbülfət ağa Nəcəfqulu ağa oğlu (1858 -1913)-** Tiflis gimnaziyasında və Peterburq Texnologiya İnstitutunda oxuyub.

**76.Şahtaxtinski Əliqulu bəy Əliqulu ağa oğlu (**1886 -1909) - İrəvan gimnaziyasını gümüş medalla bitib, Sankt-Peterburq Hərbi-Tibb Akademiyasında oxusa da, Sankt-Peterburq Yol Mühəndisləri İnstitutunu bitirib.



**77.Şahtaxtinski İsasultan Nəcəf oğlu (1851-1894)-** İrəvan kişi gimnaziyasını və Sankt -Peterburq Əkinçilik İnstitutunu bitirib.

**78.Şahtaxtinski Həmid bəy Xəlil ağa oğlu (1880-1944)-** İrəvan Müəllimlər seminariyasında və Odessa Universitetinin Hüquq fakültəsində oxuyub.

**79.Şeyxov Fərəculla**-İrəvan gimnaziyasının və Moskva Universitetinin məzunu

**80.Şeyxülislamov Əkbər ağa** (1891-1961) -1912-ci ildə İrəvan kişi gimnaziyasında və Sankt-Peterburq Yol Mühəndisləri İnstitutunda oxuyub.

**81.Topçubaşov Mustafa Ağabəy oğlu** (1895-1981)-1914-cü ildə İrəvan kişi gimnaziyasını, 1919-cu ildə Kiyev Müqəddəs Vladimir Universitetinin Tibb fakültəsini bitirib.

**82.Vəzirov Qambay Məmməd oğlu** (1899-1937)- İrəvan kişi gimnaziyasının məzunu, Moskvada Frunze adına Hərbi Akademiyanı bitirmiş, Azərbaycan atıcı diviziyasının komandiri və komissarı olmuşdur. 1937-ci ildə repressiya olunmuşdur.


*Ağababayov Əsəd*


*Ağababayov Abbasəli*


*Ağababayov Adil*


*Ağakişibəyov Fərrux*


*Ağaoğlu Məhəmməd*


*Allahverdibəyov Abbas*


*Allahverdibəyov Həmid*


*Bağırbəyov Ağa*




*Bağırbəyov Əbülfət*


*Erivanski Mehdi*


*Əfəndiyev Məhəmmədəmin*


*Əliyev Əli*


*Əliyev Əziz*


*Hacıbəyli İslam*


*Hacılarov İbrahim*


*Hacıyev Xosfolad*


Hüseynbəyov Fərrux


Kazımov Mehdi


Kəlbəlixanov Əliqulu


Kəngərli Məhəmmədqulu


Qazıyev Adil


Qazıyev Əkbər


Qazıyev Məhəmməd


Qazıyev Yusif




Qədimbəyov Cahangir


Qədimbəyov Əziz


Qədimov Adıgözəl


Qədimov Məhəmmədismayıl


Makinski Abbas


Makinski Əli


Makinski Teymur


Məmmədbağır oğlu Xəlil



*Məhəmmədbəyov Mahmud*



*Məhəmmədbəyov Muğbil*



*Məhərrəmov Məhəmməd*



*Məmmədov Maqsud*



*Mirbabayev Miryusif*



*Mirbağırov Mirhüseyn*



*Mirbağırov Mirməhəmməd*



*Miryəhyayev Mirəhməd*





*Muğanlinski Cahanbaxış*



*Nərimanbəyli Nəriman*



*Rəcəbli Əhməd*



*Rzayev Məhəmmədbağır*



*Rzayev Tağı*



*Sadıqov Əkbər*



*Salehov Yusif*



*Səfərbəyov Həsən*



*Səfiyev Cəlil*



*Səfiyev Həsən*



*Səfiyev Hüseynqulu*



*Səlimov Həbib*



*Sultanhüseynbəyov İsmayıl*



*Sultanov Əsgər*



*Şeyxülislamov Əkbər*



*Topçubaşov Mustafa*





*Vəzirov Qambay*



*Həmid bəy Şahtaxtinski*



*Mirzə Cabbar Məhəmmədzadə*



*Həsən Səfərli*



*İbrahim Səfiyev*

# ....140 il sonra

İrəvan şəhərində 140 il bundan əvvəl fəaliyyətə başlayan müəllimlər seminariyası elm, təhsil, pedaqoji fikir, maarifçilik və milli mədəniyyət tariximizin parlaq səhifələrini təşkil edir. Etiraf edək ki, həmin səhifələrin böyük bir hissəsi indiyə kimi "oxunmamış" qalıb, indi əlimiz çatmayan erməni arxivlərində ya üstünü toz basıb, ya da barbar zehniyyətin qurbanına çevrilib.

Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin 29 dekabr 2021-ci il tarixində imzaladığı "İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında" Sərəncam İrəvanda və ümumiyyətlə, indiki Ermənistan ərazisində soydaşlarımızın yaratdığı milli-mənəvi dəyərlərin, maarifçilik hərəkatının sistemli şəkildə öyrənilməsinə, tədqiq və təbliğ olunmasına stimul verdi. Sərəncamın tələblərinə uyğun olaraq Azərbaycan Respublikasının Təhsil naziri ***Emin Əmrullayevin*** 31.01.2022-ci il tarixli F-43 nömrəli əmrinə əsasən *"İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında"* tədbirlər planı hazırlandı. Ümumtəhsil, orta ixtisas və ali məktəblərdə "dəyirma masa"lar, konfranslar, disputlar keçirildi.



Həmin tədbirlərdən bir neçəsini xronoloji ardıcıllıqla təqdim etməyi məqsədəuyğun hesab edirəm.

**25 fevral 2022-ci il -** F.Köçərli adına Respublika Uşaq Kitabxanasında İrəvan Müəllimlər Seminariyasının yaranmasının 140 illiyinə həsr olunmuş tədbir keçirilib[1].

**4 mart 2022 -ci il -** ADPU-nun Şəki filialında İrəvan Müəllimlər Seminariyasının yaradılmasının 140 illik yubileyinə həsr olunmuş "Azərbaycan təhsil və pedaqoji fikir tarixinin parlaq səhifəsi - İrəvan Müəllimlər Seminariyası -140 il" adlı elmi konfrans keçirilib. Konfransda Humanitar fənlər kafedrasının baş müəllimi Həbibulla Manaflının "XIX əsrdə İrəvan və onun ətraf bölgələrində geosiyasi vəziyyət", Ümumelmi fənlər kafedrasının müdiri, p.ü.f.d., dos.*Sədrəddin Bədiyevin* "Azərbaycançılıq ideyasının formalaşmasında İrəvan Müəllimlər Seminariyasının rolu", Təbiət

[1] https://tehsil.biz/news/az/33817/

fənləri və onların tədrisi texnologiyası kafedrasının müdiri, p.e.d., prof. *Firədun İbrahimovun* "Azərbaycanda pedaqoji fikrin inkişafına İrəvan Müəllimlər Seminariyasının verdiyi töhfələr" və elmi işlər üzrə direktor müavini, ped.ü.f.d., dos.*Nurəli Çələbiyevin* "Azərbaycan maarifçilik tarixində İrəvan Müəllimlər Seminariyasının rolu və əhəmiyyəti" mövzularında çıxışları dinlənilib.

**4 mart 2022-ci il-**Təhsil Nazirliyi Gənclərin Respublika Bədii Yaradıcılıq Evinin təşkilatçılığı ilə Mədəniyyət və İncəsənət Universitetinin nəzdində fəaliyyət göstərən Bakı Humanitar Kollecində "İrəvan Müəllimlər Seminariyasının 140 illiyi"nə[1] həsr olunmuş tədbir keçirilib. Tədbiri giriş sözü ilə Bədii Yaradıcılıq Evinin Kütləvi işlərin təşkili şöbəsinin müdiri Kəmalə Muradlı açıb. "Vətəndaşların Sosial Rifahı Naminə" İctimai Birliyinin sədri *İradə Rizazadə*, tarix üzrə fəlsəfə doktoru, Dövlət mükafatı laureatı, Prezident Kitabxanasının şöbə müdiri *Nazim Mustafa*, filologiya elmləri üzrə fəlsəfə doktoru, dosent *Cəlal Allahverdiyev,* Gənclərin Respublika Bədii Yaradıcılıq Evinin direktoru *Məhəmməd Novruzov,* direktor müavini *Sevinc Əbilhəsənova* və b. çıxış edib.





**10 mart 2022-ci il-** Bakı Şəhəri üzrə Təhsil İdarəsinin təşkilatçılığı ilə 96 nömrəli tam orta məktəbdə İrəvan Müəllimlər Seminariyasının 140 illiyinə həsr olunmuş "Firidun bəy Köçərli - Azərbaycan təhsil tarixi" adlı elmi - praktik konfrans keçirilib[2]. Konfransı giriş sözü ilə 96 nömrəli tam orta məktəbin direktoru *Mehriban Hacıyeva* açıb. Konfransda Bakı Şəhəri üzrə Təhsil İda-

[1] https://surdo.az/details/az/16107

[2] "Firidun bəy Köçərli - Azərbaycan təhsil tarixi" adlı elmi - praktik konfrans. https://baku.edu.gov.az/az/page/9/6135

rəsinin (BŞTİ) müdiri *Mehriban Vəliyeva*, millət vəkilləri *Sadiq Qurbanov, Əliabbas Salahzadə,* Sabunçu Rayon İcra Hakimiyyətinin İctimai siyasi və humanitar məsələlər şöbəsinin müdiri *Ədalət Teymurov,* YAP Sabunçu Rayon Təşkilatının sədr müavini *Zülfüqar Cəfərov*, ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, Əməkdar elm xadimi, pedaqoji elmlər doktoru, professor *Fərrux Rüstəmov,* Azərbaycan Milli Elmlər Akademiyasının A.A.Bakıxanov adına Tarix İnstitutunun Azərbaycan Xalq Cümhuriyyəti tarixi şöbəsinin aparıcı elmi işçisi *Vasif Qafarov,* pedaqoji elmlər doktoru, professor *Hikmət Əlizadə*, Təhsil İnstitutunun direktor müavini *Ənvər Abbasov*, F.B.Köçərli adına uşaq kitabxanasının direktoru *Şəhla Qənbərova*, Bakı Beynəlxalq Multikulturalizm Mərkəzinin məsləhətçisi *Elnur Qasımov* və b. çıxış edib.





**17 mart 2022 –ci il -** Bakı Şəhər Mədəniyyət Baş İdarəsi Binəqədi rayon Mərkəzləşdirilmiş Kitabxana Sistemi Binəqədi rayon R.Əliyev adına 3 saylı tam orta məktəblə birlikdə İrəvan Müəllimlər Seminariyasının yaradılmasının 140 illiyi ilə əlaqədar "İrəvan Müəllimlər Seminariyası-140" başlığı altında dəyirmi masa təşkil edib.Tədbirdə R.Əliyev adına 3 saylı tam orta məktəbin Azərbaycan dili və ədəbiyyatı müəllimi S.İmanova, məktəbin IX sinfində təhsil alan məktəbli oxucular, Binəqədi rayon MKS-in direktor müavini *X.Ələkbərova,* Oxuculara xidmət şöbəsinin müdiri *S.Mövsümova*, Metodika və biblioqrafiya şöbəsinin müdiri *Ş.Quliyeva*, İnformasiya resurs şöbəsinin müdiri *Ş.Ağayeva* iştirak edib.

**30 mart 2022-ci il-** Azərbaycan Dövlət Pedaqoji Universitetinin Məktəbəqədər təhsil fakültəsinin Təhsildə sosial-psixoloji xidmət ixtisasının tələbələri pedaqoji təcrübədə olduqları Xətai rayonu A.Məhərrəmov adına 95 saylı tam orta məktəbdə şagirdlərlə birlikdə İrəvan

Müəllimlər Seminariyasının 140 illiyinə həsr olunmuş dəyirmi masa təşkil edib. ADPU-nun Pedaqoji psixologiya kafedrasının baş müəllimi *Nigar Məmmədova,* məktəbin direktor müavini *Tahir Ağayev,* məktəbin kitabxanaçıları *Alidə Hadıyeva* və *Fəxriyyə Cəfərova* çıxış ediblər. Tədbirdə tələbələrin İrəvan Müəllimlər Seminariyasının 140 illiyi ilə bağlı hazırladıqları maarifləndirici videoçarxlar nümayiş etdirilib, şagirdlərin sualları cavablandırılıb.

**6 aprel 2022-ci il** - Bakı şəhəri, 3 nömrəli Uşaq-Gənclər İnkişaf Mərkəzində İrəvan Müəllimlər Seminariyasının 140 illiyi ilə bağlı tədbir keçirilib. Tədbiri mərkəzin direktoru *Lalə xanım Qəti* açıb. Azərbaycan Dövlət Pedaqoji Universitetinin İbtidai təhsil fakültəsinin dekanı, pedaqoji elmlər doktoru, professor, Əməkdar elm xadimi *Fərrux Rüstəmov* "İrəvan Müəllimlər Seminariyasının milli təhsil tariximizdəki rolu" mövzusunda çıxış edib, sualları cavablandırıb.





**13 aprel 2022-ci il -** Gəncə Dövlət Universitetində "İrəvan Müəllimlər Seminariyası-140" adlı tədbir[1] keçirilib. Tədbiri humanitar məsələlər üzrə prorektor *Gülsüm Fətəliyeva* açıb. GDU-nun veteranlar şurasının sədri, dosent *Fəxrəddin Useynovun* "İrəvan seminariyasının yarandığı tarixi şərait", dosent *Gülarə Məlikovanın* "Azərbaycanda maarifçilik: İrəvan Seminariyası", *Samirə Quliyevanın* "Qori və İrəvan müəllimlər seminariyasının milli təhsil tariximizdəki yeri və rolu haqqında", filologiya fakültəsinin tələbələri *Sevil Qasımovanın* və *Ceylan Rüstəmovanın* "İrəvan Seminariyasının

[1] Gəncə Dövlət Universitetində "İrəvan Müəllimlər Seminariyası-140" adlı tədbir keçirilmişdir. https://gdu.edu.az/g

müsəlman şöbəsinin müəllim və tələbələri" mövzularında məruzələri dinlənilib.

**21 aprel 2022-ci il** - Sabunçu rayonu 72 saylı məktəb- liseydə İrəvan Müəllimlər Seminariyasının 140 illiyi münasibəti ilə tədbir təşkil olunub. Tədbiri məktəbin direktoru *Fəranə Abbasova* açıb. Tədbirdə millət vəkili *Fazil Mustafa*, tarix elmləri doktoru, professor *Şikar Qasımov* İrəvan Müəllimlər Seminariyasının və onun məzunlarının cənubi Qafqazda maarifçiliyin inkişafındakı rolundan danışıblar.





**23 aprel 2022-ci il -** Azərbaycan Dövlət Pedaqoji Universitetində (ADPU) İrəvan Müəllimlər Seminariyasının 140 illiyi münasibətilə seminar[1] təşkil olunub. "ADPU Könüllüləri" Tələbə Birliyinin təşkil etdiyi seminarda Universitetin İbtidai təhsil fakültəsinin dekanı,





[1]https://azertag.az/xeber/ADPU_da_Irevan_Muellimler_Seminariyasina_hesr_olunmus_tedbir_teskil_edilib-2108099

tanınmış təhsil tədqiqatçısı professor *Fərrux Rüstəmov* tələbələrə İrəvan Müəllimlər Seminariyasının milli müəllim kadrları hazırlığındakı rolundan danışıb, tələbələrin suallarını cavablandırıb.

**25 aprel 2022-ci il -** Atatürk mərkəzində İrəvan Türk Cümhuriyyətinin təşkilatçılığı ilə "İrəvan Müəllimlər Seminariyasının 140 illiyi"nə həsr olunmuş elmi-praktik konfrans[1] keçirilib. Konfransı giriş sözü ilə İrəvan Türk Cümhuriyyətinin Azərbaycan üzrə səlahiyyətli nümayəndəsi *İradə Rizazadə* açıb. Konfransda Azərbaycan Dövlət Pedaqoji Universitetin İbtidai təhsil fakültəsinin dekanı, pedaqoji elmlər doktoru, professor *Fərrux Rüstəmovun* "İrəvan Müəllimlər Seminariyası və onun xələfi İrəvan Türk Pedaqoji Texnikumu", Qərbi Azərbaycan Azadlıq Təşkilatı İdarə Heyətinin sədri *Əli Vəliyevin* "Qərbi Azərbaycanda təhsil tarixi" mövzularında məruzələri dinlənilib.Tədbirdə Azərbaycan Respublikasının Prezidenti yanında Dövlət İdarəçilik Akademiyasının Tarix kafedrasının müdiri *Firdovsiyə Əhmədova*, Bakı Slavyan Universitetinin professoru *Şəlalə Həsənova*, Milli Kulinariya Assosiasiyasının prezidenti *Tahir Əmiraslanov* və İrəvan Türk Cümhuriyyətinin Dövlət və Milli Şurasının üzvü *Məhluqə Rəhimova* çıxış ediblər.





**27 aprel 2022-ci il-** SDU-nun Tarix və coğrafiya fakültəsində İrəvan Müəllimlər Seminariyasının 140 illiyinə həsr olunmuş elmi-praktik konfrans[2] keçirilib. Konfransı giriş sözü ilə Tarix və coğra-

[1]"İrəvan Müəllimlər Seminariyası-140".https: //versus. az/article /az/35851; İrəvan unudulmadı, Atatürk Mərkəzində anım tədbiri keçirildi. https: //hurriyyet.az/az/post/ irevan-unudulmadi-ataturk-merkezinde-anim-tedbiri-kecirildi—fotolar-366422

[2]SDU-nun Tarix və coğrafiya fakültəsində İrəvan Müəllimlər Seminariyasının 140 illiyinə

fiya fakültəsinin dekanı, professor *Adil Baxşəliyev* açıb. Konfransda Tarix və onun tədrisi metodikası kafedrasının müdiri dosent *Sona Məhərrəmovanın* "Azərbaycanlı müəllim kadrların hazırlanmasında İrəvan Müəllimlər Seminariyasının rolu", Folklorşünaslıq ETL-nin müdiri professor *Aslan Bayramovun* "Milli tariximizin İrəvan səhifələri – itirilmiş Qərbi Azərbaycan torpaqları – qədim yer və yurdlarımız", Azərbaycan Respublikası Prezident Kitabxanasının şöbə müdiri, tarix üzrə fəlsəfə doktoru *Nazim Mustafanın* "İrəvan şəhərində ədəbi mühit və təhsil", Azərbaycan və Şərqi Avropa xalqları tarixi kafedrasının müdiri professor *Şirxan Səlimovun* "Zəfər tariximiz – Doğan Günəş" mövzularında məruzələri dinlənilib.

**27 aprel 2022-ci il -** Azərbaycan Universitetində İrəvan Müəllimlər Seminariyasının yaranmasının 140 illiyinə həsr olunan tədbir keçirilib[1]. Tədbirdə Azərbaycan dili və ədəbiyyat kafedrasının müdiri, dosent *Ülviyyə Rəhimovanın* "Haşım bəy Vəzirovun həyat və fəaliyyəti", İctimai elmlər kafedrasının müdiri, *professor Qabil Əliyevin* "İrəvan Müəllim Seminariyası: Qərbi Azərbaycanın mühüm təhsil ocağı" və Azərbaycan dili və ədəbiyyat kafedrasının professoru *Asif Hacıyevin* "Müəllim Seminariyalarının məzunlarının Azərbaycanın inkişafında rolu" mövzularında çıxışları dinlənilib.



**27 aprel 2022-ci il -** Təhsil Nazirliyi Respublika Uşaq-Gənclər İnkişaf Mərkəzinin təşkilatçılığı, Azərbaycan Dövlət Pedaqoji Universitetinin və F.Köçərli adına Respublika Uşaq Kitabxanasının




həsr olunmuş elmi-praktik konfrans keçirildi https: //sdu. edu. az/az/news/2121

[1]İrəvan Müəllimlər Seminariyasının 140 illiyi qeyd olunub. https: //www. au.edu.az/az/material/1327/irevan-muellimler-seminariyasi- nin -140-illiyi-qeyd-olunub

birgə əməkdaşlığı ilə "İrəvan Müəllimlər Seminariyasının azərbaycançılıq ideologiyasının formalaşmasında rolu" mövzusunda dəyirmi masa keçirilib. Dəyirmi masada RUGİM-in mütəxəssisləri, metodistlər, dərnək rəhbərləri və dərnək üzvləri iştirak ediblər. Tədbiri Respublika Uşaq-Gənclər İnkişaf Mərkəzinin direktoru *Firuzə Sultanzadə* açıb. ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, pedaqoji elmlər doktoru, professor *Fərrux Rüstəmov,* F.Köçərli adına Respublika Uşaq Kitabxanasının elmi işlər üzrə direktor müavini *Zahirə Dadaşova*, Respublika Uşaq-Gənclər İnkişaf Mərkəzinin direktor müavini, b.ü.f.d. *Lalə Dadaşova* çıxış edib. Mərkəzin "Gənc diyarşünas", "Gənc bələdçi", "Gənc turist" dərnəklərinin üzvləri dəyirmi masada təqdimatlarla çıxış ediblər.

**28 aprel 2022-ci il-** Təhsil Nazirliyi, Təhsil İnstitutu və Bakı Şəhəri üzrə Təhsil İdarəsinin birgə təşkilatçılığı ilə 20 saylı məktəb-liseydə İrəvan Müəllimlər Seminariyasının 140 illiyinə həsr olunmuş elmi konfrans keçirilib. Konfransın plenar iclasında təhsil









nazirinin müavini *Firudin Qurbanov,* Təhsil İnstitutunun direktoru *Rüfət Əzizov,* Milli Məclisin deputatı *Əziz Ələkbərli*, akademik *Vaqif Abbasov*, BŞTİ-nin müdiri *Mehriban Vəliyeva*, Bakı Slavyan Universitetinin rektoru *Anar Nağıyev* çıxış edib. Tədbirdə İrəvan Müəllimlər Seminariyası haqqında videoçarx nümayiş olunub.

"İrəvan Müəllimlər Seminariyası: tarixi gerçəkliklər müasirlik müstəvisində" panel iclasında Təhsil İnstitutunun şöbə müdiri *İntiqam Cəbrayılov*, AMEA-nın Qafqazşünaslıq və Tarix institutunun şöbə müdiri *Qasım Hacıyev,* AMEA-nın A.Bakıxanov adına Tarix İnstitutunun aparıcı elmi işçisi *Nüşabə Məmmədova,* "İrəvan Müəllimlər Seminariyası: milli maarifçilik hərəkatının aparıcı qüvvəsi" mövzusundakı panel iclasında ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, professor *Fərrux Rüstəmov,* Azərbaycan Dillər Universitetinin Fransız dili və mədəniyyəti mərkəzinin müdiri, professor *Əsgər Zeynalov* və Azərbaycan Dövlət İqtisad Univer-





sitetinin dosenti *Cəlal Allahverdiyevin* çıxışları dinlənib, fikir mübadiləsi aparılıb[1].

**3 may 2022-ci il-** ADPU-nun Şamaxı filialında İrəvan müəllimlər seminariyasının milli təhsil tariximizdə yeri və rolu"mövzusunda dəyirmi masa[2] keçirilib. Tədbiri filialın direktoru dosent *Tünzalə Yusifova* açıb, Sosial və pedaqoji elmlər kafedrasının müdiri, dosent *Mayıl Alıcanovun,* tədris və elmi işlər üzrə direktor müavini, fəlsəfə doktoru *Şasəddin Mikayılovun,* sosial və humanitar məsələlər üzrə direktor müavini *Şəlalə Seyidovanın* məruzələri dinlənilib.

**11 may 2022-ci il –** Bakı şəhərindəki 170 saylı məktəbdə "İrəvan Müəllimlər Seminariyası pedaqoji fikir salnaməmizdə"[3] adlı elmi-praktik konfrans keçirilib. Konfransı məktəbin direktoru *Ülviyyə Aslanova* açıb. Konfransda Milli Məclisinin deputatı, Qərbi Azərbaycan İcmasının sədri *Əziz Ələkbərlinin* və Azərbaycan Dövlət İqtisad Universitetinin Azərbaycan dili kafedrasının dosenti, filologiya üzrə fəlsəfə doktoru *Cəlal Allahverdiyevin* məruzələri dinlənilib. Məktəbin şagirdləri *Səma Məmmədova, Günel İsayeva, Əli Vəlizadə, Səbinə Əsgərova* seminariyanın fəaliyyəti və məzunları ilə bağlı çıxış ediblər. *Şəhri Aslanova* "Cənnətim Qarabağ", *Nuray Quliyeva* "Şuşanın dağları" mahnılarını ifa ediblər.





[1] https://baku.edu.gov.az/az/page/9/6237

[2] İrəvan müəllimlər seminariyasının milli təhsil tariximizdə yeri və rolu. https://shamakhi-adpu.az/2022/05/03/

[3] https://missiya.az/17397-170-sayl-mektebde-revan-muellmler-semnaryasnn-140-lly-le-bagl-konfrans-kecrlmsdr.

**12 may 2022-ci il-** BDU -nun Pedaqogika kafedrasında İrəvan Müəllimlər Seminariyasının 140 illiyinə həsr olunmuş elmi seminar keçirilib. Seminarı kafedranın müdiri, pedaqoji elmlər doktoru, professor Ləzifə Qasımova açıb. Seminarda ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, pedaqoji elmlər doktoru, professor, Əməkdar elm xadimi, Beynəlxalq Pedaqoji Akademiyanın həqiqi üzvü, Pedaqoji və Sosial Elmlər Akademiyasının akademiki *Fərrux Rüstəmov* "Azərbaycanlı müəllim kadrların hazırlanmasında İrəvan Müəllimlər Seminariyasının rolu" mövzusunda məruzə ilə çıxış edib.

**25 may 2022-ci il -** Mingəçevir Dövlət Universitetində (MDU) İrəvan Müəllimlər Seminariyasının 140 illik yubileyinə həsr olunan "İrəvan Müəllimlər Seminariyası: pedaqoji fikir salnaməmizin tarix yaradan parlaq səhifəsi"[1] mövzusunda seminar keçirilib. Seminarı MDU-nun təhsil fakültəsinin dekanı, dosent *Nizami Zeynalov* açıb. Seminarda dosent Zenfira Əzizovanın "XIX əsrdə yeni pedaqoji təfəkkür: İrəvan Müəllimlər Seminariyası", baş müəllim *Mətanət Yusifovanın* "İrəvan Müəllimlər Seminariyasının yaradıldığı tarixi şərait və bağlanması səbəbləri", *Gülnar Vəliyevanın* "Azərbaycan dilinin tədrisində İrəvan Müəllimlər Seminariyasının rolu və əhəmiyyəti" mövzusunda məruzələri dinlənilib.





[1] İrəvan Müəllimlər Seminariyasının 140 illiyi qeyd edilib. https: //azedu. az/az/news/ 55893-irevan-muellimler-seminariyasinin-140-illiyi-qeyd-edilib

**25 may 2022-ci il** - Bakı şəhəri Xətai rayonu 138 saylı tam orta məktəbdə "İrəvan Müəllimlər Seminariyası - 140" adlı tədbir[1] keçirilib. Tədbirdə məktəbin direktoru *Mirfaiq Mirheydərli,* pedaqoji elmlər doktoru, professor, Əməkdar elm xadimi *Fərrux Rüstəmov,* Azərbaycan Qaçqınlar Cəmiyyəti və Qərbi Azərbaycan İcmasının sədri, Milli Məclisin deputatı *Əziz Ələkbərli,* UNEC müəllimi, filologiya üzrə fəlsəfə doktoru, dosent *Cəlal Allahverdiyev,* Təhsil İnstitutunun əməkdaşı, professor *İntiqam Cəbrayılov,* YAP Xətai rayon təşkilatının sədri *Vüqar Rəhimzadə,* Xətai rayon İH-nin şöbə müdiri *Pənah İmanov,* Xətai rayon Gənclər və İdman İdarəsinin rəisi *Əfqan Rzayev,* Vətən Müharibəsi Qəhrəmanı, şəhid Azad Hümbətovun atası *Arif Hümbətov* tədbirdə çıxış edib. Tədbirdə İrəvanın tarixi və müəllimlər seminariyası ilə bağlı videoçarxlar göstərilib, şagirdlərinin ifasında "İrəvan yallısı", "İrəvanda xal qalmadı", "İrəvanım, İrəvan" xalq mahnıları və vətənpərvərlik mövzusunda şeirlər səsləndirilib.





**2 iyun 2022-ci il -** Naxçıvan Müəllimlər İnstitutunda "İrəvan Müəllimlər Seminariyası və onun Naxçıvan məzunları" mövzusunda elmi seminar[2] keçirilib. Seminarda institutun rektoru *Azad Novruzov* "İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd

---

[1] 138 saylı məktəbdə İrəvan Müəllimlər Seminariyasının 140 illiyi qeyd edilmişdir. https://yenigundem.az/irevan-muellimler-seminariyasinin-140-illiyi-qeyd-edildi/

[2] **AzərTAC.** İrəvan Müəllimlər Seminariyasının Naxçıvan məzunları maarifçilik fəaliyyətləri ilə seçiliblər https://azertag.az/xeber/








edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2021-ci il 29 dekabr tarixli Sərəncamının əhəmiyyətindən və institutda sərəncamla bağlı görülən işlərdən danışıb. Seminarda ADPU-nun İbtidai təhsil fakültəsinin dekanı, Əməkdar elm xadimi, Beynəlxalq Pedaqoji Akademiyanın həqiqi üzvü, pedaqoji elmlər doktoru, professor *Fərrux Rüstəmov* "İrəvan Müəllimlər Seminariyası və onun Naxçıvan məzunları" mövzusunda məruzə ilə çıxış edib, iştirakçıların çoxsaylı suallarını cavablandırıb. Prof.Fərrux Rüs-

təmov institutun kitabxanasına müəllifi olduğu 6 adda 25 kitab hədiyyə edib. Naxçıvan Müəllimlər İnstitutunun rektoru Azad Novruzov prof.F.A.Rüstəmova xatirə hədiyyələri və "Pedaqoji fikir tarixindən" kitabını təqdim edib.

**29 iyun 2022-ci il-** Atatürk Mərkəzində Azərbaycan İqtisad Universitetinin dosenti, filologiya elmləri üzrə fəlsəfə doktoru Cəlal Allahverdiyevin "İrəvan Müəllimlər Seminariyası" kitabının təqdimatı keçirildi. Tədbirdə Milli Məclisin üzvləri *Fəzail Ağamalı, Hikmət Babaoğlu, Səməd Seyidov, Əziz Ələkbərli, Sadiq Hüseynov, Anar İsgəndərov, Məlahət İbrahimqızı, Aydın Mirzəzadə, Aydın Hüseynov,* tanınmış alimlər, politoloqlar, ziyalılar, vətəndaş cəmiyyəti və media nümayəndələri iştirak edirdilər. Tədbiri Qərbi Azərbaycan İcmasının sədri Əziz Ələkbərli açaraq Azərbaycan Respublikasının Prezidenti İlham Əliyevin "İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında" Sərəncamının tarixi-siyasi əhə-







miyyətindən danışdı. Tədbirdə millət vəkili, Ana Vətən Partiyasının sədri Fəzail Ağamalı, kitabın elmi redaktoru, millət vəkili Hikmət Babaoğlu, Azərbaycan Respublikası Milli Məclisinin Beynəlxalq münasibətlər və parlamentlərarası əlaqələr komitəsinin sədri, millət vəkili Səməd Seyidov, pedaqoji elmlər doktoru, professor, Əməkdar elm xadimi Fərrux Rüstəmov, millət vəkilləri Sadiq Hüseynov, Anar İsgəndərov, Məlahət İbrahimqızı, Aydın Mirzəzadə, professor Cəbi Bəhramov, professor Aslan Bayramov, professor Əyyub Əzizov, yazıçı Səyyad Aran, "Vətəndaşların Sosial Rifahı Naminə" İctimai Birliyinin sədri İradə Rzazadə, tədqiqatçı Mirzə Ənsərli və b. kitabın elmi məziyyətlərindən danışdılar. Tədbirdə İrəvan Müəllimlər Seminariyasının təşkilində və inkişafında xüsusi xidmətləri olan İrəvan Ruhani Məclisinin sədri, görkəmli maarifçi Axund Molla Məhəmmədbağır Qazızadənin nəticələri - tibb elmləri doktorları, professorlar Sevinc xanım Əkbərova və Paşa Qəlbinur çıxış edərək Qazızadələr nəsli barədə ətraflı məlumat verdilər.



Yekunda "İrəvan Müəllimlər Seminariyası" kitabının müəllifi dos.*Cəlal Allahverdiyev* çıxış edərək tədbir iştirakçılarına təşəkkür etdi.

"İrəvan Müəllimlər Seminariyasının 140 illiyinin qeyd edilməsi haqqında" Azərbaycan Respublikası Prezidentinin 2021-ci il 29 dekabr tarixli Sərəncamının icrası ilə bağlı xeyli ***televiziya verilişləri*** hazırlanmışdır.

İlk veriliş *2 dekabr 2021-ci ildə* İctimai Televiziyanın ***"Sabaha saxlamayaq"*** verilişində *Vüsalə Məmmədovanın* və *Ürvan Məmmədlinin* təqdimatında yayımlandı. Verilişdə Riyaziyyat və Mexanika İnstitutunun direktoru, AMEA-nın müxbir üzvü, professor *Misir Mərdanov*[1], Azərbaycan Dövlət İqtisad Universitetinin dosenti, filologiya üzrə fəlsəfə doktoru *Cəlal Allahverdiyev*, Atatürk Mərkəzinin əməkdaşı, fəlsəfə doktoru *Nazir Əhmədli*, Azərbaycan Dövlət Pedaqoji Universitetinin professoru *Cəfər Cəfərov*, Bakı Dövlət Universitetinin dosenti, pedaqogika üzrə elmlər doktoru *Həsən Bayramov*, Azərbaycan Dövlət Pedaqoji Universitetinin İbtidai təhsil fakültəsinin dekanı, pedaqoji elmlər doktoru, professor, Əməkdar elm xadimi *Fərrux*

---

[1]Veriliş Riyaziyyat və Mexanika İnstitutunun Baş direktoru, AMEA-nın müxbir üzvü, professor Misir Mərdanovun təşəbbüsü ilə hazırlanmışdı.

